# ƏBDÜRRƏŞİD ƏL-BAKUVİ

# KİTAB TƏLXİS ƏL-ASAR VƏ

# ƏCAİB ƏL-MƏLİK ƏL-QƏHHAR

## ("Abidələrin" xülasəsi və qüdrətli hökmdarın möcüzələri)

**BAKI – ŞUR NƏŞRİYYATI – 1992**

Ərəbcədən tərcüməsi, müqəddimə və
şərhləri akademik Ziya Bünyadovundur.

Nəşriyyat redaktoru: Qəşəm İsabəyli

Bakuvi Ə.
B 21 Kitab təlxis əl-əsar və əcaib əl-malik əl-qəhhar. Bakı, «Şur» nəşriyyatı, 1992. - 176 səh.

Orta əsr (XIV-XV) alimi Ə. Bakuvinin bu əsəri ilk dəfədir ki, Azərbaycan türkcəsində işıq üzü görür. Görkəmli alim Ziya Bünyadovun tərcüməsində sizə təqdim etdiyimiz «Abidələrin» xülasəsi və qüdrətli hökmdarın möcüzələri» kitabında Şərq və Qərb ölkələrinin, həmçinin Qafqazın tarixi-coğrafiyası haqqında bir-birindən maraqlı məlumatlar toplanmışdır. Qeyd edək ki, kitabın əsas məziyyəti onda öz əksini tapmış Azərbaycanla bağlı tarixi-coğrafi materialların olmasıdır.

B $\frac{4703000000}{J - “Şur” (07) - 92}$ elansız.

Az 1

© «Şur» nəşriyyatı, 1992.

## MÜQƏDDİMƏ

XV əsrin əvvəlində yazılmış Əbdürrəşid əl-Bakuvinin Təlxis əl-Asar və əcaib əl-məlik əl-qəhhar («Abidələrin xülasəsi və qüdrətli hökmdarın möcüzələri»)[1] Bakılı müəllifin yeganə məşhur əsəridir.

Müəllifin adı Əbdürrəşid ibn Saleh ibn Puri əl-Bakuvidir. Yaşadığı dövr XIV əsrin ikinci yarısı - XV əsrin əvvəlidir. Özü əsərində qeyd edir ki, hicri 806-cı ildə (21. VII. 1403-9. VII. 1404) yetmiş yeddi yaşında vəfat etmiş atası Saleh ibn Nuri Bakıda anadan olub, təhsil görmüş imam (ola bilsin ki, şafei imamı) idi.[2] Deyəsən, müəllifin özü də şafei idi. Elə bir fərziyyə var ki, Əbdürrəşid Qahirədə vəfat edib.[3]

Əsərdə Azərbaycanın şəhər və yerləri, xüsusilə Bakı şəhəri haqqında olan dəqiq məlumatlar, bu ölkə ilə yaxşı, bəlkə də şəxsi tanış olmasına işarədir. Bu xəbərdarlıq elə bir ehtimala yol verir «i, müəllifin özü Azərbaycanda yaşayıb, ya da hər halda atasının vətənində olub.

Əsərin yazılma vaxtı ili tarixləb müəyyən olunur: birincisi - mətndə göstərilən atasının vəfat ili (hicri 806), digəri əsərin surətinin bir nüsxəsini köçürmə tarixi (hicri 816/3. IV. 1413-22. III. 1414). Beləliklə, bu əsər ya hicri 806-cı ildə, bəlkə də bu ildən bir qədər sonra, amma hicri 816-cı ildən gec yazılmayıb.

Bakuvinin əsərinin günümüzə çatmış yeganə tam nüsxəsi Paris Milli Kitabxanasının əlyazmasıdır (№ 585). Buraya əlyazma 1683-cü ildə gətirilib. Əlyazmanın sonundakı kolofona görə (vər. 74 b) o, Suriyadakı Lazikiyyə şəhərində hicri 1023-cü il zülqədə ayının 3-də, cümə günü (1614-cü il dekabrın 5-də) Əli əl-Menufi əş-Şafen adlı bir nəfərin əliylə köçürülüb.[4] Bu nüsxə də hicri 816-cı il tarixli nüsxədən köçürülüb. Deməli, hicri 816-cı il tarixli nüsxə Bakuvi əlyazmasından köçürülən birinci surətlərindən idi.

Paris əlyazması 25. x 15 sm. ölçülü, hərəsi 19 sətri olan 74 vərəqdən ibarətdir.

Münhen kitabxanasının bir yığma əlyazmasının (№ 889)[5] daxilində Paris Milli Kitabxanasının Mixail əs-Sabbağ və Ellios Boxtor adlı əməkdaşları tərəfindən Əbdürrəşid Bakuvinin əsərindən Avropa ölkələri və xalqları haqqında məlumatların iqtibasları saxlanılır. Əlyazmanın özü 243 vərəqdən ibarətdir, bizi

maraqlandıran iqtibaslar isə 22 vərəqə təşkil edirlər. (Səhifədə 30 sətir olan 211-232 və 236 vərəqələrdir).

236 b vərəqədəki haşiyədə yazılır: «Bu, Təlxis əl-asardan gördüyümüz son məlumatdır. Hicri 816-cı il tarixli surətin hicri 1023-cü il zülqədə ayında Lazikiyyə şəhərində çıxarılıb. Mən də bu surətdən daha iki surət çıxardım», Bu haşiyə yəqin ki, Mixail əs-Sabbağın əliylə yazılıb, lakin onun çıxardığı iki surət barədə heç bir məlumat yoxdur. Buna görə də Paris əlyazması Bakuvinin əsərinin yeganə məlum olan tam nüsxəsi kimi qalmaqdadır. Əbdürrəşid Bakuvinin əsəri hicri 674 (1275-76)-cı ildə tərtib edilmiş Zəkəriyyə əl-Qəzvininin Asar əl-bilad və əxbar əl-ibad («Ölkələr abidələri və Allah bəndələri haqqında xəbərlər») adlı coğrafi əsərinin ixtisar edilmiş variantıdır.[6]

Zəkəriyyə ibn Məhəmməd əl-Qəzvini (1203-1283) məşhur ərəb kainatüasıdır (kosmoqrafı) və onun bu əsəri coğrafi ensiklopediyadır. Bu əsərdə 50-yə qədər, o cümlədən bizə gəlib çatmayan müəllifin əsərlərindən iqtibaslar hifz olunub. Belə ki, Qəzvininin əsərində İbrahim əl-Turtuşinin və Əburəbi Süleyman əl-Multaninin itmiş əsərlərindən parçalar və əl-İstəxri, Məhəmməd əl-Tusinin,[7] İbn Sinanın, İbn Fədlanın, Əbu Dulafın, əl-Ceyhaninin və b. və həmçinin ərəb İspaniyası ilə bağlı olan Məhəmməd ibn Əbdürrəhim əl-Qərnatinin (1168-də vəfat edib), Əhməd ibn Ömər əl-Üzrinin (1023-cü ildə vəfat edib), Əbdülhəmid əl-Əndəlüsinin (1169-da vəfat edib) əsərlərindən çoxlu iqtibaslar vardır.

Qəzvininin əsəri bütövlükdə və ixtisarla müxtəlif dillərə tərcümə edilib. Ruslar, peçeneqlər, normanlar və Qərbi Avropa ilə ilə əlaqədar olaraq Qəzvininin mətnindən X. Fren, Q. Yakob[8] və b. tərəfindən müxtəlif iqtibaslar edilmişdir.

Qeyd etmək lazımdır ki, Qəzvininin əsərinin ixtisarı Əbdürrəşid Bakuvi tərəfindən tələsik, çox hallarda mexaniki, bəzən də məna təhrifiylə edilib.

Bakuvinin öz mətnini ixtisar edərək mətni köçürən, bu qüsurların sayını daha da artırıb. Bakuvidə isnadlar yoxdur və Qəzvini tərəfindən istifadə edilən əsərlərin adları çəkilmir, Bakuvidə Qəzvininin əsərindəki Yer kürəsinin xəritəsi, Məkkə, Qəzvin, Konstantinopol şəhərinin planları, İskəndəriyyə mayakının sxemi və Tinnis adasının xəritəsi yoxdur.

Qeyd etməliyik ki, başqa kompilyatorlar kimi Bakuvi də açıq tarix səhvlərinə yol verirdi. Məsələn, Şimadi Afrikada olan əl-

Mehdiyə və Mərakeş şəhərləri haqqında o, yazır ki, «İndi» bunların sahibi Əbdülmöminin nəslidir (Əlmohadlar sülaləsinin idarəsi 1269-cu ildə, yəni Bakuvidən yüz il qabaq başa çatıb).

1789-cu ildə Bakuvinin əsəri fransız dilinə ixtisar şəkildə J. de Qin tərəfindən nəşr edilmişdir.[9] De Qin Bakuvinin əsərinə şişirdilmiş qiymət verib, lakin «o dövrün oxucularının orta təbəqəsi malik olan coğrafi məlumatların bütün kompleksinin əlaməti»[10] kimi bu əsər, əlbəttə, çox vacibdir.

Ərəb coğrafiyasının öyrənilməsi ilə məşğul olan tədqiqatçılar qeyd edirlər ki, Bakuvinin əsərində elə çox məlumatlar var ki, onlar hətta Qəzvini əsərinin mövcud olması ilə bərabər daha çox maraq doğurur.[11]

Qəzvini kimi, Bakuvi Də Yer kürəsini təsvir edərkən onu yeddi iqlimə bölür və bunların daxilində əlifba sırasıyla vilayət, şəhər, ada, vəng, kəndlərin və s. adlarını cərgəylə verir. Lakin Bakuvi Qəzvinidə olan adların miqdarını 164 ədədə azaldır (ixtisar edir): birinci iqlimdə - 12 ad azdır, ikincidə - 14, üçüncüdə - 58, dördüncüdə - 43, beşincidə - 27, altıncıda - 7 və yeddincidə - 3 ad (bax göstəriciyə). Bəzən Bakuvi əsəri üçün məlumatı başqa əsərdən götürür. Çox hallarda o, ona az tanış olan məntəqənin adını bir iqlimdən başqa iqlimə köçürür.[12] Bunun səbəbi də o ola bilər ki, Bakuvi Qəzvini əsərinin bir neçə əlyazmalarından istifadə etsin.[13] Belə köçürmələrin və iki müəllifin mətnlər arasında olan uyğunsuzluqların sayı altı yüzə qədərdir, lakin bu dəyişikliklərin hamısını Bakuvi özü edib - demək olmaz. Ola bilsin ki, bunların bir qismini mətni köçürən özü edib.

Bəzi yerlərdə Bakuvi Qəzvininin məlumatına əlavələr edir, məntəqənin düz yerləşməsinə çalışır və onun uzunluq və en dairələrini göstərir[14] (bunlar əlyazmanın haşiyələrində əlavə edilir və tərcüməmizdə bu əlavələr kursivlə verilir). Bəzi hallarda Bakuvi Qəzvininin düz olmayan və şübhəli oxunuşunu düzəldir. Bakuvi orta əsr Bakısının təsvirini Qəzvinidən daha yaxşı verir.[15] Xəzəryanı yolları və Azərbaycanı təsvir edərkən çoxlu orjinal məlumat əlavə edir. Qəzvinidə olmayan Dərman, Dazun, Təbriz, Mərənd, Sultaniyə, Şabran, Naxçıvan haqqında olan məlumatlar dördüncü iqlimdə) xüsusi qiymətə malikdirlər. Bundan başqa, Bakuvidə başqa əsərlərdə olmayan müxtəlif ölkələrin məlumatlarının, ticarət şeylərinin təsvirləri və incəlikləri çoxlu başqa məlumatlar vardır.

Əlavə deməliyəm ki, Əbdürrəşid Bakuvinin ikinci, tibbə aid Ədviyə («Dərmanlar») adlı əsəri var. Bu əsərin müqəddiməsində müəllifin adı belə yazılır: «Aləmin fazil və kamil imamı, müasirlərin qaymağı, keçmişlərin ən fəzilətlisi, dövrün və zəmanənin Qaleni, vaxtın hippokratı, padşahların və sultanların seçkini, mövlana, millətin və dinin ulduzu, islamın və müsəlmanları şərəfi, Allah tərəfindən bağışlanmış imam Salehin oğlu təbib Əbdürrəşid, Allah onun ömrünü uzatsın» (əl-imam əl-aləm, əl-fazil əl-kamil, zübdət əl-mütəqəddimin, əfzəl əl-mütəəxxirin. Cali nus əl-əhd və - z-zaman, Buqrat əl-əvan, Muxtar əl-mülük və - s-səlatin, Maulana, nəcm əl-millə və - d-din, şərəf əl-islam və - l-müslimin Əbd ər-Rəşid bin əl-imam əl-zafur Saleh, ət-təbib adama Allah zilləhu).

Bakuvinin bu əsəri İstanbulun Süleymaniyyə kitabxanasında saxlanılır (Hacı Bəşir Ağa bölməsi, № 515).

Tərcümədə coğrafi adlar müasir xəritələrdə olanlarla uyğundur; qədim, orta əsr, az tanınmış, yeri müəyyən olunmayan və ya oxuna bilinməyən adlar transkripsiyada verilir. Mətni izah edən və ya mətnə əlavə olunan kəlmə və ya cümlə kvadrat mötərizələrdə, Qəzvininin əsərinə əsasən verilir. Sözlük ərəb əlifbası əsasındadır. Əbdürrəşid Bakuvinin əsərini ruscaya tərcümə edib 1971-ci ildə Moskvada «Nauka» nəşriyyatında dərc etdirmişəm.[16]

Mətnin çapını üzərinə götürən Gülarə Abil qızı Əmirovaya təşəkkürümü bildirirəm.

***AKADEMİK ZİYA BÜNYADOV***

***Bakı 1992-ci il.***

## «ABİDƏLƏRİN» XÜLASƏSİ VƏ QÜDRƏTLİ HÖKMDARIN MÖCÜZƏLƏRİ

**(tərcümə)**

Hədsiz biliyə malik, ləyaqətli alim Əbdürrəşid ibn Saleh ibn Nuri əl-Bakuvinin - Allah ona rəhmət eləsin - əsəri.

### BİSMİLLAHİ ƏR-RƏHMANİ-R-RƏHİM!

Ona ümid bağlayıram, o, həmişə var, hər kəsə hamidir. Əzəmətə və şöhrətə malik olan, qüdrətli və daimi, əə layiqli və ən uca Allaha həmd olsun! Ən gözəl məxluqa, peyğəmbərlərin ən ləyaqətlisinə, sahibimiz Məhəmmədə, onun nəslinə və ən ləyaqətli və nəsib yaxın-əshabələrinə salavat və salamlar!

Və sonra. Allah Təalanın köməyinə möhtac olan Əbdürrəşid ibn Saleh ibn Nuri əl - Bakuvi deyir:

«Ölkələr abidələri»ndə mən, Allahın bir-birinə oxşayan müxtəlif ölkələrində olan, Onun geniş torpaqlarında yerləşən, vaxtımıza gəlib çatan Onun əcaib məxluqatından və Onun hikmətli möcüzələrindən danışmaq istəyirəm.

Günəşin təsiri, yağışların yağmağı və küləklərin əsməsi, nəticəsində Yer kürəsinin hər bir guşəsini bir-birindən ayıran fərqlər əmələ gəlir. Onların bəziləri möhkəm daşa döndü, digərləri bərəkətli torpaq oldu, üçüncüsü də şoranlığa çevrildi. Və hər bir guşənin öz xüsusiyyəti var: daşlıqlarda yaqut və zümrüd yaranır, bərəkətli yerlərdə taxıl və mayvəbar verir, şoranlıqlarda isə duzla zəy əmələ gəlir. Və hər bir guşəni özünə məxsus insan nəsli fərqləndirir: bu, ya alimdir, ya dini xadimdir, ya da ki, sənətkardır.

Bunlar haqda mən onu deyəcəyəm ki, bunların mən şəxsən özüm şahidi olmuşam, ya da bunlarla tanışlığım olub. Və kömək üçün əlimi Allaha uzadıram.

# MÜQƏDDİMƏ

Şəhər və kəndlərin yaratmasının lüzumiyyətinə gəldikdə, Uca Allah insanı yer üzündə elə xaliq edib ki, o, heyvan kimi təkbaşına yaşaya bilməz və başqasıyla təmasda olmağa ehtiyacı var. Buna görə də təmas əmələ gəlib və bundan da insanın yeyəcəyi və geyimi asılıdır, bu isə, öz növbəsində, çoxlu başqa, vaxtında hazırlanmışlardan asılıdır, çünki (bütün bunları önləyən işləri insan təkbaşına görə bilməz.

Buna görə Allahın müdrikliyi bu təması lazım bildi və hər bir insana təlqin olundu ki, o, hazırlanmışlardan birini icra etsin ki, onlardan bəziləri başqalarının köməyi ilə faydalansın, çünki sənətlər çox hallarda bir-birindən asılıdır.

Belə bir quruluşda insanlar bir-biriylə səhrada belə görüşsələr, yenə də istidən, soyuqdan, küləkdan və yağışdan sığınacaq tapa bilərlər. Əgər onlar çadırlarda və ya onlara bənzər yerlərdə gizlənsələr belə, yenə də quldurlar və düşmənlərin hiyləsindən mühafizə oluna bilməzlər və əgər onlar yalnız divar və qapılarla kifayətlənərlərsə, onda, divarları olmayan kəndlərdə göründüyü kimi, onlar özlərini canilərin hücumundan xilas edə bilməzlər.

Allah Təala insanlara divar, xəndək və hasar tikməyi təlqin edib. Beləliklə, şəhərlər, kəndlər və mənzillər əmələ gəldi. Və keçmişin padşahları müdrik adamların məsləhətiylə özləri üçün ölkədə ən yaxşı vilayəti, bu vilayətdə ən yaxşı yeri və bu yerdə, dəniz və çay sahilində, dağlarda və şimal küləyindən qorunan mahalı seçirdilər. Onlar şəhər ətrafına möhkəm divar çəkir, divarların içində çoxlu qapı-darvazalar açırdılar ki, insanlar gediş-gəliş vaxtı toplaşmasın. Şəhərlərin ən yaxşı məhəllələrində hakim üçün məclislər, adi və cümə məscidlər, bazarlar, karvansaralar və hamamlar üçün yer ayırırdılar. Başqa yerləri isə insanların evləri üçün saxlayırdılar,

Böyük hökmdarlar tikdiyi binaların məhz belə görkəmi var və bu yerlərin sakinləri xeyirxah, xoş-xasiyyət, sağlamfikir və olduqca qanacaqlıdır. Başqalarına; dəyləmilərə, kürdlərə, türkmənlərə və dəniz əhlinə gəldikdə isə onların yaşayış yerləri bambaşqadır, bunlar pis xasiyyətli, ağıldan kasıb və görkəmləri yaraşıqsızdır.

Sonralar bu şəhərlərin əhalisi qəşəng və gözəl binalar tikdi, müdrik adamlar da onlar üçün əcaib tilsimlər yaratdılar. Oralarda mədənlər, bağlar əmələ gəldi, heyvanlar artdı və insanlar cəmiyyətləri təşkil olundu və bunlar Uca Allahın mərhəməti və gözəl köməyi ilə elm və sənətkarlıqda öz taylarına üstün gəldilər.

## TƏKRAR İSTEHSAL HAQQINDA FƏSİL

Minerallara gəldikdə deməliyəm ki, qızıl qumsal torpaqlarda və yumşaq dağlarda, gümüş, mis və dəmir - yumşaq torpaqla qarışmış daşlarda, kükürd - vulkan torpağında, civə - rütubətli torpaqda əmələ gəlir. Duz yalnız duzlaqlarda, zəy və kuporos - acı torpaqlarda, qatran və neft isə yağlı torpaqlarda çökür.

Bitkilərə gəldikdə deməliyəm ki, xurma və banan yalnız isti havalı ölkələrdə bitir. Utruc, turş portağal və limon da həmçinin. Qoz, badam və püstə soyuq yerlərdə bitirlər, qamış - çay sahilində, çinar və muqilan isə çöllərdə bitir. Mixək hind adalarında bitir, kokos qozu, istiot və zəncəfil - Hindistanda, hind palıdı, abnos ağacı və sarı ağac - Yəməndə, zəfəran - Rudravərddə, ətirli qamış - Nahavənddə, naz isə Xorasanda bitir.

Heyvanlara gəldikdə deməliyəm ki, fillər yalnız Cənub dənizlərin adalarında törənir. Fillər başqa ölkələrə nisbətən Hindistanda daha çox yaşayırlar və onların dişləri Hindistan fillərinin dişləri kimi o qədər də böyük deyil. Zürafələr Həbəşistanda var, öküzlər - isti ölkələrdə, çayların sahillərində yaşayır. Samur, sincab və keyiklər – şimal - şərq ölkələrində, şahinlər və qartallar yalnız uca dağların zirvələrində balalayır; dəvəquşu və kata - səhralarda, suda üzən quşlar - çay sahillərində və bataqlıqlarda, göyərçin və sərçələr - yaşayış məntəqələrində, bülbül və torağaylar - bağlarda yaşayır.

Bunlar ən çox yayılanlardır.

## İQLİMLƏRƏ AYIRMA HAQQINDA FƏSİL

Bil ki, səma ekvatorunun dairəsi Yer kürəsini iki hissəyə bölür, birisinin adı cənub, ikincisinin – şimaldır. Əgər fərz etsək ki, dairə ekvatorun hər iki 10 qütbü üzərindən keçib Yer kürəsini kəsib keçir, onda Yer kürəsi dörd rüb olur: iki cənub rübü və iki şimal rübü.

Əlçatan şimal və məskun olunmuş rübə dənizlər, adalar, çaylar, dağlar, çöllər, şəhərlər və kəndlər daxildir. Qalan, Şimal qütbünə yaxın hissəsi, şiddətli soyuqlar və qarın çoxluğundan qeyri-məskundur. Bu məskun olunmuş rübü yeddi hissəyə böldülər. Hər bir hissənin adı «iqlim»dir və hər bir iqlimin uzunluğu qərbədir, enliyi də cənubdan şimaladır.

Ən uzun və ən geniş iqlim birinci iqlimdir. Onun uzunluğu üç min fərsaha (fərsah - 6 – 7 km - dir), enliyi isə yüz əlli fərsaha yaxındır. İqimlərin uzununa və eninə ən gödəyi yeddinci iqlimdir. Onun uzunluğu - min beş yüz fərsaha, enliyi isə əlli fərsaha yaxındır. Başqa iqlimlərə gəldikdə isə, onların uzunluqları və enlikləri müxtəlifdir.

Şimalda, Bənət ən - Nəş orbiti altında yerləşən yeddinci iqlimdən o yana, şiddətli soyuqlara görə, heç bir sanlı məxluq dünyaya gəlmir və heç bir bitki yoxdur, çünki orada altı ay qışdır, zülmətdir və suyun özü belə donur.

Əks tərəfdə, cənubda Süheyl ulduzunun orbiti altında, altı ay yay və gündüz olur, hava çox qızır və samum yelinə çevrilir və bu yel diri nə varsa və bitkiləri yandırıb kül edir.

Qərbə gəldikdə deməliyəm ki, Muhit («Əhatə edən») dənizi orada yaşamağı qeyri-mümkün edir. Şərqə gəldikdə isə, oraya dağlara və dənizlərə görə daxil olmaq mümkün deyil.

İnsanlar da bu yeddi iqlimlərdə yaşayırlar.

## BİRİNCİ İQLİM

Onun cənub hissəsi zəncilərə, nubilərə və Həbəşlərə yanaşıdır, şimal hissəsi isə ikinci iqlimlə həmsərhəddir. Bu iqlim, gecə - gündüzün bərabərliyində günorta vaxtı kölgənin uzunluğu bir qədəm (addım), qədəmin yarısını, onda birini və on altıda birini təşkil edən yerdən başlanır. Onun axırı gecə - gündüzün bərabərliyində kölgə iki qədəm və qədəmin beşdə üçünü təşkil edən yerdədir. O, Məşriqin ən uzaq yerlərində, Çin ölkəsindən başlayıb, Çinin cənubuyla həmsərhəd olan yerlərdən, Sərəndib adasından, Hindin cənubunda olan dəniz sahilindən, dənizin özündən keçib, Ərəb yarımadasına tərəf uzanır, Qulzum dənizindən keçib Həbəş ölkəsinə tərəf, Misrin Nil çayını aşır və Yəmən ölkəsini keçib Məqrib dənizi tərəfə uzanır. Yəmən torpaqlarının ortasında Səna və Hədrəmaut yerləşirlər. İqlimin cənub tərəfi Ədən torpağındadır, şimalla həmsərhəd olan hissəsi isə, yəni Tihama, Məkkənin yaxınlığındadır.

İqlimin ən uzun günü, onun başlandığı yerdə on iki saat yarımdır, ortasında - on üç saatdır, axırında isə on üç saat və on beş dəqiqədir.

Şərqdən qərbə onun uzunluğu doqquz min yeddi yüz yetmiş iki mil[*] və qırx bir dəqiqədir. Enliyi - dörd yüz qırx iki mil iyirmi iki dəqiqə (və qırx saniyə)dir.

İqlimin daxilində yerləşən ölkələr (və başqa məntəqələrə) gəldikdə, biz onlar haqqında (ərəb) əlifba sırasıyla danışacağıq.

**(1) İRƏM ZAT ƏL-İMAD** Sənayla hədrəmautun arasında (yerləşir). Ad oğlu Şəddadın[1] tikintilərindəndir. O onu, Cənnətə bənzər, qızıl, gümüş və qiymətli daş-qaşlardan tikib. Bu şəhərin uzunluğu on iki fərsahdır. Enliyi də bu qədərdir. Şəddad onun dövrəsinə hündür divar çəkmiş və içərisində üç min saray tikişdir. Bu sarayların iç və bayır divarlarını müxtəlif qiymətli daşlarla - mirvari, yaqut və zümrüdlə bəzədi. O, (şəhərin) yanına çayın axarını yaxınlaşdırdı: qırx fərsah bu axarı yerin altıyla çəkib axırını şəhərin içində üzə çıxartdı. sonra (bu) çayın sahilində, müəyyən bir yerdə o, özü üçün başqa saraylardan hündür olan əlçatmaz bir qəsr tikdirdi. Evlərin və divarların hündürlüyünü o, üç yüz dirsəyə qədər qaldırdı.

---

[*] Mil dörd min dirsəyə, fərsahın üçdə birinə və ya kəsirləri ataraq, iki kilometrə bərabərdir.

O, bu (şəhəri) beş yüz il ərzində tikdirdi. İnşaat işlərini bitirdikdən sonra o, qoşunları ilə şəhərə yaxşılaşmaq istədi. Amma şəhərə çata-çatmaya göylərdən gurultulu bir səs gəldi: Şəddad və onun yoldaşları öldülər və (şəhərdə) bir adam da olsun qalmadı. Müaviyənin[2] vaxtında bu şəhərə yalnız bir adam, Əbdulla ibn Kilaba adlı birisi daxil oldu. Bu şəhərə yol tapmaq belə qeyri-mümkündür.

**(2) BUCA**[*] - Ayzabın yuxarı, qərb tərəf, hissəsiylə yanaşı olan ölkədir. Onun əhalisini həbəşlərin bir cinsi təşkil edir. Orada başqa ölkələrə ixrac olunan zümrüdün mədənləri var. Zümrüdün yataqları dağlardadır. (Bu ölkənin) zümrüdü başqa zümrüdlərdən ən yaxşısıdır. O, çuğundur (yarpağı) rəngindədir, yaşıldır və rütubəti[1] çoxdur.

**(3) TİBR ÖLKƏSİ** - Məqribin cənub tərəfində qaradərililərin (sudan) ölkəsindədir. Buralar həddindən artıq istidir. Gündüzlər əhalisi yerin altındakı zirzəmilərdə qalırlar. Bizim yerlərdə kök bitən kimi, bu ölkənin qumlu yerlərində qızıl əmələ gəlir. Gün doğanda əhali zirzəmilərdən qalxıb qızılı yerdən çıxarırlar. Onların yediyi darı və lobyadır, geyimləri - heyvan dərisi, əksər hallarda pələng dərisidir.

Sicilmasadan bu ölkəyə üç aylıq (yol var). Tacirlər buraya çox çətinliklə gəlirlər. Bunların malları duz, şam ağacı, şüşədən düzəlmiş muncuqlar, bilərzik və üzüklərdir. Onların yolu samum küləkli və üfunətli olan, bəzən susuz səhralardan (keçir). Böyük əziyyətlərlə yollarını başa vurub qızıl sahiblərinin yaşadığı yerə yaxın olan bir məntəqəyə gəlirlər. Burada tacirlər təbil çalırlar ki, yerlilər karvanın gəlməsindən xəbərdar olsunlar. Deyirlər ki, bərk istidən zirzəmilərdə gizlənən bu adamlar orada heyvan kimi lüt-üryan talır, abır-həya nədir bilmirlər. Tacirlər yerlilərin təbil səsini eşitmələrini yəqin bilən dən sonra, adı çəkilən mallarını çıxarırlar. Hər bir tacir öz malını ayrı qoyur. (Sonra) onlar bir mərhələlik geriyə dönürlər. Bundan sonra qızıllarıyla qaradərililər gəlir və hər malın yanına istədikləri qədər qızıl qoyub gedirlər. Bundan sonra tacirlər yenə qayıdır və hər kəs öz malının yanında olan qızılı götürüb gedir.[1] Mallarını qoyub təbil çalırlar və çıxıb gedirlər. Tacirlərin heç biri deyə bilməz ki, o, yerlilərdən kimsə gözüylə görüb.

---

[*] Ərəb dilində ismin qabağında qoyulan müəyyənliyi bildirən əlif və lam hərflərini (artikl) göstərmirik.

**(4) HƏBƏŞ ÖLKƏSİ -** Uzunluq dairəsi - 65°5' en dairəsi - 9°30'-dir. Bu geniş bir ölkədir. Şimalında Bərbər körfəzi (Ədən boğazı), cənubunda - (Afrika) materiki, şərqində - zəncilər (ölkəsi), qərbində isə Buca yerləşir. Çox isti (ölkədir). Günəş buranın əhalisini yandırıb dərilərini qaraldıb. Orada müsəlman azdır və əhalinin əksəriyyəti xristiandır. Torpaqlarının çoxunu səhralar (tutur). suyun yoxluğundan və yağışların olmamasından bu ölkədə şəhərlərin sayı çox azdır. Burada bitən banan, üzüm və nardır. Onların geyimi heyvan dərisidir. Burada fillər və zürafələr var. Atların yerinə onlar meşə üçün buynuzlu heyvanları işlədir, yəhər və üzəngidən istifadə edirlər.

Zürafə həbəş maya dəvəsindən, kaftardan və vəhşi inəkdən törənir. Onun başı dəvə başına, buynuzları inək buynuzlarına, dişləri yenə inək dişlərinə, dərisi pələng dərisinə, ayaqları dəvə ayaqlarına, dırnaqları buynuzlu heyvan dırnaqlarına, quyruğu da qəzəl quyruğuna bənzəyir. Çox uzun boyunu var, qabaq ayaqları uzun, dal ayaqları isə qısadır.

**(5) ZƏNCİLƏR ÖLKƏSİ.** Onun uzunluğu iki aylıq yol qədərdir. Ondan şimala Yəməndir, cənubunda Fayafi, şərqində - Nuba və qərbində - Həbəşdir. (Əhalinin) bədənləri günəşin təsirindən qaradır. Bütün qaradərililər Kuş ibn Kənan ibn Xam ibn Nuhun, - ona salamlar olsun, - nəslindəndir. Həqiqətən, bunlar insanların ən pisi olub on əlamətləriylə fərqlənirlər: qara rəngləri, sərt saçları, yastı burunları, qalın dodaqları, çatıq ovucları və ayaq pəncələri, iyrənc qoxuları, həddindən artıq nəşələri, küt beyinləri və bir-birini yeməkləri (adətləri) ilə. Onlar düşmənlərinin ətlərini yeyirlər.

Onların Uqlim adlı padşahları var. Onların minik heyvanları buynuzlulardır. Bunlara minib müharibəyə çıxırlar. Onların atları yoxdur. Onların nəşəsi ürək qanlarının müntəzəm olmasındadır. Həm də deyirlər ki, hər gecə göylərinə Süheyl ulduzunun çıxmasındandır.

(Bu ölkədə) qızıl çoxdur. Bütün əhalisi qoturdur. Onlar fil ovlayıb, dişlərini satırlar, çünki dişinin çəkisi əlli «man»dan[*] yüz «man»a qədərdir. Ölkələrində qızılın bolluğuna baxmayaraq onların bəzəkləri dəmirdəndir.

[*] Man – 816,5 qramdır.

**(6) QARADƏRİLİLƏR (SUDAN) ÖLKƏSİ** - Uzunluq dairəsi - 65°9', en dairəsi - 9°20'-dir. Şimalda bu ölkə bərabər torpaqlarına qədər, cənubda - səhralara qədər, şərqdə - Həbəş ölkəsinə qədər, qərbdə də - Muhit (Əhatə edən) dənizinə qədər uzanır. Onun torpağı yanmışdır, çünki orada bərk istidir və günəş də daim başları üstündədir. Onlar lüt gəzirlər: bərk istiyə görə onlar heç bir paltar geymirlər. Aralarında müsəlman da var, kafir də, torpaqlarında qızıl var. Orada kərgədan, fil və zürafə var və çox hündür ağaclar (bitir). Əhali öz yaşayış yerlərini hündür ağaclarda qurur, çünki oralarda çoxlu ağ qarışqa var, Bu ağ qarışqalar adi evlərdə gecələr bütün ərzaq və geyimi zay edirlər.

**(7) NUBA** - Misirdən cənubda olan geniş bir ölkədir, Nil çayından şərqdə və qərbdədir. Əhalisi böyük bir tayfadır. Onlar xristiandırlar. Onların Kabil adlı padşahları var. Deyilənlərə görə o, Ximyar padşahlarının nəslindəndir. Padşaha hörmət etmək - adətlərindən (biridir). O, xalqa təlqin edir ki, guya (heç vaxt) yemir. Yeməyini isə ona gizli gətirirlər. Əgər onun təbəələrindən kimsə (bundan xəbərdar olsa, onu o saat öldürürdülər. Təbəələri arasında onun hökmranlığı mütləqdir və onlar inanırlar ki, padşahları həm ölür, həm də yenidən dirilir.

**(8) TAVAFA*** - Məqribdən cənubda, Muhit dənizinin yanında olan şəhərcikdir. Şəhər divarları və şəhərdə olan bütün binaların divarları duzdandır. Hasarlar, damlar və darvazalar duz lövhələrindəndir və onların üstünə heyvan dərilərini çəkirlər. Ətrafında olan bütün torpaqlar şoranlıq, duz və zəy mədənləridir.

**(9) TƏKRUR** - Sudan ölkəsində böyük və məşhur şəhərdir. Onun divarları yoxdur. Əhalisi - müsəlman və kafirlərdir. Padşahlıq müsəlmanların əlindədir. Əhalisi - həm kişi və həm də qadınları - lüt gəzirlər. Müsəlmanların zadəganlarından başqa. Bunlar topuqlarına qədər olan uzun köynək geyir. Kafirlərin arvadları qabaqlarını əqiq muncuqlarla örtürlər. Əqiqi qadınlar ipə düzüb boyunlarına taxırlar.

**(10) CƏBƏRSƏ** - Məşriqin ən uzaq yerində olan şəhərdir. Əhalisi Səmud (xalqının) nəslindəndir. Məqribin ən uzaq yerində isə Cəbəlk adlı şəhər var. Bunun əhalisi Ad (xalqının) nəslindəndir. Hər ikisində bu iki xalqın nəsli yaşayır. Yəhudilər təkid edirlər ki, Musanın nəsli Baxtanəssərlə[1] müharibə zamanı vətənlərindən

* Qəzvinidə - Tağaradır.

qaçmışlar və Allah Təala onları mühafizə edib Cəbərsəyə gətirdi. Onlar bu yerlərin sakinləri (oldular). Onlara tərəf heç kəs gələ bilmir və sayları da bilinməzdir.

**(11) CAVA -** Hindlə qonşu olan və Çin dənizinin sahilində yerləşən ölkədir. Tacirlər buradan Cava əzvayı, kafur, ətir, mixək, çövüz və çini qablar aparırlar. (Bütün bunlar) başqa ölkələrə gedir.

**(12) XALİDAT ADALARI -** Muhit dənizində Məqribin ən uzaq hissəsində yerləşirlər. Bu yerlər müdrik adamların mərkəzidir. Onlar da burada Yer kürəsinin məskun olunan hissəsinin başlanğıcını təyin ediblər. Bunlar, Muhit dənizində iki yüz fərsahlı məsafədə yerləşən altı adadır. Oralarada müxtəlif cır meyvə ağacları və ətirli bitkilər var. Torpaqları əkin üçün yararlıdır. Tikanlar yerinə orada ot və ətirli reyhan bitir. Hər adada mayaka oxşar yüz dirsək hündürlüyündə büt var və onun köməyilə insan adada özünü itirmir və bilir ki, qabaqda yol yoxdur.

**(13) RAMNİ ADASI -** Çin dənizindədir. Orada insanlar lüt gəzir. Bunların fitə bənzər anlaşılmaz dili var. Bu adamların dörd şibr* boyaları var. saçları kürən və seyrəkdir. Ağaclara dırmaşırlar. Orada kərgədan və quyruqsuz camışlar (var). Bu adada saysız-hesabsız qiymətli daş-qaşlar və ətriyyat var.

**(14) ZƏBƏC ADASI -** Hindlə yanaşı Çin dənizində yerləşən böyük adadır. Orada əcaib şeylər var. Bura böyük bir padşahlıqdır və (insanlar) padşahlarına boyun əyirlər. Burada kafur ağacı (bitir). Olduqca böyük ağacdır kölgəsi yüz adama çata bilər. Ağacın başı şişəndə, bir neçə bardaq kafur şirəsi çıxır. Bir az aşağıda onlar ağacın ortasında dəlik açırlar və buradan parça-parça kafur tökülür. Bu həmin ağacın içində olan kitrəsidir və əgər onu çıxarsan ağac quruyar.

Adada bir növ pişik yaşayır, onun yarasada olduğu kimi iki qulağı arasında qanadı var və dağ kəlinə bənzər kürən ağ xallı vəhşi keçilər yaşayır. Əti turşməzədir. Burada zəbəd** adlı pişiyə oxşar heyvan var. Adada Nəsban adında dağ var. Burada inəklərə və camışlara hücum edən nəhəng ilanlar, camış və qoyun boyda ağ meymunlar, hər dildə danışa bilən ağ, qırmızı və sarı tutuquşular və xallı, yaşıl tavus quşları var.

* Şibr – qarış, 22,5 sm.-dir.

** Müşk pişiyi.

**(15) SƏKSƏR ADASI -** Cənub dənizində, yaşayış yerlərindən uzaq olan adadır. Orada it üzlü insanlar yaşayır. Bədənlərinin başqa hissələri isə insan bədənində olduğu kimidir. Onların dilləri anlaşılmazdır.

**(16) KİSAR ADASI -** Bu adada bir şəhər var ki, orada yaşayan insanlar dirsək boydadır. Onların çoxu da bir gözlüdür.

**(17) NİSA ADASI -** Çin dənizindədir. Orada yalnız qadınlar yaşayır. Kişiləri yoxdur. Onlar küləkdən hamilə olub özləri kimi qadın doğurlar. Deyirlər ki, onlar (həmçinin) adada bitən ağacın meyvəsindən hamilə olurlar. Bu meyvədən dadır, hamilə olur, sonra da özləri kimi qız doğurlar.

**(18) VAQ ADASI -** Zəbəc adasına yaxın Çin dənizində olan adadır. Oraya yalnız ulduzlara (baxıb) düşmək olar. Təkid edirlər ki, orada minə qədər ada var. Adaya bu adı orada bitən ağaca görə veriblər. Bu, ağacın meyvəsi, saçları ağaca bağlanmış qadına oxşayır. Elə ki, əlin (meyvəyə) dəydi, ondan «vaq-vaq» səsi gəlir. Adada o qədər qızıl var ki, əhali ondan itlərinə zəncir və meymunlarına xalta düzəldirlər.

**(19) XADRAMAUT -** Yəməndə bir vilayətdir. Onun iki şəhəri var; birisinin adı Şibam-dır, ikincisinin - Tarim. Xadramaut dəniz kənarında Ədəndən şərqdə yerləşir. Bu, çox qədim bir ölkədir. Orada Səid İbn Ad adlı adam hündür bir qəsr ucaldıb. Hud, əleyhi salamın, qəbri (oradadır). Deyirlər ki, orada bir sinək tapıblar içində də özü boyda buğda sünbülü var idi. (Bu sünbülü) çəkəndə ağırlığı bir man oldu və hər bir dəni toyuq yumurtası boyda idi.

**(20) DUNKULA -** Uzunluq dairəsi - 43°40', en dairəsi - 14°30'-dir. Nil boyu uzanan Nuba ölkəsində yerləşən böyük şəhərdir. Şəhərin uzunluğu səksən millik yoldur, enliyi isə böyük deyil. Bura onların padşahı Kabilin iqamətgahıdır. Buranın əhalisi yaqubi xristianlarıdır. Bərk istidən onların torpaqları quruyub. İstilərə baxmayaraq burada buğda, arpa və darı əkirlər. Onların xurmalıq və üzümlükləri vardır. Onların evləri daxmalardır. Əhali lüt (gəzir), yalnız heyvan dəriləriylə örtülürlər. Buralarda çoxlu pələng var. Əhali pələng və zürafə dəriləriylə örtülür. Zürafə belinin meyli arxa tərəfədir. Onların qısa ayaqlı kiçik boylu dəvələri var.

**(21) SƏBA -** şəhərdir. Onunla Sənanın arasında üç günlük (yol) var. Buranı Səba ibn Yaşcub ibn Yarub ibn Qəhtan[1] tikib. Şəhər möhkəmdir, çoxlu əhalisi var, havası xoşdur, dadlı suyu və çoxlu dadlı meyvələri olan müxtəlif ağacları var. Bu, həmin şəhərdir

ki, haqqında Allah Təala belə buyurub: «Səba tayfasının yurdunda (qüdrətimizə dəlalət edən) bir nişanə var idi» və (sonra): «(Yurdunuz) gözəl bir diyar, (Rəbbiniz»də) bağışlayan bir Rəbbdir!»* Orada nə milçək, nə ilana bənzər sürünənlər, nə əqrəb, nə də bunlara oxşar bir şey vardır.

**(22) SİCİLMASA -** Uzunluq dairəsi - 37°05', en dairəsi - 31°30'-dir, Məqribin cənubunda, Sudan ölkəsinə yaxın, Daran adlı dağın altında, qumlu səhranın ortasında yerləşən şəhərdir. Ortasından böyük çay axır, çay sahilləri boyunca bağlar və xurma ağacları əkilib. Onun taxıl zəmiləri çay sahilləri boyunca on iki fərsah uzanır. Şəhər əhalisi ən dövlətlilərdən sayılır, çünki qızıl mədəni (olan) Qana (şəhərinə) gedən yolun (üstündədir). Orada üzümün və xurmanın müxtəlif növləri bitir. Oranın qadınları yun əyirməsində çox mahirdir, onlar yundan gözəl örtüklər toxuyurlar.

**(23) SƏRƏNDİB -** Uzunluq dairəsi - 13°05' en dairəsi - 10°05'-dir. Hindin ən uzaq hissəsində, Hərqənd dənizində olan adadır. Onun (sahəsi) - yetmiş fərsah səksənədir. Orada üç padşah var. Orada müxtəlif ətirli bitkilər, ətirlər, əzvay, kokos qozu, müşk dərmanları, cürbəcür yaqutlar, qızıl mədəni və mirvari ovlanan yer vardır. Orada bir dağ var ki, onun üzərinə Adəm əleyhi salam endirilmişdir. Bu dağın başı (elə hündürdür ki,) dəniz səyyahları onu bir neçə günlük məsafədən müşahidə edirlər. Dağın üstündə Adəm əleyhi salam»ın ayağının yeri qalıb. Bu dağ üzərində hər gecə ildırıma bənzər nə isə görünür, nə ağ buludu, nə də qarası olur. Deyirlər ki, bu dağda qırmızı yaqut var və bu sel kimi yuxarıdan dağın aşağısına axır. Burada saf almaz var.

Sərəndib əhalisinin çoxu atəşpərəstdir, amma müsəlmanlar da var.

**(24) SUFALA -** Zənci torpağında məşhur şəhərlərdən biridir. Sufala qızılı zəncilər ölkəsi tacirlərinin arasında məşhur sayılır. Orada havan adında uca səsli və tutuquşunun tələffüzündən aydın və düz tələffüzlü bir növ quş var. (Onun oxuması) uzaq məsafədən eşidilir. (Bu quş) bir ildən çox yaşamır.

**(25) SALUK -** Yəmən torpağında olan şəhərdir. Orada qalmış möhtəşəm abidələr var. (Şəhərdə) zərgərlər və zireh düzəldən

* Quran, 34, 15. Qurandan iqtibaslar 1991-ci ildə Bakıda nəşr edilən Azərbaycan dilinə tərcüməsindən götürülür.

və dəmir geyim toxuyan sənətkarlar (yaşayır). (Orada) bir cür itlər var ki, onlarla canavarlar cütləşir. Bunlar ən iyrənc itlərdir.

**(26) SƏMHAR -** Həbəş ölkəsində bir kənddir. (Orada) Səmhar nizələrini hazırlayan sənətkarlar (yaşayır). Bu nizələr hamısından keyfiyyətlidir.

**(27) SƏNDƏBİL -** Çin ölkəsində yerləşən və mülkün paytaxtı olan şəhərdir. Şəhəri ikiyə bir çay bölür, bir sahili padşahın, o biri sahili xalqındır. Şəhərdə altmış küçə var və hər küçə padşah iqamətgahına aparır. Bu, dairəsi bir günlük yol olan böyük bir şəhərdir. Şəhərin, hündürlüyü doxsan dirsək olan divarı (vardır). Divarın başlanğıcında altmış kiçik arxlara bölünən böyük çay axır. Hər arx bir darvazanın yanından axır, sonra həmin su dəyirman çarxını fırladır. Sonra çay suyunun bir hissəsi divarın altından axaraq bağlara gedir, suyun başqa hissəsi isə şəhər küçələrində axır. Burada əkin yerləri, göyərti, meyvələr, mixək və darçın kimi ədviyyələr var. Şəhərdə müxtəlif qiymətli daş-qaş, yaqut və qızıl da var. (Şəhər) əhalisi xoşsifətdir, onlar gödəkboylu və iyribaşlıdırlar. Paltarları ipəkdəndir, bəzək şeyləri fil və kərgədan sümüyündəndir. Ev qapıları abnos ağacındandır. Aralarında bütpərəst, mani, atəşpərəst və ruhun bədəndən bədənə köçməsinə inananlar da vardır.

**(28) ŞİHR -** Dəniz sahilində, Ədənlə Omanın arasında yerləşən vilayətdir. Şihr ənbəri buradandır. (Yalnız) bu sahillərdə var. Bu vilayətdə çoxlu bağ var.

Burada, bədəninin yarısı insan bədəninə oxşayan nas-nas adlı heyvan yaşayır.[1] Onu ovlayıb (ətini) yeyirlər.

**(29) ŞƏƏB -** Yəməndə bir dağdır. Ətrafında şəhər və kəndlər var. Əhalisinə şəəbilər deyirlər. Orada Şənfərə[1] öldürülüb və onun dayısı Təəbbat Şarran[2] bu barədə deyib:

Həqiqətən, Şəəbdə, dərənin yanında öldürülən
və hələ də intiqamı alınmamış (yatır)

Əbu Əmir Amir ibn Şurahil Şəbi[3] də buralıdır. O, mömin bir alim idi, tayı-bərabəri yox idi. Əbdül-məlik ibn Mərvan[4] onu hakim təyin etmişdi.

**(30) ŞİLA -** Sənanın ucqarında yerləşən çox bərəkətli bir şəhərcikdir. Təmiz havasına, dadlı suyuna və bərəkətli torpağına görə burada iflic adam yoxdur. (Onun) sakinləri insanların ən gözəli

olub, xəstəliklərə hamıdan az düşürlər. Yağışın suyu onların evlərinin üstünə düşəndə, evlərdən ənbər qoxusu gəlir.

**(31) SƏNA** - Uzunluq dairəsi - 77º05' en dairəsi - 14°30'-dir. Yəmənin paytaxtı, ölkənin ən abad şəhərlərindəndir, zəmisi bərəkətli, ən sağlam havası və ən dadlı suyu vardır. Şəhərdə azar, naxoşluq, həşərat və milçək azdır. Bağ-bostanı, çayların bol suları və meyvələrin müxtəlifliyi ilə Diməşqə oxşayır.

Hər il orada iki dəfə yay və iki dəfə qış olur.

Günəş həməl (bürcünün) birinci nöqtəsində dayananda, burada çox isti olur. Günəş Sərətan (bürcünün birinci) nöqtəsində dayananda, artıq adamların başları üstündə deyil və bu vaxt qış başlanır. Günəş Mizan (bürcünün) birinci nöqtəsində dayananda istilik yenidən qayıdır və yenə də yay başlanır. (Nəhayət), Günəş Oğlaq bürcündə olanda, onlar ikinci dəfə qışa girirlər.

Yəməndə Səna kimi iri şəhər yoxdur. Bu şəhər ekvatora yaxındır. Buranın iqlimi mülayim, gündüzlə gecənin uzunluğu bir-birinə təxminən yaxındır. Orada zəy dağı var və dağın başından hər tərəfə daşa dönmüş çay axır. Bu da Yəmən ağ zəyidir. Orada buğdanın elə növü var ki, onun iki dənəsi bir yerdə olur. Orada sarı ağac var, bununda qabığı küncütə oxşayır.

**(32) SİN (ÇİN)** - Uzunluq dairəsi -130º05', en dairəsi - 24°15'-dir, Bu - Məşriqdə olan, birinci iqlimdən üçüncü iqlimə qədər uzanan geniş bir ölkədir. Onun eni uzunluğundan böyükdür və əvvəlindən axırınadək iki aylıq (məsafə) var. Ölkə üç yüz şəhərdən (ibarətdir). (Çin padşahlığının paytaxtı Pəncu adlanır).*

**(33) ZUFAR** - Səna yaxınlığında bir şəhərdir. Ximyari padşahlarının iqamətgahı idi. Onun dağlarında dünyanın heç bir yerində olmayan əla büxur var. Həddindən əla Zufar damarlı ətiqi buradandır.*

**(34) OMAN** - Uzunluq dairəsi -84º05', en dairəsi - 14º20'-dir. Yəmən dənizinin sahilində yerləşən vilayətdir. Həcərdən şərqədir. Burada çoxlu şəhər var. Sahilyanı dənizin adı da Oman dənizidir.

Peyğəmbərin, Allahın ona salamı olsun, adından söyləyirlər, O, demişdi: «O adam ki, dolanacağını qazana bilmir (getsin) Omana».

---

* Əlyazmanın haşiyəsində əlavədir.
* Quran, 22, 27.

(Omanın) isti iqliminə gəldikdə o, zərbi-misal olub Allah Təala buyuranda: «...Hər uzaq yoldan hər cür miniklə gəlsinlər» mənz bunu nəzərdə tuturdu.

**(35) ƏDƏN -** Uzunluq dairəsi -73°05' en dairəsi - 11°05'-dir. Yəmən vilayətində, hind dənizinin sahilində olan şəhərdir. Onun adı Ədən ibn İsmayıl ibn İbrahim, əleyhi salamın, adına görə verilib.

Buranın nə suyu var, nə də otlaqları. (Əhalisi) suyu, onlardan bir günlük uzaq məsafədə olan bulaqdan gətirir.

Ədən - onu hər tərəfdən əhatə edən dağlar arasında olan açıq bir sahədir. Yarımada tərəfə açılan bir dağ keçidi var. Bura, hind tacirlərinin gəmiləri üçün limandır və tacirlər şəhəridir. İnsanlar buraya mallarıyla Hinddən, Sinddən, Çindən, Həbəşdən, Farsdan və İraqdan gəlirlər.

Burada Nar (Atəş) adlı dağ var. Dağın rəngi qırmızıdır, özü də dənizin ortasındadır. Dağdan od çıxır. Elə orada, Allah Təalanın yada saldığı atılmış bir quyu vardır.

**(36) QANA -** Məğrib ölkəsinin cənubunda və Tibr ölkəsiylə yanaşı olan böyük şəhərdir. Bu, qızıl barəsində Allahın ən dövlətli şəhərlərindəndir, çünki o, (qızıl) mədəninin yaxınlığındadır.

Buranın əhalisinin əsas geyimi heyvan dəriləridir.

**(37) ĞADAMİS -** Məğribin cənubunda, Sudan ölkəsində bir yerdir. Buradan ən keyfiyyətli Ğadamis gönləri gətirilir.

Burada suyu ölçüylə aparılan bir bulaq var. Əgər kimsə suyundan artıq götürsə, bulaq quruyar.

**(38) ŞƏRƏF QALASI -** Zabid yaxınlığında olan Yəmənin möhkəm qalasıdır. Qalanı güclə almaq mümkün deyil və ona heç yaxın gəlmək də olmaz, çünki qala dağlar arasındadır və ona tərəf gedən yol elə dardır ki, oradan yalnız bir nəfər keçə bilər.

Buraya yolun uzunluğu bir gündür.

**(39) KAKUDAM -** Məğrib torpaqlarında, dənizdən cənubda, Sudan ölkəsinin qonşuluğunda olan şəhərdir. Orada silah, nizə və gön qalxanlar hazırlayan sənətkarlar vardır.

Orada ceyran cinsindən olan lamt adlı heyvan var. Onun dərisindən Lamt qalxanlarını hazırlayırlar.

**(40) KALA -** Hinddə, Omanla Çinin arasında olan şəhərdir. Ekvatorun mərkəzində, məskun olmuş hissəsində yerləşir. (Burada) gündüz olanda heç bir şey kölgə salmır. Kala gəmilər lövbər salan axırıncı məntəqədir. Orada hind qamışı bitir.

**(41) LANCUYA -** Zənci torpağında böyük adadır. Orada zənci padşahının itamətgahı yerləşir. Buraya bütün ölkələrdən gəmilər gəlir.

Orada elə üzümlər var ki, ildə üç dəfə bar verir.

**(42) MARİB -** Hədramautla Sənanın arasında yerləşən vilayətdir. Burada məskun olan və durub adlanan yalnız üç yer qalır. Hər məntəqə Yəmənin bir qəbiləsinə mənsubdur. Onlar əkin yerlərini bənddən alınan su ilə (suvarırlar).

Allah Təala bənd üzərə hakimiyyəti siçovullara verdi. Bunlar da bəndi dişləri ilə gəmirib dırnaqları ilə altını qazıdılar. Az çəkmədi ki, bəndin bir tərəfi yırtılıb dağıldı və ölkəni su basdı. Suyla (basılmamış) yalnız dağ zirvələri oldu.

**(43) MİRBAT -** Hədramautla Omanın arasında olan şəhərdir. Zufarın (özünün) gəmi limanı narahat olduğu üçün Mirbat limanını işlədirlər.

Orada büxur var. Bu şəhərin əhalisi öz qısqanclığı ilə məşhurdur.

**(44) MİŞVAR -** Yəməndə bir vilayətdir. Burada çoxlu kənd, zəmi və dərə var. Bu vilayətin xüsusiyyətlərindən biri də ondadır ki, buğda, arpa və darı burada çox qalır və çürümür.

**(45) MUQADİŞU -** Yəməndən cənuba, dəniz sahilində, Zəncilər ölkəsinin başlanğıcında yerləşən şəhərdir. Orada səmanın ortasında Cənub ulduzu və Süheyl görünür, amma şimal ulduzları görünmür. Buradan başqa ölkələrə səndəl və ebenus ağaclarını ənbəri və fil sümüyünü aparırlar.

**(46) MİKRA -** Sənadan bir mərhələ uzaqda olan bir kənddir. Orada əqiq mədəni var.[1] Buranın oxları çox əladır.

**(47) VƏBƏR -** Yəmənin hansı yerindəsə bir şəhərdir. Ad tayfasının qaldığı yerlərdən biridir. Bu tayfa həlak olanda, Allah onun torpaqlarını ömürlük cinlərə verdi. Burada heç bir insan yaşamırdı. (Şəhərə) Vəbər ibn Arim ibn Sam ibn Nuh-əleyhi salamın adını qoydular. Bu şəhər Şihrlə Səna arasında, təxminən üç yüz fərsahlıq məsafədə yerləşir,

Cinlər şər işlərini görüb, lovğalanıb Allah Təalaya lazımınca hörmət etməyəndə, Allah Təala onların simasını dəyişdirib nas-naslara çevirdi: onların hər birinin yalnız yarım üzü, bir gözü, bir əli və bir ayağı vardır. Cinlər də (şəhərdən) çıxıb getdilər və heyvanlar dəniz sahilindəki meşəliklərdə otlayan yerdə

otladılar və buraları xarab etdilər. Bu ölkənin (sakinləri nas-nasları itlərlə ovlayırlar.

**(48) VARVAR -** Səna dağlarında olan alınmaz bir qaladır. Bu talanı fəth edənin ağlı başından gedir və bundan sonra belə adam peyğəmbərlik, xəlifəlik və ya sultanlıq iddiasında olur.

**(49) YƏMƏN -** Onun paytaxtı Sənadır. Uzunluq dairəsi - 77° en dairəsi - 14°30'-dir. Omanla Nəsranın arasında yerləşən geniş bir ölkədir. Ağacların və zəmilərin çoxluğundan buraya Xədra («Yaşıl») ölkəsi deyirlər. Burada, ildə dörd dəfə əkirlər və hər əkini altmış gündən sonra biçirlər. Buranın ağacları ildə iki dəfə meyvə verir. Buranın əhalisi xasiyyətcə ən mülayimdir.

Ad tayfasının məskəni buralar idi. İndi bu yerlə Ədənlə Xadramaut arasında təpələrə dönüb. Adilər yaşadığı yerlər Allah Təalanın ən məskun olunmuş ölkələrindən idi. Allah Təala onların üzərindəki hakimiyyəti küləklərə verəndə, küləklər onların yaşadığı yerləri torpaqla örtdü.

Orada adilər saraylarından ikisi qalıb. Orada Zəy dağı və Şibam dağı var. Bu böyük və qalxmaq üçün çox çətin bir dağdır. Sənanın yaxınlığındadır, bir günlük yolu var. Orada Kəvkəban dağı var. Onun üstündə qiymətli daşlardan tikilmiş və gecələr işıq saçan iki qəsr var.

(Bu ölkədə) bir cür armud var. Əgər insan bu armudun birini yesə o, on dəfə bədənindən hava buraxır. Orada banan da (var). Bu, üzümə oxşar şirin və yağlı bir meyvədir.

Əbdürrəhman Tavus ibn Keysan Yəməni[1] bu yerdəndir. O, icazə verilən və qadağan edilən məsələlərdə ən bilikli adam idi. O, Məkkədə hicri 106-cı (724) ildə[*] vəfat edb. Əbu Abdullah Vəhb ibn Münabbih[2] də buralıdır. O, qırx beş il ərzində axşam namazında dəstəmaz alıb, səhər namazını qılanda yenidən dəstəmaza ehtiyac duymayıb.[**] Allah ona rəhmət etsin!

---

[*] Əlyazmada 156-cı ildir.

[**] «Axşam dəstəmazı ilə kifayətlənərək», yəni neçə müsəlmanı murdar edən heç bir hərəkət etməyib.

## İKİNCİ İQLİM

Bu iqlim o yerdə başlanır ki, orada gecə-gündüzün bərabərliyində, gündüz kölgənin uzunluğu iki tam beşdə üç qədəm (addım) olan yerdədir. Qurtardığı yer isə gecə-gündüz bərabərliyində, gündüz kölgənin uzunluğu üç yarım və onda altı qədəm olan yerdədir.

İqlim Məşriqdə başlanıb, Çin, Hind və Sind ölkələrindən keçir, Əhdər dənizinin* birləşən yerinin yanından keçib Nəcd, Tihama və Bəxreyn torpaqlarına Ərəb (yarım) adasını kəsir, sonra Qulzum dənizini və Misirin Nil çayını keçib Məqrib torpağına tərəf uzanır.

Burada, iqlimin əvvəlində, ən uzun gün on üç saat on beş dəqiqə təşkil edir, sonunda - on üç saat və yarım saat və on beş dəqiqə, ortasında isə on üç saat yarımdır.

Məşriqdən Məqribə (iqlimin) uzunluğu doqquz min üç yüz on iki mil və qırx iki dəqiqədir. Eni - dörd yüz iki mil və əlli bir dəqiqədir.

İqlimdə (yerləşən) şəhərlərə və (başqa yerlərə) gəldikdə isə, biz, əgər Allah Təala buyursa, onları əlifba sırasıyla yada salarıq.

**(1) ƏBLƏQ** - (verdiyi sözünə) sadiq olmaqla zərbi-misal olan Səmaval ibn Adaya əl - Yahudinin qalasıdır. Qalanın adı Əblət - Fərddir,** çünki o, ağ və qırmızı (daşlardan) tikilib. Hicazla Şamın arasında qumsal təpənin üstündə tikilib. İndi də orada binaların xarabaları qalıb.

**(2) ƏSA VƏ SƏLMA** - Hicazda tailərin[1] məskənləri yerləşən iki dağdır. Onların kəndləri sağlam, suyu və ağacları bol olan yerdədir. Məşhur şair Əbu Həmmam Həbib ibn Aus Tai[2] və əliaçıq və cəsur şair Hatəm Tai[3] öz adlarını bu qəbilədən alıblar.

**(3) ARAM** - Hind ərazisində olan şəhərdir. Orada bir ibadətgah və içində mail vəziyyətdə büt var. Bəzi vaxtlarda ondan fit səsi eşidilir və bu zaman büt dik durur. Bütün belə dik durmağı ucuzluq başlamasının əlamətidir.

**(4) BƏHREYN** - Uzunluq dairəsi -74º05' en dairəsi - 23º30'-dir. Dəniz sahilində, Bəsrəylə Oman arasında yerləşən vilayətdir. Bura mirvarinin ən yaxşı növlərinin ovlandığı yerlərdir.

---

* "Yaşıl dəniz" (Hind okeanı).

** "Ala – bəzək yeganə".

Hər il Dəclə və Fərat çaylarının birləşib körfəzə töküldüyü yerdən (buraya mirvarisi olan sədəflə karvanlar gəlir. Dünyanın heç bir padşahının belə bir gəlir mənbəyi yoxdur. Bəhreyndə yaşayanların dalaqları şişmiş və qarınları köpmüş olur.

**(5) BƏDR -** Məkkəylə Mədinə arasında bir yerdir. Burada Allah elçisi Məhəmmədin, - Allah onu salamlasın! - bütpərəstlərlə uğurlu döyüşü olmuşdur.

**(6) TUBBAT -** Uzunluq dairəsi-110º05', en dairəsi - 40º05'-dir. Bu ölkə bir tərəfdən Çinlə, digər tərəfdən Hindlə qonşudur. Onun məsafəsi bir aylıq bir yoldur. Burada çoxlu şəhər və taxıl zəmiləri vardır. Bu elə ölkədir ki, burada insan qanının xassəsi güclənir. Buna görə əhalisinin çoxu şadlığa və sevincə meyllidir. Burada insan fasiləsiz sevinir və gülür və o, nə dərd bilir, nə də qəm.

Burada qırmızı kükürd mədəni var. Orada zəhərli bir dağ var və yanından keçənin nəfəsi qaralıb, dili ağırlaşır.

Burada adi qəzələ oxşar müşk qəzəli var. Onun vəhşi donuzda olan kimi iki köpək dişi var. Göbəyində ən yüksək xassəli müşkü var. Orada müşk siçovlu da var.

**(7) CƏCƏLİ -** Hind ölkəsində, yüksək bir dağın başında yerləşən, olduqca istehkamlı şəhərdir. Onun yarısı dənizdə, yarısı da qurudadır. Şəhər əhalisində müşahidədə, hesabda və münəccimlikdə bilik var.

(Əhalisi) şir ürəyinə pərəstiş edir. Burada darçın ağacı var. Bu şəhər müstəqildir və hakimi yoxdur.

**(8) BARTABİL ADASI -** Zəbəc adasına yaxındır. Onun sakinlərinin sifəti mis qalxanına bənzəyir, saçları isə qatır quyruğuna oxşayır.

Burada kərgədan var və (islam) ölkəsinə ixrac edilən mixək (bitir).

**(9) CABA ADASI -** Hind dənizindədir. Əhalisi kürən, sifətləri isə döşlərindədir. Orada elə bir dağ var ki, gecələr ondan böyük alov, gündüzlər isə tüstü çıxır. (Adada) əzvay, kokos qozu, banan və şəkər qamışı bitir.

**(10) SUKUTRA ADASI -** Hind (dənizində) böyük bir adadır. Adanın uzunluğu səksən fərsaha qədərdir. Onun şəhər və kəndləri Ədənlə üzbəüzdür. Buradan əzvay və drasena ixrac olunur.

**(11) SALAMAT ADASI -** Hind dənizindədir. Buradan səndəl ağacı, qiasint və kafur ixrac edirlər.

(Adanın) yanında dənizdə bir balıq var. Bu, adada meyvələr yetişəndə sahilə çıxıb ağaclara dırmaşır və meyvələrin şirəsini sovurur, sonra da məst olub yerə yıxılır. Adamlar da gəlib balığı götürüb aparırlar.

**(12) SAYLAN ADASI** – Çinlə Hindin arasında yerləşən böyük (adadır). Onun çevrəsi səksən fərsahdır. Sərəndib də buraya daxildir. Burada çoxlu şəhər və kənd var, Bir-birinə tabe olmayan bir neçə padşahları vardır. Buradan səndəl ağacı, qiasint, mixək və başqa dərman bitkiləri ixrac olunur.

**(13) HİCAZ -** uzunluğu bir aylıq yolu olan, Yəmənlə Şam arasındakı daşlı vilayətdir. Paytaxtı Məkkə şəhəridir, - Allah onu hifz etsin! Burada nə bütpərəstlər, nə də zimmilər köçüb yaşaya bilərlər. Burada daum adlı əcaib palma ağacları, onların üzərində mukl adlı meyvələr bitir.

Bacila qəbiləsi yaşayan yerdə dəmir dağı var. Burada (həmçinin) Radva adlı, dərələri çox olan dağ, Yəmənlə Tihama arasındakı Sarat dağı, Yəmənlə Hicaz arasındakı Daris bulağı və Hicazda olan Müşəqqət adlı həm bulaq həm də dərə var.

**(14) HİCR -** Mədinə ilə Şam arasındakı Qura vadisində olan Səmud[1] tayfasının məskəni. Qura vadisində, biri-birindən bir günlük yol məsafəsində olan iki dağ arasında (yerləşən) kəndlərindəndir. Burada, Allah Təala haqlarında «dağlardan (sanki dünyada əbədi yaşayasaqsınız - deyə özünüzə) təkəbbürlə evlər yonub yaşayacaqsınız»[*] deyilənlərin mənzilləri yerləşir.

Orada suyunu həm insanlar və həm də dəvələr içdiyi Səmud tayfasının su quyusu (vardır).

**(15) XATT -** Yəməndə olan Hat Həcər kimi də adlanan kənddir. Hind ölkəsindən gətirilən və burada işlənmiş ən yüngül və ən möhkəm Xatt nizələri buradandır.

**(16) XEYBƏR -** Şam yolunda, Məkkədən səkkiz bərid[**] uzaqlıqda bir qaladır. Zəmiləri və xurma ağacları vardır. Əhalisi çox vaxt qızdırmaya düçar olunmasıyla məşhurdur. Qızdırma burada insanlardan əl çəkmir. Onun əhalisi bir vaxt yəhudi idi.

**(17) ZAVİLA -** İfriqiyədə (Afrikada) bir şəhərdir. Divarları yoxdur. Sudan torpaqlarının başlanğıcındadır. Əhalisinin ayaq ləpirlərinin bilinməsində qabiliyyəti var. Onlar yerlinin və

---

[*] Quran, 26, 149.
[**] Bərid dörd fərsaha bərabərdir.

qəribin ləpirini ayıra bilir, kişi ləpirini arvad ləpirindən (ayırır), oğru, kölə, qaçaq və kölə qadın ləpirini (müəyyən edirlər).

**(18) ZUĞAR -** Kənddir Onunla Beyt əl-Müqəddəsin (Qüdsün) arasında üfunətli gölün[***] sahili boyu üç günlük (yol var). Zuğar, Lut əleyhisalamın, qızıdır. Bu yerdə mənzil saldığı üçün adını kəndə vermişlər. Bu kənd yaramaz bir dərədə və ən uğursuz bir yerdədir. Əhalisi burada öz yerlərini sevdikləri üçün yaşayır. Burada Zuğar adlı budaq var. Deyirlər, suyu qiyamət günündə kəsiləcək.

**(19) SİND -** Uzunluq dairəsi - 105°05'', en dairəsi - 27º40'-dir. Hind, Kerman və Sicistan arasında olan vilayətdir. Deyirlər, Hind və Sind Buqayr ibn Yaqtan ibn Ham ibn Nuh, əleyhisalamın nəslindən olan iki qardaşdır.

Orada səhrada yerləşən və səthi dörd fərsah qızıldan tikilmiş bir ev var. Burada qar yalnız ətraflara yığır. Bu evdən ulduzları seyr edirlər. Hindlilər və atəşpərəstlər bu evə hörmət bəsləyirlər.

Orada eni Dəclə çayının enliyində, bəlkə də daha enli Mihran çayı axır. Ceyhun çayının bəzi qolları kimi bu çay da dağdan axır. Sonra bu çay Multanda, Səməndur ətrafında, sonra da Mənsuranın yanında axır. Nil çayında olduğu kimi, bu çayda da timsah var.

**(20) SUMANAT -** Uzunluq dairəsi - 17º05' en dairəsi - 17º05'-dir. Hind ölkəsində, dənizin lap sahilində yerləşən məşhur şəhərdir.

Orada, içində Sumanat adlı büt olan məbəd var. Həmin büt məbədin içində havadan asılmış idi. Sultan Yəminəddövlə Mahmud ibn Səbüktəqin Hindistanda yürüş edib oranı böyük çətinliklə fəth etdiyi zaman o, həmin bütü yerindən belə götürdü: məbədin tavanından o, oradakı maqnitli daşı çıxardan kimi həmin büt elə o dəqiqədə yerə düşdü.

**(21) SEYMUR -** Hind ölkəsində, Sind (vilayətinin) yaxınlığında olan şəhərdir. Onun əhalisi həddindən artıq gözəl və xoşsifətdir.

Orada dağ keçidinin zirvəsində (yerləşən) Beyt Seymur adlı məbəd var. Onun içində süleymandaşından[1] düzəldilmiş bütlər

[***] Fələstindəki Ölü dənizdən söhbət gedir.

var. Şəhərdə məscid, sinaqoq, kilsələr və atəş məbədi vardır. Əhalisi mal-qara kəsmir, nə ət, nə də balıq yeyir.

**(22) TAİF** - uzunluq dairəsi - 77°30' - en dairəsi - 21º205'-dir. Onunla Məkkə - Allah Təala onu ucaltsın! - arasında on iki fərsahlıq yol var. Onun (vadisinin) gözəl şimal iqlimi var və bəzən (qışda) orada su da donur. Orada, ətrafında Xüzəyl qəbiləsi yaşayan Qəzvan dağı (var). Hicazda bura kimi soyuq yer yoxdur. Bu dağda gön emal edən dabbaqxanalar üçün su var. Burada Taif kəklikləri var. Bu, həmin Dərədir ki, orada Allahın elçisi, - Allah onu salamlasın! - ovlamağı və ot biçməyi qadağan etmişdir.

Orada Lat adlı (ilahinin) daşı, Raxt adlı üzümlük və Aram adlı zindan vardır. Həssat ibn Yusif[1] və Allah Təala övliyalarından biri Səid ibn əl-Saib[2] bu yerdəndirlər.

**(23) FƏS** - Uzunluq dairəsi - 18°05', en dairəsi - 18º05'-dir. Bərbərlər yaşayan Məqrib torpağında, iki keçid arasında yerləşən böyük şəhər və bu keçidlərə qədər uzanan zəmiləri olan sahədir. Burada çoxlu bulaq var və bunların suyu birləşib çaya dönür, sonra da çayın suyunu suvarmada istifadə edirlər. Şəhərin içində bu çayın suları altı yüz dəyirman işlədir. Şəhərin ortasında, ən yüksək yerində bir qala var. Şəhər suyunu verən çayın adı Məfruşdur. Şəhər iki hissəyə bölünür və hərəsi bir şəhər kimidir və hər ikisinin divarı var. Bu - Məqribin ən varlı və ən bərəkətli şəhərlərindən biridir. Burada yaşayan yəhudilərin sayı o qədərdir ki, Məqribdə daha beləsi yoxdur.

**(24) FƏYSUR** - Hind ölkəsində bir şəhərdir. Buradan Fəysur kafuru gətirirlər və bu, kafurun ən yaxşı növüdür. Deyirlər ki, göy gurultusunun, ildırımın və zəlzələlərin çox olduğu illərdə kafur daha çox olur. Əgər bu hadisələr olmayırsa, kafur az olur.

**(25) QUBBA** - Allah elçisinin - Allah onu salamlasın! - şəhərindən iki mil aralı olan kənddir.

Allah Təala adını çəkən Təqva məscidi və Dirər məscidi* buradadır. Bunu camaat könüllü sökdü. (Kənddə) (suvarma quyusu var ki, Allahın elçisi - Allah onu salamlasın! - onun suyunu dadlı hesab edirdi.

**(26) KƏŞMİR** - Hind ölkəsində bir vilayətdir, bir türk tayfası ilə hamsərhəddir, buna görə də (buradakı) türklər hindlilərlə qarışıb. Buranın əhalisi ən gözəl və ən xoşsifət adamlardır. Buranın

---

* "İxtilaf məscidi".

qadınlarının gözəlliyi zərbi-misala dönüb. Onların şux qaməti, qəşəng üz cizgiləri, uzun və qalın hörükləri var.

(Vilayətdə) təxminən altı yüz min şəhər və kənd var və buraya yalnız bir yol vardır. Ətraflarını yüksək dağlar əhatə edir və bu dağları nəinki insanlar, hətta heyvanlar da keçə bilmir. Bütün bu (yerlər) yeganə darvaza ilə bağlanır.

Burada Çin dəmirindən tikilmiş bir evdə böyük rəsədxana var və buna zaman təsir etmir. Onlar Süreyya ulduzuna sitayiş edirlər, heyvan kəsmir və yumurta yemirlər.

**(27) KUMAR -** Hinddə məşhur şəhərdir. Əhalisi pozğunluğa yol vermir və şərabı qadağan edir. Şərab içənin cəzasını padşahları verir. Kumari adlı ən yaxşı əzvay buradandır.

**(28) KALAH -** Hinddə yerləşən (böyük alınmaz və divarları hündür olan bir şəhərdir. Orada çoxlu bağ var. Şəhərin içində qala var və burada əla Kalah qılıncları emal edirlər. Bunlar da əla Hind (qılınclarıdır) və yalnız burada tapılırlar.

**(29) KAULAM -** Hind ölkəsində böyük bir şəhərdir. Əhalisi özü üçün padşahı Sinddən keçir. Burada nə büt var, nə də bütxana. Hindlilər yalnız burada müalicə olunurlar. Onların ev sütunları balıq sümüyündəndir. Onlar balıq yemir, heyvan gəlmir, lakin leş (ölmüş heyvan cəmdəyi) yeyirlər.

Orada gildən tablar istehsal edirlər. Onları (bizim) ölkədə çini qablar adı ilə satırlar. Lakin bu belə deyil, çünki Çin gili Kaulam gilindən daha möhkəm və oda daha da davamlıdır. Burada bəzən yüz dirsəkdən hündür çox böyük tik ağacı bitir, səndəl ağacı, bambuk və qamış da var. Bunlardan başqa burada bitən qabaqın ravənd deyilən kökü var. Əzvayı buraya gətirirlər. Onun bitdiyi yerlərə heç kəs çata bilməyib və heç kəs deyə bilməz ki, onun ağacı nəyə bənzəyir. Onu şimal tərəfə yalnız dəniz ləpələri gətirir.

Bu (şəhərdə) mis mədəni var[1] və bu misin bərkimiş tüstüsündən əla sink əmələ gəlir.

**(30) YASRİB VƏ YA MƏDİNƏ** -Uzunluq dairəsi - 70°20', en dairəsi 25°05'-dir. Allah elçisinin - Allah onu salamlasın! - şəhəridir. Şoran və daşlı yerdədir, ölçüdə Məkkənin yarısına qədərdir. Buraya daxil olan hər kəs ətirsaçan havasını hiss edir. Burada ətir ən yaxşı toxudur. Əhalinin çox yaxşı səsi var. Burada səyhani deyilən xurma növü var və bu başqa yerlərdə yoxdur. Sövüz də var.

Şəhərin divarları var. Mərkəzində peyğəmbərin - Allah onu salamlasın! - məscidi yüksəlir. Valid ibn Əbdülməlik[1] Rum padşahına yazıb ondan Allah elçisinin - Allah onu salamlasın! - məscidini tikmək üçün ustalar göndərməyi xahiş etdiyi vaxt o, buraya Rumdan qırx usta göndərdi. Bu ustalarla birlikdə daha qırx adam və onlarla birlikdə qırx min misqal[*] qızıl və yüklərə bəzək göndərdi.

Ustalar gəlib daşdan məscidin "bünövrəsini qurdular, sütunlarını isə dəyirmi daşlardan düzəldib ortalarına dəmir dayaqlar saldılar və qurğuşunla doldurdular. Tavanını qızılla bəzədilər. Mehrabın daşlarını da zərlədilər, cənub divarını isə içəridən, aşağıdan yuxarısınadək, (insan) boyunda mərmərdən hördülər. Peyğəmbərin - Allah onu salamlasın! - minbərini başqa minbərlə örtdülər. Onun, - Allah onu salamlasın! - qəbri məscidin şərq tərəfindədir, yanıda Əbubəkrin[2] və onun yanında Ömərin[3] - Allah hər ikisindən razı qalsın! - qəbirləri yerləşir.

Burada Budaa, Zərvan və Urva ibn Zübeyr[4] adlanan Urva quyuları vardır.

**(31) MƏRAKEŞ** - Məqrib ölkəsinin ən böyük şəhərlərindəndir. İndi şəhər Əbdülmöminin nəslindən olan sultanın paytaxtıdır.[1] Şəhər böyük çöldə, bərbərlər ölkəsinin ortasındadır. Onunla dəniz sahilinin arasında on günlük yol var. Şəhərdə çoxlu bağ - bostan var. Bayır tərəfindən şəhəri kanallar və arxlar əhatə edir. Buralara ərzağı (başqa) ölkələrdən gətirirlər. Burada uzunluğu üç fərsah olan Əbdülmömin ibn Əlinin bağı var.

**(32) MƏKKƏ MÜŞƏRRƏFƏ** - Uzunluq dairəsi - 77°05', en dairəsi -21°40'-dir. Allahın hifz etdiyi və yüksəltdiyi şəhərdir. Şəhər vadi içərisindədir. Onu hər tərəfdən dağlar əhatə edir. Məkkənin binaları qara və hamar və həmçinin ağ daşlardandır. Yayda buranın havası isti, lakin gecələri xoş havalıdır.

Şəhərin eni vadinin enliyilə birdir. Burada nə su quyuları, nə də çaylar var. Onun suyu göydəndir. Ərzağı gətirilmədir. Məkkədə heç bir dənə də meyvə ağacı yoxdur. Əgər müqəddəs sahədən çıxsan, orada bulaq, su quyusu, əkin və xurma ağacları var.

Müqəddəs sahəyə gəldikdə isə, (deməliyik ki,) onun qədim sərhədləri bürclə təyin və Xəlil[1] - ona salam olsun! - tərəfindən müəyyən edilib. Sahənin (uzunluğu) on mil yoldur.

---

[*] Misqal – 4,235 qramdır.

Haram məscidinə gəldikdə (deməliyik ki,) onun binası Ömər ibn əl-Xəttabın xəlifəlik dövründən qalıb. Sonra binanı Osman (ibn Əffan)[2], sonra da qapılarının sayını artıran Abdullah ibn əz-Zübeyr[3] genişləndiriblər. Sonra Əbdülməlik ibn Mərvan (məscidin) divarlarını yüksəldib. Misirdən Ciddəyə, oradan da Məkkəyə tezliklə sütun gətirdilər. Əl-Həccac əmr etdi ki, onun üstünü zər-xarayla örtsünlər. Sonra Valid ibn Əbdülməlik məscidin bəzəyini artırdı. Əl-Mənsur[4] və onun oğlu əl-Mehdinin[5] xəlifəliyi dövrlərdə məscidin üstünü tikib, onun xarici görkəmini yaxşılaşdırdılar. İndiki dövrdə Məscid əl haramın uzunluğu üç yüz yetmiş dirsək, eni isə - üç yüz on beş dirsəkdir. Məsciddə cəmi dörd yüz otuz dörd sütun var.

Müşərrəf Kəbəyə - Allah Təala onun şərəfini artırsın! - gəldikdə, onun uzunluq və en dairələri Məkkəninki kimidir. Həqiqətən o, Allahın müqəddəs evidir. Yer üzündə Allah əvvəlcə Kəbənin yerini yaradıb. Sonra yerin özünü onun altından uzadıb və bura - yerin mərkəzidir. Kəbəni Xəlil ilə İsmayıl, onlara salamlar olsun! - ucaldıblar. O, məscidin ortasındadır. Tikintinin özü dördküncdür. Qapısının yerdən hündürlüyü (insan) boyu qədərdir. Qapının tayları zərli gümüş lövhələri ilə örtülüb. Kəbənin uzunluğu iyirmi dörd dirsək və bir qarış, eni - isə üç dirsək və bir qarış, hündürlüyü isə yeddi dirsəkdir.

(Qara) daş (məscidin) Şama baxan tərəfindədir. Daşın çatlağı var. Daşın divarları döşəməylə bir yerdə mərmərlə örtülüb. Hündürlüyü insan beli qədərdir. Kəbənin çevrəsində hündürlüyü bir dirsək və eni də bir dirsək üstü gipsli səki var. Bu da onu seldən mühafizə edir. Şərq tərəfində altı dirsək və on barmaq uzunluğu və üç dirsək və on səkkiz barmaq eni olan qapı var. Qara daş iki qayanın üstündədir. Qayanın içində qara daşın yerləşdiyi qədər yer qazılıb və daş oraya daxil edilib. Daş tamamilə qaradır, insan başı boydadır və şərq tərəfdə küncdəki qapının tərəfindədir. Daş yerdən iki və ya üç dirsək hündürlükdədir. Daşla qapının arasındakı Mültəzəmdir. Bu ad ona görə verilib ki, burada and içirlər. Onun (ala-bəzək) rəngi var: qarayla ağın qarışığıdır. Onun boyu on iki dirsək on ikiyədir. Onun çevrəsində eni üç barmaq olan qızıl qurşaq var. Kəbə divarının ortasında olan novça içindən dörd barmağa yaxın bayıra çıxır. Onun eni və hər (parçasının) hündürlüyü səkkiz barmaqdır. Onun daxili tərəfi zərlidir.

Bayır və daxili tərəfdən məscid zərxarayla örtülüb. Onun örtüyü hər il ziyarət vaxtı dəyişilir.

Əl-Məqama gəldikdə - bu, üzərində Xəlil – ona salamlar olsun! - dayandığı daşdır və o, bu yerdən insanlara ziyarət barəsində xəbər verib. Məqamı ölçüsü (bir neçə) dirsəkdir. O, kvadrat şəkillidir. Onun yuxarı hissəsinin həcmi - on dörd barmaq on dördədir, aşağı hissəsi də bu qədərdir. Üzərində qızıl qurşaq var. Bayıra çıxan yerlərində qızıl yoxdur. Hər tərəfdən uzunluğu doqquz barmaq, eni - on barmaqdır. Daşın dayaqlarının arası iki barmaqdır. Onun ortası əl vurmaq və sürtməkdən nazikləşib. O, kvadrat şəkilli hovuzda yerəşir və ətrafı qurğuşundur. Üstündə Hind palıdlarından sandıq var, hərəsinin yanında öz qıfılı olan iki zəncir asılıb.

(Məkkənin) yanında yüksələn Əbu Qubeys dağı var. Orada, vadidə səfa və Mərva adlı iki dağ, Səur Ətxal dağı, Minanın yaxınlığında Sabir adlı böyük dağ, Məkkədən üç millik məsafədə Xira dağı və zirvələri çatılmaz dağlar arasında olan Qidqid dağı vardır. Orada biram daşı karxanası var.

Məkkədə Zəmzəm quyusu var. Bu, Kəbənin yaxınlığında olan məşhur quyudur. Onun yuxarıdan aşağıya dərinliyi qırx dirsəkdir. Onun dibində üç bulaq var. Dairəsi on bir dirsəkdir. Quyu ağzının ölçüsü üç dirsək üç dirsəyədir. Quyu üzərində Hind palıdından mail döşəmə var. Bu - on iki qarqarası olan və su qaldıran alətdir. Quyuya mərmərdən üz çəkən və ətrafını döşəyən birinci adam Əbu Səfər əl-Mənsur olub. Zəmzəmin üzərində qübbə var. Bu da Kəbə qapısının qabağında məscidin ortasındakı dolanma qapısının yanındadır.

**(33) MULTAN -** Uzunluq dairəsi - 107°35' en dairəsi - 29°40'-dir. Sindlə yanaşı Hind ölkəsinin ən böyük və istehkamlı şəhərlərindəndir. Bura, (əhalisinin) ziyarətgahıdır. Bizdə Məkkə olduğu kimi, bura da onların ziyarət etdiyi məkandır. Əhalisi müsəlmanlardan və kafirlərdən ibarətdir. Şəhərə hakim olan müsəlmanlardır. Burada Hindlilər sitayiş edən sənəm (büt) var. Ona sitayiş etmək üçün camaat ölkənin ən ucqar yerlərindən gəlir.

**(34) MALİBAR -** Hind ölkəsində geniş bir vilayətdir. Tərkibində çoxlu şəhər var. Burada istiot ağacı var. O, çox hündürdür və altından həmişə su (axır). Onun meyvəsi salxıma (oxşayır). Gün qalxanda və istilik artanda onun yarpaqları bu salxımları örtür, yoxsa onlar yetişənə  qədər yanıb tökülərlər.

**(35) MİNA -** Məkkədən bir fərsah aralı olan şəhərdir. Onun uzunluğu iki milldir. Şəhər orada yüksələn iki dağ arasındadır. Orada karxanalar, quyular və ziyarət vaxtı dolu, amma ilin başqa vaxtında boş qalan evlər var.

**(36) MƏNDURFİN -** Hind ölkəsində şəhərdir. Burada bambuk cəngəllikləri var. Buradan bu bambukun külü olan təbaşir[1] ixrac olunur. İş ondadır ki, bambuk quruyanda və küləyə məruz qalanda onun gövdələri bir-birinə sürtülür və nəticədə yanğın əmələ gəlir. Bəzən od əlli fərsahlıq bambuk sahəsini yox edib külə döndərir.

**(37) MƏNDƏL -** Hind ölkəsində olan şəhərdir. Burada məndəli adlanan çoxlu əzvay var. Lakin bu əzvay bu yerlərdə bitmir. O, ekvator xəttindən o yanda olan adalarda bitir lakin oralara heç kəs gedə bilmir.

**(38) MƏNSURƏ -** Uzunluq dairəsi - 105°05' en dairəsi - 27°40'-dir. Bu, Sinddə olan məşhur şəhərdir. Onu Abbasilərdən ikinci xəlifə Əbu Səfər Mənsur tikdirib. Burada vilayət hakimlərinin qaldığı yerdir. Mehran çayından (şəhərə) kanal çəkilib, kanal şəhəri əhatə edir və buna görə də şəhər ada kimidir. Mehran çayının enliyi Dəclənin enliyi kimidir. Çay şərq ətrəfdən axıb Sinddən aşağıda Fars dənizinə tökülür. suyu çox ləzzətlidir.

**(39) NƏCRAN -** Məkkə tərəfə baxan Yəmənin bir vilayətdir. Şəhəri Nəcran ibn Zeydan ibn Səba ibn Yaşcub tikib.

Orada (Məkkə) Kəbəsinin müqabilinə Əbdülmudan ibn Rəyyan əl-Hərisi Nəcran Kəbəsini bina edib. Bura yepiskopların iqamətgahı idi.

Nəcran şəhidlərinin başçısı Abdullah ibn ən-Nəmir buralıdır. Padşah xəndəklər qazdırıb onları odunla doldurtdu və yandırdı. Allah Təalanın dediyi «Xəndək sahibləri lənətə düçar oldular»[*] - sözləri məhz bu hadisəyə görə buyrulub.

**(40) HİND** - uzunluq dairəsi - 115°50; en dairəsi - 26°35;-dir. Əcaib möcüzələri hesabsız olan geniş bir ölkədir. Onun uzunluğu üç aylıq enliyi isə iki aylıq yoldur. Allah ölkələrinin arasında Hind dağları və çayları ilə ən zəngindir. O, qiymətli bitkiləri və çoxlu əcaib heyvanları ilə fərqlənir. Buradan başqa ölkələrə hər cür nadir şeylər ixrac olunur, lakin tacirlər buranın yalnız ucqar yerlərinə gəlirlər. O ki qaldı buranın uzaq yerlərinə,

[*] Quran, 85, 4.

(deməliyik ki,) bizim ölkələrin adamlarından oralarda nadir hallarda olurlar, çünki bu uzaq yerlərin əhalisi kafirdir, quldurlar və qatildirlər. Onların arasında elələri də var ki, onlar Xaliqi peyğəmbərsiz tanıyırlar. Bunlar – brəhməndirlər. Aralarında hər iki inamı qəbul edənlər də var. Əhalinin bir qismi bütlərə, digəri - aya, başqası - atəşə sitayiş edirlər.

Burada qiymətdi daşların mədənləri var. Altı quyruqlu qoyunları var. Elə quşları var ki, öləndən sonra onun dimdiyinin yarısından gəmi düzəldirlər. Orada böyük bir ibadətgah var, adı da Bələzridir. Ətrafında ayrı-ayrı min dənə otaq var. Hərəsində bu sənəmə bağışlanan qız var ki, bunlar da gələn zəvvarlar üçündür.

Hindin ən ucqar yerində bir yer var ki, onun torpağı qızılla qarışıqdır. Burada nəhəng qarışqaların elə bir cinsi var ki, bunlar itlərdən yeyin qaçırlar. Buralar çox istidir. Gün qalxan kimi qarışqalar yerin altına girirlər. Bunlar da gedəndən sonra Hind camaatı buraya yük daşıyan heyvanlarla gəlib həmin torpaqdan yükləyib tez çıxıb gedirlər ki, qarışqalar onlara hücum edib yeyib didməsin.

Buranın möcüzələrindən biri bir daş sayılır. Buna gecələr rast gəlmək olar, gündüzlər tapılmır. Bu daşla başqa daşları sındırmaq olar, başqa bir daş isə buna heç bir təsir göstərməz. Akonit bitkisi yalnız burada tapılır. Bu ən öldürücü zəhərdir.

(Bu ölkədə) elə bir şəhər var ki, buraya gələn hər qərib adam, lap burada yaşayan olsun, cinsi əlaqəyə girə bilməyib aciz qalır. Lakin buradan gedən kimi hər şey düzəlir.

Burada bir göl var. Ölçüsü on fərsah on fərsahadır. Buna heç bir çayın suyu tökülmür. Bunun suyunda insana oxşar heyvanlar var. Gecə olan kimi (onların) çoxu göldən çıxıb, sahildə oynaşır, rəqs edir və əl çalırlar. Aralarında çox gözəl qızlar da var.

**(41) HƏCƏR** - Uzunluq dairəsi - 83°05' en dairəsi - 25°15'-dir. Böyük şəhərdir. Bəhreynin paytaxtıdır. Burada xurma, nar, əncir, limon ağacları var və pambıq bitir. Peyğəmbər - Allah onu salamlasın! - deyib: «Əgər iki bardağı su ilə doldursaq palçıq ola bilməz». Bunu deyəndə Həcər bardaqlarını nəzərdə tuturdu, çünki bu bardaqların həcmi beş yüz rətldir.* Buranın əhalisinin dalağı şişmiş olur.

* Rətl – 406,25 qramdır.

**(42) YƏMAMƏ -** Uzunluq dairəsi - 82°30', en dairəsi - 23°05'-dir. Hicazla Yəmənin arasında olan vilayətdir. Allahın ən gözəl xurması və (müxtəlif) ağaclar bol olan yerdir. Bura, Ləvaz ibn Arim ibn Ləvaz ibn Samın nəslindən olan Təsm və Cadis qəbilələrinin məskənidir. Onlar burda yaşayıb artırdılar. Onlara padşahlıq edən Əmlik adlı rəhmsiz bir zalım idi. O, hakimiyyətini özü bildiyi kimi icra edirdi.

Yəmamənin rəhmanı adlanan Müseylimə əl-Kəzzab[1] da buradandır. O, Allah elçisinin - Allah onu salamlasın! - vaxtında peyğəmbərliyin iddiasında idi. Sonra, Abu Bəkrin xəlifəliyi dövründə o, öldürülmüşdü. İnsanı bir günlük yoldan görən qadın - Zərqa əl-Yəmamə da buradandır.

## ÜÇÜNCÜ İQLİM

Onun başlanğıcı, gecə-gündüzün bərabərliyində, günorta vaxtı, kölgənin uzunluğu üç qədəm, qədəmin yarısını, onda birini və altıda birini təşkil edən yerdədir. Onun axırı, gecə-gündüzün bərabərliyində günorta vaxtı, kölgənin uzunluğu dörd qədəm, qədəmin yarısını və onda üçünü təşkil edən yerdədir.

O, Məşriqdə başlanıb, Çin ölkəsinin şimalından keçir, sonra Hinddən, sonra Sinddən, sonra da Kabulun, Kermanın, Sicistanın, Farsın, Əhvazın, hər iki İraqın, Şamın, İskəndəriyyənin, Barkanın, İfriqiyənin üzərindən keçib Muhit dənizinin sahilində qurtarır. Günün uzunluğu iqlimin əvvəlində on üç saat yarım və on beş dəqiqədir. Şərqdən qərbə onun uzunluğu səkkiz yüz min yeddi yüz yetmiş dörd mil və qırx beş dəqiqədir, eni - üç yüz yetmiş dörd mildir.

İndi isə onun bəzi yerlərini sıra ilə yada salaq.

**(1) ƏBƏRKUH -** Fars torpağında məşhur şəhərcikdir. Onu Bərkuh da adlandırırlar. Burada yağış çox az olur. İddia edirlər ki, bu - xəlil, əleyhi salamın, lənətinə görədir. Torpaq şumunda (əhalisi) öküzləri işlədir. Deyirlər ki, orada Siyavuşun odundan qalan küldən böyük bir təpə əmələ gəlib.

**(2) ƏBYAR -** İskəndəriyyənin yaxınlığında olan şəhərdir. Orada soda[1] mədəni var. Buraya hər bir düşən şey sodaya dönür. Burada daim bərk küləklər əsir. Şəhərin (ətrafında) çoxlu şir var.

**(3) İXMİM -** Şərqi Nilin sahilində yerləşən şəhərcikdir. Zəmiləri və xurma ağaclarına görə inkişafdadır. Orada Misirin

möcüzələri sayılan birbalar var. Birba - cadu və sehirbazlıqla məşhur olan evlərdir.

Əbülfeyz Zunnun Misri[1] buralıdır. Onun vaxtında özü kimi bilikli, dindar və ləyaqətli adam olmayıb. Çoxlu əcaib işlər onun adıyla bağlıdır.

**(4) ƏRRƏCAN** - Uzunluq dairəsi - 86°30□ , en dairəsi - 35°30□-dir. Ənuşiravanın[1] atası Qubad ibn Firuzun[2] Farsda tikdirdiyi məşhur olan şəhərdir. Orada bir gözlü gözəl bir körpü var. Onun iki dayağı arasında olan məsafə səksən addımdır. Oradakı dağda bir mağara var ki, onun daşları arasından tərə bənzər su sızır. Bundan gözəl mumiyə[3] əmələ gəlir.

**(5) URDUN** - Ğutadan qərbdə yerləşən Şamın bir vilayətdir. Mərkəzi - Təbəriyədir. Onunla Beyt əl-Müqəddəsin arasında üç mil var. Orada Təbəriyə adlı üfunətli bir göl var. Çevrəsi - üç günlük yoldur. Onu dağlar əhatə edir, suyunda da heyvan yaşamır.

Buradan ismətli havarilər çıxıb. Bura, Yaqub, əleyhi salamın, məskənidir. Yusif Sadiqin, - ona salamlar olsun! - quyusu buradadır.

**(6) ƏRİXA** - Beyt əl-Müqəddəsin yaxınlığında Urdunun bir vilayəti olan Ğaurada[1] yerləşən şəhərdir. Burada xurma, banan və şəkər qamışı bitir. Bura, lovğalananların şəhəridir və Allah Təala Musaya, - ona salamlar olsun! - əmr buyurdu ki, buraya daxil olsun. Musa da İsrail oğullarına dedi: «Ey camaatım! Allahın sizin üçün əzəldən (vətən) müəyyən etdiyi müqəddəs torpağa (Şama) daxil olun!»[*]

**(7) İSKƏNDƏRİYYƏ** - uzunluq en dairəsi - 61°55', dairəsi - 30°58',-dir. Misirdə dəniz sahilində yerləşən məşhur şəhərdir. Onu Birinci İskəndər tikdirib. O da - Aşak ibn Selevkus Ruminin oğludur. İskəndər bütün yer üzünü gəzib. Zülmət ölkəsinə, günəşin çıxdığı və batdığı yerlərə gedib çatıb və Yəcüclə Məcucun əleyhinə sədd ucaldıb.

Bəziləri isə deyirlər ki, bu səddi Faylafus (Ptolomey) Ruminin qızının oğlu Daranın oğlu Birinci İskəndər tikdirib. Bu da Çinə və Məqribə gedib və otuz iki yaşında ölüb. Birincisi (vahid Allaha) inanırdı, ikincisi isə, öz müəllimi Aristotelin dininə bağlı di. Amma aralarından uzun illər keçib.

---

[*] Quran, 5, 21.

Və deyirlər ki, (İskəndəriyyə) - qədim şəhərdi və Ad oğlu Şəddadın tikintilərindəndir. Tikintilərin qalıqları və daş sütunlar İskəndərin tikdiyi dövrə qədərki vaxta aiddir. Onun möcüzələrindən biri - bir parçadan düzəlmiş və böyük kvadrat ölçülü daşdan olan bünövrəsinin üstündə ucalan nəhəng mayaka oxşayan sütundur. Orada hərəkətdə olan dairə (disk) var. Deyilənə görə o, günəşin hərəkətinə görə fırlanır.

Orada bir mayak var. Onun aşağı hissəsi qayadan yonulub. Ondan yuxarı səkkizguşəli minarə var, ondan da yuxarıda qəşəng dəyirmi minarə yerləşir. Birinci (hissənin) uzunluğu - doxsan dirsək, səkkizguşəli minarənin - doxsan dirsək, dəyirmi minarənin də - otuz dirsəkdir. Mayakın ən yuxarısında inikas güzgüsü var idi. Onun yanında nəzarət üçün adam təyin edilmişdi və o, hər an güzgüyə baxırdı. Əgər Rum ölkəsindən düşmən gəmi ilə İskəndəriyyəyə tərəfə gəlirdisə, nəzarətçi onu güzgüdə görürdü və bu barədə əhaliyə xəbər verirdi ki, düşməni dəf etməyə hazırlaşsın. Bu güzgü (xəlifə) Valid ibn Əbdülməlikin vaxtına qədər mühafizə olunurdu. (Sonra) mayakın yarısını dağıdıb güzgünü yerindən çıxardılar. Bu barədə məşhur hekayə var.

**(8) ƏSYUT** - Nil çayının qərb sahilində əs-Səid vilayətlərinin birində, bar-nemətiylə zəngin olan və istirahət yerləri ilə fərqlənən düzənlikdə yerləşən şəhərdir. Burada başqa ölkələrə ixrac edilən Misir tiryəki istehsal olunur. Orada çox gözəl tikintilər var ki, onların adlarının çəkilməsiylə kifayətlənməyib, özlərini görmək daha münasib olardı.

**(9) UBULLA** - Uzunluq dairəsi -84°05', en dairəsi - 30°05'-dir. Yaşıl ağacları, oxuyan quşları, axar suları, gözəl bağları və gülləri ilə gözə çarpan Bəsrənin bir vilayətidir. Onun sahəsinin çox hissəsinə gün işığı təsir etmir və kəndləri də ağacların çoxluğundan kənardan görünmür. Vilayət, şərqi və qərbi, iki hissədən ibarətdir. Şərq hissəsi çiçəklənir, çünki orada bağlar, ağaclar və kəndlər var. Buranın arxları Dəclə çayından başlanır. Qərb hissəsi isə xarabalıqdır.

**(10) İSTƏXR** - Uzunluq dairəsi - 88°30' en dairəsi - 30"05'-dir. Farsın ən qədim şəhəridir. Binasını kimin qoyduğu bəlli deyil. Süleyman - əleyhi, salam! -(səhər yeməyini Bəalbəkdə yeyib, axşam yeməyini isə İstəxrdə. Orada atəşpərəstlərin böyük məbədi var. Deyirlər ki, bu yer Süleyman - əleyhi salamın, ibadət yeri idi. (Məbəddə) qayadan yonulmuş əcaib sütunlar var. Onların

yuxarılarında qayadan qoyulmuş nəhəng təsvirlər var. Məbəd dağın altında (yerləşir). Bu, çox böyük məbəddir. Buranın möcüzələrindən biri də odur ki, məbəd ətrafında gecə - gündüz yel əsir onun əsməsi heç vaxt azalmır.

Suvar əl-əqalimin müəllifi, İstəxri[1] buralıdır. Əsərində o, məskun olunmuş vilayətlərdən, onların şəhərlərindən, kəndlərindən və aralarında o, məsafələrdən bəhs edir.

**(11) İFRİQİYƏ** - böyük və bərəkətli, münbit torpaqlı, çoxlu zəmiləri, ağacları, xurma və zeytun ağacları olan şəhərdir. Qədimdə çoxlu şəhəri olan (vilayət) idi, indi isə qırx günlük məsafəsi olan Məqribdəki səhralardır. Burada bərbər qəbilələri (yaşayır). Burada yaşayanların su ehtiyatları çənlə saxlanılır.

Orada gümüş, dəmir, mis, qurğuşun, sürmə və mərmər mədənləri var.

**(12) ANSİNA** - Misirdə qədim və böyük şəhərdir. Nil çayının şərq sahilindədir. Oranın kişi və qadınları hərəsi öz işilə məşğul olan vaxt daşa döndülər: ər öz arvadıyla yatan yerdə, qəssab ət doğrayan zaman, qadın xəmir yoğurarkən, uşaq beşikdə yatarkən, çörək də bişirildiyi vaxt.

**(13) ƏHVAZ** - Uzunluq dairəsi - 85°05', en dairəsi - 31°05'-dir. Bəsrəylə Fars arasında, Xuzistan adlanan vilayətdədir. Orada zəmilər, sular və çöllər, müxtəlif meyvələr, şəkər qamışı və çoxlu çəltik var. Yayda burada cəhənnəm istisi olur. Orada çoxlu ilan və sarı əqrəb olur.

**(14) ƏYLA** - Qulzum dənizinin sahilində, Şam tərəfdə yerləşən şəhərdir. Bu çox şöhrətli, Davud, əleyhi salamın, vaxtından qalan şəhərdir. İndi buraya Şamdan və Misirdən gəmilərlə gələn zəvvarlar yığışır. Bu, həmin yerdir ki, Allah Təala onu «dəniz kənarında yerləşən qəsəbə»* adlandırıb. Onun əhalisi yəhudilərdir. Allah burada şənbə günü balıq ovlamağı qadağan edib və bu barədə hekayət də var.

**(15) BUŞMUR** - Misirdə bir vilayətdir. Burada kəndlər, zəmilər və talın meşələr var. (İslam) ölkələrinin heç birində burada olan iri, yaxşı və böyük quyruqlu qoyunlardan yoxdur. Elə ağır quyruqları var ki, onu gəzdirmək üçün altına kiçik təkərlər bağlayırlar. Təkərləri qoyunların boynuna bağlayırlar və qoyun otlayanda təkərli quyruğunu əziyyətsiz daşıyır.

---

* Quran, 7, 163.

**(16) BƏALBƏK** - Uzunluq dairəsi - 70º45', en dairəsi - 33º40'-dir. Dəməşqin yanında məşhur qədim, suyu bol olan, ağacı və meyvəli bir şəhərdir. Şamın bütün şəhərlərinə ərzaq buradan gedir. Orada əcaib binalar və abidələr, tayı-bərabəri olmayan qəsrlər var. Deyirlər, bu şəhr Bilqeyisin toy hədiyyəsidir. Burada Davud oğlu Süleymanın - ona salamlar olsun! - qəsri (durur) və bu qəsr Xəlilin - ona salamlar olsun! - olduğu yerdir. İlyas peyğəmbərin - ona salamlar olsun! - vənki də buradadır.

**(17) BƏLQA** - Şamla Vadi əl-Quranın arasında olan vilayətdir. Başqalarına xor baxanların kəndi və Şərqat şəhəri buradadır. Deyilənə görə (yeddi yuxulamış oğlanların) mağarası və (üzərində bu yatanların adları həkk olunmuş qurğuşundan düzəldilmiş) Raqim (adlı lövhə) buradadır.

**(18) BULYANA** - yuxarı Misirdə Nil çayının sahilində yerləşən şəhərdir. Burada (elə) tilsim var ki, yanından üzən timsah mütləq arxası üstə çevrilir və daha qarnı üstə çevrilə bilməyib ölənə qədər bu vəziyyətdə qalır.

**(19) BALARM** - Məğrib dənizindəki Siciliya adasında olan şəhərdir. Deyirlər ki, Sokrat* burada, ağacdan emal (edilmiş) və sallanmış nə isədə rahatlanıb və xristianlar da onun bu qəbrinə hörmət bəsləyirlər. Buradakı məscidlərin eayı (islamın) başqa yerlərində olanlardan çoxdur.

**(20) BEYT LƏHM** - Beyt l-Mütəddəsdən iki fərsah aralı olan kənddir. Burada İsa, - ona salamlar olsun! - anadan olub. Orada, içində xurma ağacının parçası (saxlanılan) kilsə var. Təkid edirlər ki, Məryama - ona salamlar olsun! – “Xurma ağacını özünə tərəf silkələ”** deyiləndən sonra o, dadına baxdığı parça həmin xurma ağacınındır.

**(21) BEYT ƏL-MÜQƏDDƏS** -Uzunluq dairəsi - 68º05', en dairəsi - 31°05' -dir. Bu şəhər peyğəmbərlərin olduğu məskən, şəriətin qibləsi və vəhyin endirilən yeridir. Şəhərin binasını Davud qoyub, tikililməsi də Süleymanın, - hər ikisinə salamlar olsun! - vaxtında başa çatıb. Orada Süleyman əcaib binalar, o cümlədən sallanmış zənciri olan tübbə tikdirib. Bu zəncirə yalnız dindar adamın əli çata bilər, mürtədin yox. (Qeyri-adi) şeylərin içərisində burada tikdiyi, möhkəmlədiyi və bəzədiyi (bir ev var.

---

* Qəzvində - Aristoteldir.

** Quran, 19, 25.

Əgər bu evə dindarla mürtəd daxil olsa, dindarın əksi ağ divarda görünür, mürtədin isə qara divarda.

(Şəhərin) zəmiləri və mülkləri hündür dağlardadır. Onun ətrafında çöl yoxdur, (buna görə də) zəmiləri dağ ətəklərindədir. O ki qaldı şəhərin (özünə), o, açıq bir sahədə, dağlar arasındadır. Buranın torpağı daşlıdır. Şəhərdə çoxlu qəşəng ev var. Onun əhalisi yağış suyunu içir. Şəhərin hər bir evində su çəni var və bunların içinə küçələrdən axan su dolur. Torpağı daşlı olsa da, o qədər çirkli deyil. Suları isə çox pisdir. Tövratda deyilir ki, (Qüds-əqrəblərlə dolu olan qızıl teştdir.

Orada, şəhərin şərq tərəfində Məscid əl-Əksa[*] yerləşir. Onun uzunluğu yeddi yüz səksən dörd dirsəkdir, eni - dörd yüz əlli beş dirsəkdən çoxdur. (Məscidin) içində altı yüz səksən dörd sütun var. Məscid çox gözəl və möhkəmdir və müxtəlif rəngdə və alabəzək mərmər sütunların üzərində tikilib.

Məscidin həyətində beş dirsəklik hündürlüyündə böyük eyvan vardır. Buraya bir neçə tərəfdən pilləkənlə qalxırlar. Eyvanın mərkəzində mərmər sütunların üstündə qurulmuş səkkizguşəli qübbə var. Onun üstü qurğuşunla örtülüb, içəridən və bayırdan müxtəlif rəngli mərmərlə bəzənib. (Qübbənin) mərkəzinin aşağısında çəpinə uzanmış qaya var. Onun altında mağara var və buraya bir neçə pilləkənlə enib ibadət edirlər.

Qübbəyə bir neçə giriş yolu var. Ondan şərq qübbədən kənarda, həmin eyvanda yerləşən gözəl sütunlar üzərində başqa bir qübbə var. Qayanın içində otuz sütun var. Qaya, üstündə olan qurğuşun lövhələriylə örtülüb və cəmisi üç min doxsan iki lövhədir. Bunların üstündə zərlənmiş mis lövhələri var.

Məscidin tavanlarında dörd min ağac tiri, damlarında isə qırx beş min qurğuşun lövhəsi var. Qayanın ölçüsü otuz üç dirsək iyirmi yeddiyədir. Qayanın (altında) olan mağaraya altmış doqquz adam yerləşir. Məsciddə min beş yüz çıraq yandırılır, qayanın üstündə isə - dörd yüz əlli çıraq.

Beyt əl-Müqəddəsdə Qumamə[1] var. Bu da mərkəzdə yerləşən xristianlar üçün nəhəng bir kilsədir. Lakin (kilsənin), onun binasının və bəzəklərinin yaxşı təsviri yoxdur.

**(22) BƏRBƏRLƏR ÖLKƏSİ** - Bərqədən başlayaraq Məqribin axırlarına və Muhit dənizinə qədər uzanan geniş ölkədir.

---

[*] "Ən uzaq məscid".

Əhalisi çoxsaylıdır. Deyirlər ki, onlar Calut xalqının nəslindəndirlər. O, öldürüləndən sonra onun xaltı Məqribə qaçıb oradakı dağlarda yerləşdilər. Onlar Allah Təalanın ən nəzakətsiz* və çoxsaylı məxluqlarındandır. Onlar qiyama ən tez qapılır və yanlış fikirlərə təşviq edənlərə on tez tabe olanlardır. Onların qəribə işləri və təəccüblü ifadələri var. Şeytan onları müxtəlif şeylərlə yoldan çıxarıb və öz gözlərində özlərini gözəl göstərib.

**(23) BABİL** - Qədim zamanlarda İraqda, Fərat çayının bir qolunun sahilində yerləşən kəndin adıdır. İndiyə qədər adamlar onun kərpiclərini qopardıb aparırlar. Orada Danilyalın, - ona salamlar olsun! - quyusu durur və yəhudilərlə xristianlar ilin müəyyən vaxtında ona tərəf axışırlar. İnsanların çoxu təkid edirlər ki, bu - Harut və Marutun quyusudur və özləri də bunun içində başları aşağı asılmışlar. Bəziləri təkid edirlər ki, Babil bütün İraq torpağının adıdır.

**(24) BƏSRƏ** - Uzunluq dairəsi - 84°05', en dairəsi - 30°05'-dir. Müsəlmanlar tərəfindən tikilən və Kufədən il yarım qabaq məskun olunan məşhur şəhərdir. Dəniz kənarındadır. Çoxlu xurma və başqa ağacları var. Torpaqlar (burada) şorludur, suyu da şordur, çünki dənizdən gələn suyun qabarması Bəsrədən yuxarıya üç günlük məsafəyə qədər qalxır və Dəcləylə Fəratın suları (Bəsrəyə) çatanda bu sular dəniz suyu ilə qarışıb şorlanır.

Bəsrə möcüzələrindən biri - suyun qabarması və çəkilməsidir. Bu da ona görədir ki, Dəclənin və Fəratın suları Bəsrə yaxınlığında birləşib, şimaldan cənuba axan böyük çaya dönür və bu da çəkilmə adlanır. Sonra (su) cənubdan şimala qalxır və bu qabarma adlanır. Belə hal gündə iki dəfə olur.

(Bəsrə möcüzələrindən) biri də Übeydallah ibn Ziyadın[1] tikdirdiyi ağsaraydır. Onun ətrafında əcaib kanallar var. Zəmanəsinin ən görkəmli (adamı) və hicri 110 (728) ildə, səksən səkkiz yaşında vəfat etmiş Əbusəid Həsən ibn Əbülhəsən əl-Bəsri[2] və Allah Təala tərəfindən yuxuları yozma biliyi bəxş edilmiş, Anas ibn Məlikin[3] mövlası olan Əbu Bəkr Məhəmməd ibn Sirin[4] buralıdırlar. Qazi Əbu Bəkr ibn Təyyibəl - Batillani[5] də buralıdır. O, layiq bir imam və dindar alim idi.

**(25) BAĞDAD** - Uzunluq dairəsi - 80°05', en dairəsi - 33°21'-dir. (İslam) ölkəsinin ağacı və salamatlıq şəhəridir (Mədinət

---

* Qəzvində - "mehriban"dır.

əs-salam). Onun havası başqa yerlərin havasından daha mülayim, suyu başqa yerlərin sularından daha şirin, torpağı başqa torpaqlardan daha bərəkətli, xəfif yeli isə başqa yerlərin yelindən daha nəsimdir.

Şəhəri Mənsur Əbu Səfər Abdullah ibn Məhəmməd ibn Əli ibn Abdullah ibn əl-Abbas Qövs bürcünün[*] altında, Günəş bu bürcün dərəcəsində olan zaman tikdirib.

Deyirlər ki, o, (şəhəri) çayın qərb tərəfində tikdirib və daşın birincisini öz əliylə qoyub. Öz iqamətgahını və cümə məscidini şəhərin mərkəzində yerləşdirib. sarayın üstündə bir qübbə ucaldıb və onun hündürlüyü səksən dirsəyə çatırdı. Qübbə yaşıl (rəngdədir). Onun yuxarısında əli nizəli atlının heykəli (var idi). Qübbənin yuxarısı hicri 329 (940)-cu ildə yerə düşdü. İndi ondan bir iz də qalmayıb.

Bağdad, əsasını Səfər ibn Yəhya Bərməkinin[1] sarayı təşkil edən şərqi şəhərdən də ibarət idi. (İndi) bura böyük bir şəhərə dönüb, əhalisi çox sıxdır, barı, bərəkəti də çoxdur. Buraya bütün dünyadan ən incə və ən nadir şeylər gətirilir. (Şəhərin) ayparaya oxşar Dəclə çayının sahilindən başlayan və sahilində də qurtaran divarı var. Orada əl-Müttədirbillahın[2] tikdirdiyi binalardan üstüörtülü bağ var (darüş-şəcərə). Bu, çoxlu ağacları və gözəl bağları olan geniş bir sahədir. Elə orada, əl-Müstənsirbillah[3] tikdirdiyi mədrəsə var. Bunun tikilməsinə qədər belə gözəl tikili olmayıb. Mədrəsə qapısının üstündə eyvan və onun ortasında, qutu içində, qəribə bir saat var.

Hisri 656 (1258)-ci ildə buraya öz qoşunu ilə Hülakü gəlib şəhəri aldı və deyirlər ki, bu əhvalat xəlifə əl-Möstəsimbillahın vaxtında olub.[4]

Layiqli, geniş bilikli və təbiətinə görə bacarıqlı insan olan qazi Yəhya ibn Əksam[5] və Əbu Abdullah Əhməd ibn Məhəmməd ibn Hənbəl[6] buradandırlar. Bunun nəsli Mərvdəndir, lakin Bağdada köçdülər və özü burada böyüyüb. O, hicri 241 (855)-ci ildə vəfat edib. Əbülqasim Cünəyd ibn Məhəmməd[7] və onun dayısı və müəllimi Əbülhəsən əs-Sari ibn Əlmütallis əs-Səqati[8] də buradandırlar. Cünəydin nəsli Nəhavənddəndir, özü isə Bağdadda anadan olub. İbn əl-Bəvvab adı ilə məşhur olan ustad Əli ibn Hilal əl-Xəttat[9] da buralıdır. Sənətində ona bərabəri yox idi.

---

[*] Oxatan bürcü.

**(26) BEYDA** - Farsda yerləşən və Süleymanın, - ona salamlar olsun! - cinləri tərəfində ağ daşlardan tikilmiş şəhərdir. Orada uzaqdan görünən quxəndiz* var. Bu, gözəl, gəlir yerləri çox olan, təmiz havalı və şirin suyu olan şəhərdir. Burada nə ilan, nə də əqrəb var. Orada üzümün (elə növü) var ki, onun hər dənəsi on misqal ağırlığındadır və elə alması var ki, çevrəsi iki qarışdır.

Möcüzələr yaradan və misilsiz işlər görən Hüseyn** ibn Mənsur əl-Həllac[1] buralıdır. O, əl-Müqtədirbillahın vaxtında zindana salınmışdı. Onu, hicri 309*** (922)-cu ildə çarmıxa çəkib yandırdılar.

**(27) TAHƏRT** - Uzunluq dairəsi - 35°30', en dairəsi - 29°03'-dir. Məqribin ən uzağında bir-birilə üzbəüz olan iki şəhərin adıdır. Şəhərin biri qədimdir, ikincisi - yeni. Orada yağışlar, çiskinlər və dumanlar çox olur və buralar ən soyuq (yerdir). Burada günəş çox az çıxır. Oranın əhalisi öz ağılsızılığı ilə məşhurdur. (Şəhərlərin) hər ikisində çoxlu ağac və meyvə var. (Buranın) heyvası dadına və gözəlliyinə görə bütün dünyanın heyvalarından üstündür.

**(28) TƏDMUR** - Şamda yerləşən və binaları mərmər sütunlardan olan qədim bir şəhərdir. Təkid edirlər ki, bu, cinlərin Davud oğlu Süleyman, - hər iki cinə salamlar olsun! - üçün tikdirdikləri şəhərlərdəndir. Orada çoxlu təsvir var, o cümlədən də daşdan yonulmuş iki xadimənin timsalı. Rəssam da onların timsalını bəzəyib.

**(29) TUSTƏR** - uzunluq dairəsi - 84°30', en dairəsi - 31°30'-dir. Əhvazın məşhur mərkəzidir, nemətlər bol və gəlir yerləri çox olan şəhərdir. Şəhər su ilə əhatə olunub. Orada Şapurun[1] tikdirdiyi (fəvvarə) var bu da ən əcaib və ən möhkəm qurğulardandır. Onun uzunluğu təxminən bir milə qədərdir, suyu ya Tüstərə gəlib çatır, O, çox ustalıqla tikilib: daşdandır, dayaqları - dəmirdən, yatağı da qurğuşundandır.

Aşkar möcüzələr yaradan Səhl ibn Abdullah Tustəri[2] buralıdır.

---

* Quxəndiz – iç qaladır.
** Əlyazmada səhvən "Həsən"dir.
*** Əlyazmada səhvən 809-cu ildir.

**(30) TANAS -** İfriqiyədə, istehkamlı, içərisinə qalxmağı çətin olan içqalası olan şəhərdir. Rəiyyətlərinin qorxusundan hakimləri şəhərin alınmazlığına görə buraya sığınırlar.

Havası sağlam deyil, suyu da pisdir. İlin çox vaxtı əhalisini qızdırma incidir. Orada çoxlu adamyeyən canavar və birə var. Əhalisi də bundan təngə gəlir.

**(31) TUNİS** - uzunluq dairəsi - (?), en dairəsi - 32°05'-dir. Məqribdə, dəniz sahilində yerləşən böyük şəhərdir. İfriqiyənin paytaxtıdır. Bütün şəhərləri arasında burada çox sağlam hava və ən şirin su var. Burada elə meyvələr var ki, başqa (şəhərlərdə) yoxdur. Burada o qədər müxtəlif balıqlar var ki, hər ay bir cür, başqasından fərqlənən balıq görmək olar. Onu duzlayırlar və balıq iki il saxlanılır. Çox dadlı və görkəmli balıqdır.

**(32) TİH** - bu həmin yerdir ki, burada Musa, - ona salamlar olsun! - İsrail oğulları ilə birlikdə dolaşırdı. Bu yer Ayla, Misir, Qulzum dənizi və Sarat dağları arasındadır və sahəsi qırx fərsah qırxadır (İsrail oğulları) Müqəddəs torpağa girməkdən boyun qaçırandan sonra, Allah, - adı Usa və Uğurlu olsun! - onların həmin Tihdə qırx il saxladı. Onlar bütün günü gəzirdilər, gün başa çatanda səhərə qədər dayanırdılar, səhər açılanda isə yenə özlərini dünən yola çıxdıqları yerdə tapırdılar.

**(33) TİNNİS ADASI -** Böyük dənizdən ayrılmış gölün ortasında, sahildən o qədər də uzaq olmayan Farama ilə. Dumyatın arasında yerləşən adadır. Göllə dənizin arasında uzun torpaq sahəsi var. Bu - iki dəniz arasında olan adadır. sahənin başlanğıcı Faramanın yanındadır. Orada, Qərbas adlanan yerdə, bir boğaz var və böyük dənizin suyu buradan Tinnis gölünə daxil olur. (Su) böyük dənizlə Tinnis gölünün arasıyla keçib üç günlük məsafədə, təxminən Dumyata qədər axandan sonra orada ikinci boğazla rastlaşır. Su da böyük dənizdən Tinnis gölünə tökülür. Həmin ikinci boğazın yanında Tinnis gölünə Nil çayının suları tökülür. Gölün (uzunluğu) bir günlük (yola) qədərdir, eni də yarım günlük yoldur. Tinnis gölündə yüz otuzdan çox müxtəlif quş növü var. Burada yetmiş doqquz növ balıq var.

**(34) KƏNİSA ADASI -** Məqrib dənizində Əndəlus yaxınlığındadır. Orada bir dağda, qayanın içində qoyulmuş kilsə (kənisa) var. Üstündə böyük qübbə var, qübbənin də üstündə oturan, bir yerə uçmayan qarğa var. Kilsə ilə üzbəüz bir məscid var və

buraya gələn adamlar daim bu qarğanı kilsənin başında görürlər və heç başa düşə bilmirlər ki, qarğa yeməyini haradan tapır.

**(35) SİFAR** - Məsafəsi yeddi günlük yol olan, Fələstinlə Misirin arasında olan ərazidir. Başdan-başa səhralıq, qumluqdur. Orada kəndlər, zəmilər və çoxlu palma ağacları var. Əhalisi ayaq ləpirlərini torpaqda da müəyyən edə bilir.

**(36) CƏNNABA** - Fars dənizi sahilində yerləşən, pis havası və suyu olan şəhərcikdir. Orada nə zəmi var, nə də mal-qara çünki torpağı şorandır, suyu da şor.

Bəhreyndən çıxış edib xəlifə ordusunu darmadağın edən Əbülhəsən Qərməti Cənnabi[1] buralıdır. O, öz yatağında öldürülmüşdür. Sonra oğlu Süleyman[2] üsyan etdi, Allah evinə gedən züvvarları öldürdü. Kəbəni qarət edib, qara daşı yerindən çıxardı. Onun barəsində hekayət var.

**(37) CUR** - Farsda, (havası) sağlam olan şəhərdir. Çoxlu suyu, bağları və sarayları var. Mərkəzində Tirbal adlı hündür bina var. Onu Ərdəşir Babək[1] tikdirib. Orada Cur qızıl gülləri (bitir). Onların incə qoxusu zərbi-misal olub.

**(38) CİRUFT** - Uzunluq dairəsi - 98°05', en dairəsi - 27°30'-dir. Kermanda böyük, məskun, bərəkətli və bağ-bostanlı şəhərdir. Çoxlu xurması var. Əhalisi, ağaclardan külək vurub yerə salan meyvələri yığmayır ki, kasıblar yığsın.

**(39) CİZƏ** - Misirdə vilayətdir. Orada qum üstündə (fal açmaq üçün tilsim var. Bu bir sənəmdir. Onun arxasında Məqribə tərəf dəryaya oxşayır torpaqlar uzanır. Əgər kimsə [sənəmə] yaxınlaşarsa ona heç bir zərər dəymir.

Torpaqlar olan yerlərdə [vaxtilə] şəhərlər və kəndlər var idi. Sonra bunlar torpaq altında qaldı. Torpaq arasında mərmər sütunlar görünür, ancaq onlara yaxınlaşmaq qeyri-mümkündür. Yusifin fironunun şəhəri də [bu vilayətdə idi]. Onun böyük hissəsi torpaq altındadır. Yusifin, - ona salamlar olsun! - zindanı buradadır və firon qəsrinin divar qapısından o yandadır. Bu şəhər binalarının möhkəmliyi və gözəlliyi Musanın fironunun şəhərindən daha üstündür.

**(40) XƏLƏB** - uzunluq dairəsi - 72° 10' en dairəsi - 35º50'-dir. Şamda böyük, nemətləri bol, gözəl havası və münbit torpağı olan şəhərdir. Möhkəm divarları və alınmaz içqalası var. [İbrahim] Xəlil, - ona salamlar olsun! - burada qoyunlarını sağıb hər cümə günü südlərini paylayırdı. Allah Təala bu şəhərə böyük nemətlər

bəxş edib, buna görə burada pambıq, küncüt, darı, üzüm, ərik becərib quş saxlayırlar. Əkinləri yağış suyu ilə sulayırlar. [Şəhərin] qara daşdan tikilmiş divarları var. İçqalası divarlar arxasındadır, çünki şəhərin özü düzəndədir. İçqala dəyirmi və uçmuş dağın üstündədir. Onun su ilə doldurulmuş xəndəyi var.

Oralar Xəlilin, - ona salamlar olsun! - məskənidir və indi ə ziyarətgahdır. Kəndlərinin birində quyu var. Əgər quduz it tərəfindən dişlənilən kimsə onun suyundan içsə, itin özü satalar.

Möcüzələrindən biri bazardır (Orada olan çoxlu əcaib şeylər) və gözəl alətlərə görə insan üçün aralarından keçmək çox çətindir.

**(41) XİMS** - uzunluq dairəsi - 70º40', en dairəsi - 34º40'-dir. Şamda möhkəm bir şəhərdir. Şamda olan bütün şəhərlər arasında buranın havası ən sağlamdır. Torpaqlarının suyu və ağacları boldur. Oradakı əqrəblər və ilanlar demək olar ki, sancmır. Əgər paltarlar Ximsin suyunda yyuyulubsa, o zaman [həmin paltarı] geyən adamın yanına əqrəblər heç yaxınlaşmır, ta ki, paltarlarını dəyişməyib.

Möcüzələrdən biri kilsə yanında olan məscidin qapısı üzərində həkk edilmiş təsvirdir. Onun yuxarı hissəsi insan təsviri, aşağısı isə əqrəb təsviridir. Əhalisi gözəlliyi və kütlüyü ilə məşhurdur.

**(42) XİRA** - Kufənin yaxınlığında olan qədim şəhərcikdir. Qədim zamanlarda buralar dəniz idi, amma indi nə dənizin izi qalıb, nə də şəhərin. İndi buradan Dəclə çayı axır və keçmişdən qalan izlər qalıb. Xira - bənu Ləhm tayfasından olan ərəb padşahlarının iqamətgahı idi. Nüman ibn İmrulqeys ibn Əmr ibn Adi[1] Xiranın bayır tərəfində Xvarnaq adlı qəsr tikdirib. Onun altmış il ərzində Sinnimar adlı[*] bir Rumlu tikdirib.

**(43) XƏDR** - Tikritlə Səncərin arasında yerləşən və yonulmuş daşlardan tikilən şəhərdir. Onun divarlarında altmış böyük bürc, aralarında da doqquz kiçik bürc var idi. Hər bürcün qabağında bir qəsr var, hərəsinin yanında da bir hamam. Şəhərin yaxınlığında Sərsər adlı çay axır. Çayın hər iki sahilində bağlar var.

Şəhəri Şapur ibn Ərdəşir adından idarə edən Dəyzan ibn Müaviyə əl-Qudaa[1] tikdirib. O, şəhəri elə ovsunladı ki, onu yalnız erkək göyərçinin qanı və göy gözlü qadının aybaşı qanından istifadə

---

[*] Sinnin-mar, yəni “Cənab Sinnina”.

edib dağıtmaq olar. Sonra Dəyzan Şapur əleyhinə üsyan qaldırıb. Cəzirə ölkəsini zəbt etdi. Şapur ordusuyla ona qarşı çıxıb uzun müddət onu mühasirədə saxladı, lakin heç bir şey əldə etməyib qayıtmaq haqda fikirləşdi. Bu vaxt Dəyzanın qızı Nüseyrə dama çıxıb Şapuru gördü və ona vurulub şəhər üzərində qələbə çalmağın yolunu göstərdi. Şapur şəhərə daxil olub əhalisinin bir qismini qılıncdan keçirdi, bir qismini də əsir apardı. Bu barədə hekayət də var.

**(44) XUVEYZƏ** - Bəsrəylə Xuzistanın arasında, bataqlıqlar mərkəzində, çox pis yerdə olan vilayətdir. Onun torpağı narın qumla qarışığdır, səması tutqun, buludları sıx, samum küləyi məhvedici, suyu da zəhərlidir. Əyanları sadə xalqdır, sadə xalqı isə tör-töküntüdür.

(45) XƏLİL - Beyt əl-Müqəddəsin yaxınlığında içqalası və tikili yerləri olan şəhərciyin adıdır. Xəlilin, - ona salamlar olsun! - qəbri burada, yeraltı mağaradadır. Bu yerdə zəvvarlar süfrə açır. Bu, - çox sağlam və ürəyə yatan yerdir. Mağaraya enmək üçün yetmiş pilləkən var. Orada daşdan düzəlmiş meydança [var] və Xəlilin [tabutu] onun üstündədir. İshaqın və Yaqubun, - onlara salamlar olsun! - [tabutları] onun yanındadır. Mağara divarının arasında saranın, - Allah ondan razı olsun - [tabutu] durur.

**(46) DARABCİRD** - Farsda nadir bir vilayətdir. Onu Darab ibn Fars məskun etdirib. Orada mumyası olan bir mağara var, lakin deyirlər ki, mağara Arrasandadır. [Vilayətin] bir dağında ağ, yaşıl və qırmızı duz var. [Vilayətdə həmçinin] civə mədəni var.

**(47) DƏMƏŞQ** - Uzunluq dairəsi - 70°05', en dairəsi - 33°20'-dir. Şamın paytaxtıdır. Bura - Yer üzünün cənnətidir, o qədər təravətli göyərtisi, gözəl zəmiləri, sağlam yerləri, geniş çölləri, bol suları və ağacları və ucuz meyvələri var! Əbu Bəkr Xarəzmi[1] deyib: «Yer üzündə dörd cənnət var - Dəməşqin Ğutası,[2] Səmərqəndin Soğdu, Bəvvanın Şibi və Bəsrənin Ubullası. Lakin bunlardan ən gözəli Dəməşqin Ğutasıdır».

[Şəhərin] əcaib yerlərindən - gözəlliyin kamilliyi və möcüzələrin yığını olan cümə məscididir. Onun döşəməsi mərmərdəndir və lövhələri bir-birinə uyğun və nizamla döşənib. Onu bəzəyən daşların hamısı bir boydadır. Çox müntəzəm düzəldilib. Müxtəlif heyvan, meyvə və bitkilərin təsvirləri onlara baxanlara zövq verir.

Məscidi Valid ibn Əbdülməlik tikdirib. O daim məscidlərin tikilməsinin və qurulmasının qayğısına qalırdı. [Bu məscidin] tikilməsinə dövlətin yeddi illik xəracını xərcləmişdi. Onun yanına on səkkiz dəvə yükü təşkil edən məxaric qeydləri olan dəftərləri gətirəndə, Valid heç onlara baxmadan və əmr etdi ki, bunları rədd etsinlər. O deli: «Bütün bunları biz Allah yolunda xərcləmişik və buna görə də gəlin bunun üçün heyfslənməyək».

Deyirlər ki, [məscidin] möcüzələrindən biri də odur ki, əgər kimsə yüz il yaşayıb hər gün bu məscidə tamaşa etsəydi, o, hər gün qabaqlar görmədiyi yeni-yeni gözəl bəzəklər və əcaib şeylər görə bilərdi.

Şəhərin özü çox böyük, möhkəmlənmiş, divarlarla əhatə edilmiş və xəndəklənmişdir. İçqalası var və ətrafı da başdan-başa evlərdir. Evləri bağlar içindədir. Burada elə bir ev, karvansaray, məscid və ya mədrəsə yoxdur ki, yanından su axmasın.

Dəməşqdən bir fərsah aralı Rəbva dağı var. [Quranın] təfsirçiləri təkid edirlər ki, həmin dağın adı Allahın, - qoy o, uca və şöhrətli olsun! - kəlamında çəkilir: «Onları abad (rahat) və axar sulu uca bir yerdə yerləşdirdik».*

Fərasəti haqqında zərbi-misal deyilən İyas ibn Müaviyə[3] buradandır.

**(48) DƏMİNDAN -** Kermanda böyük bir şəhərdir. Orada, yüksək bir dağda qızıl, gümüş, dəmir, mis, naşatır və sink mədənləri var.

**(49) DUMYAT -** Uzunluq dairəsi - 65°05', en dairəsi - 31º30'-dir. Tinnislə Misirin arasında yerləşən qədim şəhərdir. Xoş havası ilə fərqlənir. İslam [ölkəsinin] sərhədyanı şəhərlərindəndir. Nil çayının suları dənizə burada tökülür. Bu yerdə, Nilin eni yüz dirsəyə qədərdir. Hər iki tərəfində bir bürcü var və arxlarında dəmir zəngir asılıb. Üstündə də zəngi var. Gəmilər buraya yalnız icazə ilə girib çıxa bilər. Şəhər divarının yanında mədrəsələr və karvansaraylar var ( Oranın əhalisinin əsas yeməyi təzə və şor balıqdır.

**(50) DANDARA -** Yuxarı Misir vilayətinin birində, Nil çayının qərb sahilində yerləşən gözəl bir şəhərcikdir. Orada çoxlu axar sular, ağaclar, xurmalar, üzümlüklər və qədim məbədlər var. Birba məbədi elə bir binadır ki, içində sirrli və cadulu tilsimlər var.

---

* Quran, 23, 50.

**(51) DAVRAQİSTAN -** [Ölçüsü] beş fərsah beş fərsaha olan Fars dənizi ilə Əskər Mükrəm çayının arasındakı adadır. Hind tərəfindən gələn gəmilər burada lövbər salırlar, çünki ayrı yolları yoxdur. Suyun artması və çəkilməsi hər gün burada iki dəfə olur.

**(52) DEYR ƏTRİBƏ -** Misirdə bir monastırdır. Marut** Məryəm adı ilə də tanınır. Onun bayram günü avqustun iyirmi beşindədir. Deyirlər ki, həmin gün buraya göyərçin uçub gəlir və səcdəgahın üstünə qonur. Amma heç kəs bilmir ki, göyərçin haradan gəlir.

**(53) DEYR ƏYYUB -** Dəməşqin bir dairəsində məskun məntəqədir. Əyyub peyğəmbərin, - ona salamlar olsun! - qaldığı yer buradır. [Allah Təala] onu burada sınayırdı. Orada Əyyub ayağını vurduğu yerdə bulaq var.

**(54) DEYR SİMAN -** Bu da Dəməşqin bir dairəsinin sağlam nahiyəsindəndir. Ətrafında bağlar, evlər və saraylar var. Orada insanlardan uzaqlaşmış məşhur zahid yaşayır. İldə bir dəfə, müəyyən olunmuş gündə o, başını pəncərədən çıxarır və əgər onun gözü uzun çəkən naxoşluğa düçar olmuş adama sataşsa, bu adam dərhal sağalır.

**(55) DEYR TUR SİNA -** Sina dağının başında [yerləşir]. Bu, həmim dağdır ki, Musanın, - ona salamlar olsun" - qabağında nur saçdı və o, huşunu itirib yerə yıxıldı. Bu monastır qara daşlardan tikilib.

**(56) DEYR ƏT-TƏYR -** Misirdə, Nil çayının sahilində, Kəhf* dağının yaxınlığında [yerləşir]. Bu dağda bir yarğan var və bu monastırın bayramı gələndə buraya Bukir adlı quşlar gəlirlər. Onlar həmin yarğanın yanına gəlib qışqırtı salırlar.

**(57) DEYR NƏHYA -** Misirdə, Cizadadır. Yerinə görə monastırlar arasında ən görkəmli, ən sağlam, ən gözəl ən şöhrətlisidir. Çoxlu rahibi var. Buradan Nil çayına gözəl mənzərə açılır. Monastırı hər tərəfdən su əhatə edir. Monastırın yanındakı körfəzə quşlar uçub gəlir və buralar yaxşı ov yeridir.

(58) DEYR XİZQİL - Bəsrəylə Əskər Mükramın arasındadır. Monastıra Xizqilin, - ona salamlar olsun! - adı verilib.

** “Sığınaq”.
* “Mağara”.

Bu, həmin yerdir ki, buraya ölümdən qorxan Davardanın minlərcə sakini ölkələrini tərk edib gəliblər.

**(59) DEYR ƏL-QƏYYƏRA** -Mavsil yaxınlığında, Dəclə çayının qərb sahilinin üstündədir. Onun altında suyu Dəcləyə tökülən isti su bulağı var. Su ilə birlikdə qətran çıxır. Nə qədər ki, qətran sudadır o, yumşaq olur, elə ki, sudan ayrıldı, donub bərkiyir. Bu qətrandan çoxlu qır hasil edilir, bunu da başqa ölkələrə aparırlar.

**(60) DƏVRAQ** - Xuzistanda gözəl bir şəhərcikdir. Orada çoxlu hamam var və bura şikəstlərin gəldiyi yerdir. Burada dağdan isti bulaqlar axır. Bəzən onlardan tüstülü alov çıxır və alov şölələri qırmızı yaşıl və sarı olur. Bu [bulaqların suyu] iki hovuzda yığılır. Bir hovuzun suyu kişilər üçündür, ikincinin suyu - qadınlar üçün.

**(61) RÜSAFƏ** - Raqqanın yaxınlığında səhrada yerləşən şəhərdir. Yonulmuş daşlardan tikilmiş möhkəm divarları var. Şəhəri Hişam ibn Əbdülməlik[1] tikdirmişdir. Orada nə bulaq var, nə də çay. Quyuları çox dərindir: dərinlikləri yüz iyirmi dirsəyə çatır. Bu quyuların suyu şordur. İçmək üçün suyu əhali şəhərin içindəki çənlərdən alırlar. İlin axırı üçün çənlər boşalır və bundan sonra əhali suyu Fərat çayından daşıyır. [Şəhərlə çayın] arası dörd fərsahdır.

**(62) RAQQADA** - İfriqiyada gözəl şəhərcikdir. Qayruvanın yaxınlığındadır. İfriqiyyədə bunun kimi mülayim havalı-nəsim küləkli və münbit torpaqlı yer yoxdur. Buraya gələn hər kəs səbəbini bilmədən daim sevinir.

**(63) ZUKANDƏR** - Qərbdə, bərbərlər ölkəsində şəhərdir. Onunla Mərakeşin arasında altı mərhələlik yol var. Divarı və çoxlu meyvəsi var. Əhalisi müsəlman bərbərlərdən ibarətdir. Orada olan gümüş mədənləri hamınındır: kim istəsə özü üçün gümüş axatara bilər.

**(64) SABUR** - Farsda şəhərdir. Onu Ərdəşir oğlu Şapur bina etdirib. Buraya daxil olan daim ətir iyini hiss edir - o qədər burada reyhan, gül-çiçək və ağac vr!

Əbu Abdullah Səburi[1] buradandır. O, Allah Təalanın müqəddəs məxluqlarından idi.

**(65) SABTA** - Məşhur şəhərdir. Məqrib ölkəsinin mərkəzlərindən olub, bərbərlər torpağında, dəniz sahilində yerləşir. Şəhər dənizin içinə girib. Orada bir qaya var ki, ona qədər Musa, - ona salamlar olsun! - və onun şagirdi Yuşu gəlib çatmışlar. Hər ikisi

yarısını yeyib qurtardıqları qızdırılmış balığı[*] yaddan çıxartdılar. Allah Təala da öz möcüzəli qüdrəti ilə balığın qalan yarısını dirildib dənizə buraxdı. Bu balığın uzunluğu bir dirsəkdən çox, eni də bir qarış idi. Onun bir gözü və başının yarısı var idi.

Bir tərəfi ətli idi, ikinci tərəfi isə sür-sümük. Balığın içi pərdə ilə örtülmüşdü. İnsanlar bu balığı tutur, onun vasitəsiz bərəkət gözləyirlər və ya onu hörmətə layiq olan adamlara bağışlayırlar.

**(66) SABAT -** Xosrov (Ənuşiravanın) Mədainin yaxınlığında bir şəhərciyi idi. Onun əsl adı Balaşabaddır, yəni farsların şahı olan Balaşın[1] tikintisidir. Sonra ərəblər bu adı ərəbləşdirdilər.

Burada adamlardan borsuna qan alan bir dəllək yaşayırdı. Əgər yanına müştəri gəlmirdisə o, adamlar onu vecsiz hesab etməsin deyə, öz anasının qanını alırdı. Anasının qanını o elənə qədər alırdı.

Burada Həsən ibn Əli[2] - ona salamlar olsun! - ombasından yaralanmışdı. Onu sağalana qədər müalicə etdilər.

**(67) SAMİRƏ -** Bağdadla Tikritin arasında, Dəclə çayının şərq sahilində yerləşən nəhəng bir şəhər idi. Onu hicri 281 (835-836)-ci ildə əl-Mötəsimbillah[1] tikdirib. Şəhərdəki məscidin tikilməsinə beş yüz min dinar xərcləyib. Onun divarlarının üstünə mina vurub.[2] O, [şəhərin] möcüzələrindən olan minarə tikdirib. Sonra İshaqi,[3] şahzadələr və əmirlər şəhərə gələrək evlər və saraylar tikdilər. Xəlifələr də burada əcaib saraylar tikdirdilər. Xəlifə əl-Mütəvəkkil[4] isə Dəclə çayından iki, qış və yay arxı ayırıb, bunları Cümə məscidi tərəfə çəkirdi və həmin arxlar şəhər küçələrindən də keçir. Bu məsciddə məşhur zirzəmi var ki, şiələrin təkidinə görə buradan onların Mehdisi çıxacaq. Onlar elə hesab edirlər ki, Məhəmməd ibn əl-Həsən[5] bu zirzəmiyə daxil olub.

Dövlət içərisində hərc-mərclik başlanan kimi [şəhər] yavaş-yavaş tənəzzülə uğradı. Belə vəziyyət əl-Mətədidbillahın[6] zamanına qədər davam etdi və o, Samirəni həmişəlik tərk edib Bağdada köçdü. Samirədən isə Kərx Samirə və Məşhəd adlı yerlər qaldı. Şəhərin qalan hissələri xarabalıqdır.

**(68) SİCİSTAN -** Böyük və geniş vilayətdir. Onu Fars oğlu Sicistanın adı ilə bağlayırlar. Onun torpaqları qumsal və şorandır. Burada küləklər daim əsir və buna görə də əhalisi yel dəyirmanlarını tikiblər. Bu - çox isti ölkədir. Küləyin gücü ilə

[*] Müqayisə et: Quran, 18, 61 və sonrakılar.

qumluqlar tez-tez yerlərini dəyişir və əgər [əhalinin] məharəti olmasaydı [qumlar] şəhər və kəndləri çoxdan məhv edərdilər. Onlar çoxdu xurma ağacları və axan çaylar var. Vilayətdə çoxlu ilan var. İlanların sayı kirpi və tısbağalardan çoxdur.

Misli görünməmiş şücaət və at sürməkdə ustalıq göstərən qüdrətli Rüstəm buradandır. Onun bacarığından Firdovsi və «Şahnamə»sində belə deyib:

Dünyanın Xaliqi dünyanı xəlq edəndən,
Rüstəmə bənzər çapar gəlməyib!

**(69) SƏDUM** - Hicazla Şamın arasında yerləşən Lut xalqının baş şəhəridir. Vaxtilə şəhər Allahın ən gözəl, suyu, ağacları bol olan şəhərlərindən idi. İndi (bura toz-torpaqdır. Buranı «tərsinə torpaq» adlandırırlar: burada nə əkin, nə mal-qara var, nə da ot bitir. Buralar daşlı qara torpağa döndü. Deyirlər, bu həmin daşlardır ki, [əhalinin] başlarına tökülürdü.

**(70) SİRCAN** - Uzunluq dairəsi - 90°05', en dairəsi - 29°05'-dir. Kerman vilayətinin baş şəhəridir. Yaxşı şəhərdir, elmlərin və saf adətlərin mərkəzidir. Bağları və suyu çoxdur. Şirazdan daha gözəl və daha genişdir. Bunların arasında üç mərhələlik yol var. Suyu şirin, havası safdır.

Burada [bütün islam] ölkələrində bənzərləri olmayan Əzudəddövlənin[1] evləri [durur].

Əmr ibn əl-Leys əs-Səffar[2] burada iki kanal qazdırıb və bunların suyu şəhərin küçələri ilə axıb əhalinin evlərinə gəlir. Buranın əla şəkəri, şəkər qamışı və xurmaları var.

**(71) SKRAF** - Uzunluq dairəsi - 88°05', en dairəsi - 29°05'-dir. Fars dənizinin yanında olan məşhur şəhərdir. Ürəyə yatan yerdir. Baqları və dağlardan axan suları bol olan şəhərdir.

İyirmi cildlik Kitab Sibaveyhinin şərhçisi Əbülhəsən Sirafi[1] buradandır. Onun zamanında tayı-bərabəri yox idi.

**(72) ŞAM** - Fərat çayından əl-Ərişə qədər uzanan [ölkədir]. Eni Tayy dağından Rum dənizinə qədərdir. Bu - müqəddəs torpaqdır. Allah onu peyğəmbərlər yurduna və vəhyin nüzul olunan yerinə çevirib. Havası xoş, suyu şirindir. Zahiri görünüşünə, xasiyyətinə, paltarına və gözəlliyinə görə, əhalisi ən yaxşı məxluqlardandır.

Oranın meyvələri ən yaxşı növlərdəndir. Şamın admalarını vaxtilə İraqa, xəlifələrə göndərirdilər. Şamda hazırlanan təkər yağı da çox təmiz idi.

Şamın əhalisini kobud və az fərasətli hesab edirlər.

Orada, Xələb vilayətində, Summaq dağı var. Ətrafı şəhər və kəndlərdir. Buranın havası xoş və sağlamdır. Çoxlu sumaxı var.

Mədyana yaxın, amma deyirlər ki, Əylaya yaxın, Şamla Vadi əl-Quranın arasında Sina dağı yerləşir. Beyt əl-Müqəddəsdən cənub tərəfə Harun dağı var. Bu, həmin dağdır ki, Harun orada yatıb və yuxulayan kimi ölüb.

Orada Xims tərəfə uzanan Lubnan dağları var. Burlarda bitən meyvə və taxıl başqa yerlərdə becərilmir. Burada mömin adamlar özlərinə yurd axtarırlar və Allahın buraya verdiyi ruzusuna görə möminlərin sayı həmişə çoxdur.

Burada Zəhəb («Qızıl») çayı axır. Xələbin camaatı deyir ki, bu - Vadi Bəttandır.

**(73) ŞİB BƏVVAN** - Fars vilayətində, Ərrəcanla Növbəndcanın arasındadır. Dünyanın ən gözəl güşələrindəndir, gözəlliyi, təravəti təmiz havası, ağacların və budaqların çoxluğu və quşların müxtəlifliyinə görə çox məşhurdur. Sahəsi iyirmi altı fərsahdır. Buranı başqa yerlərdən fərqləndirən də odur ki, meyvə ağacları qayalar üzərində də bitirlər.

**(74) ŞİRAZ** - Uzunluq dairəsi - 88°05' en dairəsi - 29°36'-dir. Sağlam havası, şirin suyu, bol neməti və məhsulu olan şəhərdir. Bu - Fars ölkəsinin qəsəbəsindədir, adı da ona Təhmuras oğlu Şiraz verib. Onu Sultanəddövlə[1] möhkəmlədib. Burada bir il müddətində yaşayan üçün həyat çox gözəl görünür. Orada almanın elə növü var ki, yarısı şirin, yarısı turşdur. Reyhandan burada cürbəcür yağlar və içkilər hazırlayırlar. Əhalisi ipək parçasını, fəxri geyimlərin, bıçaqların və qıfilların hazırlanmasında mahirdir. Burada Mütənnəbbi[2] haqqında danışdığı Dəşti Ərzan var: «Hündür Ərzən bitən çölün suyu...» Bu çöl Əzudəddövlənin ovlağı idi.

Şafei, - Allah ondan razı olsun! - məzhəbinin müctəhidlərindən biri Əbülabbas Əhməd ibn əl-Süreyc[3] buralıdır. Onun yazdığı əsərlərin sayı dörd yüzdən çoxdur.

Zəmanəsinin şeyxi və dövrünün görkəmlisi Əbu Abdullah Məhəmməd ibn Xəfif[4] də buradandır. Yaşadığı dövrdə elmlərdə tayı-bərabəri olmayan bilgin ustad Qütbəddin Mahmud ibn

Məsud Şirazi[5] də buradandır. O, hicri 716 (?)-cı ilin ramazan ayında (17. XI . XII. 1316) Təbrizdə vəfat edib.

**(75) SƏİD** - Misirdə, Fustatdan cənubda, aralarından Nil çayı axan iki dağın əhatəsində olan vilayətdir. Nil çayının hər iki sahili boyu şəhərlər və kəndlər yerləşir. Nil çayı bir qədr Vasitlə Bəsrənin arasında axan Fərat çayına bənzəyir. Orada qədim abidələr var. Məsələn, dağlarda ölmüş insanlar, quşlar pişiklər və itlərlə dolu mağaralar var. Bu meyitlərin hamısı qalın kətan kəfənlərə sarınıb. Kəfənlər, uşaq bələyi kimi meyiti sarıyır. Çürüməsin deyə müxtəlif ədviyyatlar sürtüblər.

**(76) SİFFİN** - Rəqqanın yaxınlığında, Fərat çayının qərb sahilində, bizanslılar tərəfindən tikilmiş qədim kəndlərdəndir. Onun yanında toxumları aşpazlıqda işlənən ağaclardan ibarət olan qalın keçilməz meşə var. Meşənin uzunluğu iki fərsaha qədərdir. Bu iki fərsahlıq məsafədə çaya aparan cığır da yoxdur. Yalnız bir, daşla döşənmiş yol var. Hər tərəf keçilməz əzab ağacları və söyüdlükdür. Burada Əli - ona salmalar olsun! - ilə Müaviyənin, - Allah hər ikisindən razı olsun! - arasında döyüşlər olub. Doxsan döyüş olub. Onlar Siffinin yanında yüz on gün qalıblar.

**(77) SİCİLİYA** - Uzunluq dairəsi -65°05', en dairəsi - 37°10'-dir. İfriqiyyə ilə üzbəüz olan Məqrib adalarından olan böyük adadır. O, üçbucaqlıdır və hər bucağın arasında yeddi günlük yol var. Adada çoxlu şəhər və kənd var, həddindən artıq heyvanı, o cümlədən atları, qətirləri, eşşəkləri, inəkləri, qoyunları və vəhşi heyvanları vardır. Orada qızıl, gümüş, dəmir, qurğuşun, mis, civə, naşatır, sürmə və kuporos mədənləri var. Suyu, ağacları və meyvələri boldur. Zəmiləri ildə iki dəfə məhsul verir - yayda və qışda. Buranın torpaqlarında zəfəran əkirlər.

Orada böyük bir dağ var. Üzərində böyük şəhər yerləşir, ətrafı da bağ-bostandır. Orada dairəsi üç günlük yol olan, dəniz üzərində yüksələn və od püskürən dağ var. Onun zirvəsində od püskürən dəliklər var. Orada böyük vulkan var.* Dünyada ona bənzər və onun kimi odpüskürən vulkan yoxdur. Külək əsən kimi oradan göy gurultusuna bənzər gurultu gəlir. Bu vulkandan əla kükürd əmələ gəlir.

**(78) SUR** - uzunluq dairəsi - 68°30', en dairəsi - 32°40'-dir. Şam dənizinin sahilində məşhur şəhərdir. Şəhərin divarları əcaib

---

* Söhbət Etna vulkanından gedir.

şəkildə onun limanını əhatə edir. Orada bir gözlü körpü var və bu da dünyanın möcüzələrindəndir. Dünyada bunun kimi böyük körpü yoxdur. Buna oxşar körpü Əndəlüsdə, Tuleytulada var, lakin Surun körpüsündən kiçikdir.

**(79) TƏBƏRİYƏ** - uzunluq dairəsi - 68°15', en dairəsi - 32°05'-dir. Dəməşqin yanında olan şəhərdir. Aralarında üç günlük [yol var]. Onun bir tərəfi göl, digər tərəfində isə yüksələn Tur adlı dağdır. Şəhərdən dənizə qədər təxminən bir fərsahlıq yol var. Şəhəri Tiberi adlı Roma imperatorlarından biri tikdirib. Orada isti axar sular var ki, bunların da üstündə kezəl hamamlar tikilib.

Orada sahəsi on mil olan göl var. Bu göl dağlarla əhatə olunmuş nohura bənzəyir. Buraya çayın suları ilə tullantılar tökülür. Orada mirvari tapırlar. Gölün ortasında bir qayanın üstündə ikinci yonulmuş qaya var. İddia edirlər ki, bu Süleymanın, - ona salamlar olsun! - qəbridir. Müdrik Loğmanın qəbri isə Təbəriyədədir. Orada böyük bir çay axır; Suyunun yarısı isti, yarısı isə - soyuqdur.

Məşhur imamlardan olan Süleyman ibn Əhməd ibn Yusif Təbərani[2] buralıdır. Onun əsərlərindən biri - əl-Möcəm əl-kəbir fi əsma əssəhabadır. O, - Allah Təala ona rəhmət etsin! - Hicri 360* (971)-cı ildə yüz yaşında vəfat edib.

**(80) TİB** - Vasitəsilə Xuzistanın arasında yerləşən və Adəm oğlu Sitin, -ona salamlar olsun! - bina etdiyi şəhərcikdir. Orada əqrəb və ilanları qovduran tilsim var. Onun möcüzələrindən biri də odur ki, buraya heç vaxt eşşəkarısı uçub gələ bilməz və əgər gəlsə, elə o an ölər. Xallı qarğa da buraya uçub gəlməz.

**(81) ƏRİŞ** - Misir vilayətlərinin birində gözəl şəhərdir. Havası sağlam, suyu dadlıdır. Deyilənə görə, Yusifin, - ona salamlar olsun! - qardaşları quraqlıq vaxtı ərzaq üçün Misirə gedəndə, Ərişə gəlib orada qaldılar. Yusifin isə ölkə ucqarlarında hər yerdə qarovul dəstələri var idi. Qarovul rəisi ona yazdı ki, Kənanlı Yaqubun övladları ölkələrində quraqlıq olduğuna görə Misirə gəlmək istəyirlər. Onlar burada çadır qurub kölgəsində oturublar. (Elə buna görə də bu yerin adını Əriş* qoyublar). Yusif də onlara yazıb Misirə gəlməyə icazə verdi. Onlar da gəldilər.

---

* Əlyazmada - 665 - dir.
* “Çadır”.

Orada çoxlu vəhşi və ətləri yeməli quşlar var və bunları ovlayırlar. Ərişin narı elə dadlıdır ki, onları başqa ölkələrə də aparırlar.

Əlinini silahdaşı olan Əştər ən - Nuxai,[1] - Allah onların hər ikisindən razı olsun! - burada vəfat edib.

**(82) ƏSQƏLUN** - Şam dənizinin sahilində, Fələstinin bir dairəsində olan şəhərdir. Gözəlliyinə görə ona Ərus əş-Şam[**] deyirlər. Şəhər Ömər ibn əl-Xəttabın vaxtında Müaviyə tərəfindən, - Allah hər ikisindən razı olsun! - fəth olunmuşdu.

Hüseynin,[1] - Allah ondan razı olsun! - başı burada dəfn olunmuşdur. Bu - çox qiyamət bir sərdabədir, mərmər sütunlar üzərində tikilib. Başın qəbri isə içərisindədir. Buraya hər yerdən zəvvar gəlir.

**(83) EYN ƏŞ-ŞƏMS** - Misirdə Nil çayının qarb sahilində yerləşən şəhərdir. Musanın fironunun taxtı burada idi. İndi fironun bütün sakinləri torpağa qərq olub. Şəhər Fustata yaxındır. Deyilənə görə Yusifin köynəyini Züleyxa burada yırtıb.

Onun möcüzələrindən biri budur ki, burada yerin üstündə bünövrəsiz iki sütun qurulub. Hərəsinin uzunluğu əlli dirsəkdir. Hər ikisinin üzərində heyvana minmiş insan şəkli həkk olunub. İnsanın başında misdən düzəldilmiş iki bürcə bənzər şey var. Nilin suları axanda iki təsvirdən şeh saçır və su damcılayır.

Orada balzam ağacı bitir. Dünyada bundan başqa ağac yoxdur ki, ondan [balzam] yağı götürsünlər. Burada Davud oğlu Süleymanın, - ona salamlar olsun! - cinlərin qoyduğu heykəllər var.

(84) ANA - uzunluq dairəsi - 73°30', en dairəsi - 34°05'-dir. Hitlə Rəqqanın arasındadır. Ətrafını Fərat çayının suları körfəzə döndərib. Çox möhkəm qaları var. Bu - Fəratın ortasında bir adadır. Onun malikanələrində çoxlu meyvə ağacları və üzümlüklər var. Üzümün bolluğundan onlar şərabçılıqla məşğuldurlar.

**(85) ABBADAN** - Uzunluq dairəsi - 84°30", en dairəsi - 29°20'-dir. Bəsrənin altında, şor dənizin yaxınlığında bir adadır. Dəclə çayı dənizə yaxınlığında iki qola ayrılır: bir qolu Bəhreynə tərəf uzanır, bu sağ [qoldur], sol qolu isə Abbadana tərəf uzanır. Həmin üçbucaq şəklində olan bu adada Siraf, Cannaba və Abbadan yerləşir. Orada nə əkin yerləri var, nə də mal-qara. Onun əhalisi

---

[**] "Şamın gəlini".

Allah Təalaya ümid bağlayanlardandır. Buraya ərzaq dünyanın müxtəlif yerlərindən gəlir.

Orada məşhədlər, və xanəgahlar var. Buranın əhalisi dünyəvi işlərdən əl çəkib Allaha xidmət edirlər. Onların ruzuları əsasən vədlərinin hesabındadır.

**(86) İRAQ** - Mavsildən Abbadana qədər və Qadisiyyədən Xulvana qədər eni olan məşhur nahiyədir. Allahın ən mötədil iqlimi olan ərazisidir, ən münbit torpağı və ən dadlı suyu var. Yer iqlimlərinin hamailində İraq ən böyük incidir. Əhalisi gümrah, ağıllı və sağlam düşüncəlidir. Onlar hər bir sənətdə mahirdirlər. Canları hiyləgərliklə doludur və onlar qəriblərə qarşı nifrət bəsləyirlər. İraq əhlini nəbati adlandırırlar, Nəbat isə Süleymanın, - ona salamlar olsun! - vaxtında yaşayan mərdiməzar adamın adıdır.

Orada Dəclə çayı [axır]. Bu çayın başlanğıcı Amid yaxınlığındakı dağlarda, Zülqərieyn adı ilə məşhur olan qalanın yanındadır. Çayın suları oradan axır və sonra ona Diyarbəkir dağlarından axan sular tökülür, sonra çay Məyafəriqin tərəfə axır, sonra da Cəzirət ibn Ömər, Mavsil və Tikrit tərəfə axır. Amma buraya qədər Dəcləyə iki Zabın suları tökülür və buna görə Dəclə böyüyür. Sonra Bağdad, Vasit, Bəsrə və Abbadan tərəfə axır və nəhayət dənizə tökülür.

Orada Ermənİyyədə başlanğıcı olan Fəyrat çayı da axır. O, Qaliqalanın yanından keçir, oradakı dağların yanından dolanır və Ruma daxil olur. Sonra Malatiya daha sonra Sümeysat tərəfə axır, sonra Raqqanı, Ananı və Hiti keçib suyu bol olan çaya dönüb, sularını Savadın zəmilərinə verir. Suvarmadan qalan su Dəcləyə tökülür: bir hissəsi Vasitdən yuxarıda, qalanı da - Vasitlə Bəsrənin arasında. Bundan sonra hər iki çayın suları birləşir və Fars dənizinə tökülür.

Hüseyn öldürülən gündə, hicri 60-cı ilin aşurasında (22. X. 679) anadan olan və 148 (765)-ci ildə» vəfat edən Əbu Məhəmməd Süleyman ibn Mihran əl-Əmaş[1] və sari əs-Səqatini[2] müşayiət edən Əbülhüseyn-Səmnun ibn Həmzə buralıdır. Əbülhüseyn Allah Təalanın övliyalarından idi.

**(87) ĞƏZNƏ** - uzunluq dairəsi - 104°20', en dairəsi - 33°35'-dir. Xorasanın kənarında onunla Hindin arasında yerləşən geniş vilayətdir. Sağlam iqlimi, şirin suyu və münbit torpağı ilə fərqlənir. Bu, çox bərəkətli dağlıq [vilayətdir]. Lakin orada bərk

soyuqlar olur. Onun, möcüzələrindən məşhur dağ aşırımıdır: yuxarısına qalxan bərk istidən yerə yıxılıb huşunu itirir. Bəri tərəfində isə soyuqdur.

Ğəznənin xüsusiyyətlərindən biri də odur ki, burada insanlar çox yaşayır və xəstəliklər də azdır. Bu, qızıl əmələ gələn və ilanı, əqrəbi və zərərli həşəratı olmayan torpağa bir bax! Əhalisi dözümlü və xeyirxahdır.

Məcdud ibn Adəm əs-Sənai[1] buralıdır. O, müdrik alim və zahid bir adam idi.

**(88) ĞAZA -** Şamla Misirin arasında olan gözəl şəhərdir. Şəhər Ömər ibn əl-Xəttabın vaxtında Müaviyə ibn Əbusufyan tərəfindən fəth olunub. Bura imam Əbu Abdullah ibn İdris əş-Şafeinin! - Allah ondan razı olsun! – vətənidir. O, burada hicri 150[*]" (767)-ci ildə anadan olub və 204[**] (820)-ci ildə Misirdə əlli dörd yaşında vəfat edib.

**(89) ĞUTA -** Mərkəzi Dəməşq şəhəri olan vilayətdir. Suyu bol, ağacları çox, çiçəkli, qalın cəngəlli, on səkkiz mil uzunluğu olan və buranı əhatə edən bağları var. Bütün vilayət bağ içindədir və çoxlu sarayları var. Buralar yüksək dağlar arasındadır. Suları da bu dağlardan axır. Çayların suları buraya axır və artıq sular oradakı cəngəlliyə tökülür. Bura Allahın ən təmiz və ən sağlam ölkəsidir.

**(90) FARS -** Şərqdə Kermanla, qərbdə Xuzistanla, şimalda Xorasan səhrası ilə, cənubda isə dənizlə həmsərhəd olan məşhur vilayətdir. Adını Nuh, - ona salamlar olsun! - oğlu Samın oğlu Aşurun oğlu Farsın adından götürüblər. Burada İstəhr kimi yerlər var ki, orada şiddətli şaxtaya görə meyvələr yetişmir və Lahuristan kimi yerlər var ki, bərk istiyə görə quşlar belə yaşamır. Əhalisinə gəldikdə, özləri deyirlər ki, onlar İranşəhr adlanan və Bəlxdən Azərbaycan və Erməniyyəyə qədər uzanan yerlərdə yaşayırlar. Əhalisi ağıl sahibi, sağlam fikirli və davamlıdır.

Deyilənə görə, farslar dünyanı dörd min il idarə ediblər. Şahlarının birincisi Kəyumərs, axırıncısı da Şəhriyar oğlu Yəzdəgird[1] idi. Onlar ölkəni abad edib bəndələrinə bolluq gətirdilər. Onların yaxşı işləri ərəblərin və ərəb olmayanların kitablarında qeyd edilib. Heç kəsdən gizli deyil ki, qədim böyük şəhərləri bunlar saldırıb və bu şəhərlərin çoxu onların adlarını daşıyır.

---

[*] Əlyazmada səhvən 155 - ci ildir.
[**] Əlyazmada səhvən 240 - cı ildir.

Qeyd edirlər ki, onlardan on nəfərin tayı - bərabəri olmayıb.

Onlardan birincisi - Cəmşid oğlu Keyqubadın oğlu Əfridundur.[2] Zöhhak Bəyvarasbın[3] qəzəbinə görə yer üzü istibdad və qəddarlıqla dolandan sonra o, bütün dünyada padşahlıq edib, yer üzünü ədalət və yaxşılıqla doldurdu. Nəsillər tarixi ilə məşğul olan bəzi alimlər hesab edirlər ki, həmin Əfridun, Allah Təala əziz Kitabında adını çəkdiyi Zülqərneyndir,[4] çünki o, Şərqə və Qərbə hakim olub Allah Təalaya ibadət etməyi əmr etmişdi.

Onlardan ikincisi - Bəhmən oğlu Daranın oğlu İskəndərdir. O, böyük və müdrik padşah olub bütün elmləri dərk etmiş, seçkinlərin elmindən xəbərdar idi. O, Aristotelin şagirdi idi və onu özünə vəzir təyin edib işlərini onun məsləhətləri ilə görürdü. Rumun, Çinin, türklərin və Hindin padşahları ona tabe idilər.

Onlardan üçüncüsü - Firuz oğlu Qubadın oğlu Ənuşiravan[5] idi. Onun çoxsaylı qoşunu var idi, - dövlətlinin əzəməti yüksək olub və Rumun, Çinin, Hindin və xəzərlərin padşahları ondan qorxurdular.

Onlardan dördüncüsü - Yəzdəgird oğlu Bəhramdır. Bəhram Gur adı ilə tanınır. Ox atanlar içərisində o, hamıdan mahir idi. Onun vaxtında ona oxşar yox idi.

Onlardan beşincisi - Zal oğlu Rüstəm əş-Şədid (“Qüdrətli”) idi.[7] Deyirlər ki, onun kimi at sürən olmayıb.

Onlardan altıncısı - Münəccim Caməsbdir. Löhrəsb oğlu Güştəsbin vəziri olub. O, ulduzların yaxınlaşmasına əsaslanaraq qərar çıxarır və olacaq hadisələrdən xəbər verirdi. Məsələn, peyğəmbərlərin zühurundan, məcuslar dininin yox olmasından və türklərin gəlməsindən.

Onlardan yeddincisi - İran şahlarının vəziri Buxtaqan oğlu Buzurqmihrdir. O, biliklərə, dərin məfkurəyə və fərasətə malik idi. Böyük natiqlik məharəti var idi.

Onlardan səkkizincisi - mücənni Balahbad idi.[8] O, insanlar arasında ən yaxşı oxuyan idi. Xosrov Pəvizin müğənnisi idi.

Onlardan səkkizincisi - müğənni Balahbad idi.[9] Onun və sənətinin incəliyi haqqında Dördüncü iqlimdə Qirmisin bölməsində deyiləcək.

Onlardan onuncusu - bu günə qədər Qəsri-Şirində mövcud olan kanalı çəkən Fərhaddır.[10] O, Büsütun dağını yarmaq istəyirdi. Haqqında sonra deyiləcək.

**(91) FUSTAT -** Misirdə məşhur şəhərdir. Onu Hicri 21 (641-42)-ci ildə Əmr ibn əl-As[1] bina etdirib. O, şəhərdə Cümə məscidini tikdirib. Divarlarına aşağıdan yuxarı ağ mərmər lövhələri qoydurub. Üzərində Quranın bütün mətnini aydın kufi xəttlə yazdırıb. Ayələrin və surələrin adlarına qızıl suyu və lazurit çəkdi.[2] Sonralar şəhəri franklar zəbt edib dağıtdılar.

[Şəhərdə] timsahlara qarşı tilsim var idi və timsahlar şəhərin ətrafında heç bir zərər gətirə bilmirdilər: şəhərə yaxınlaşan kimi, onlar qalxıb arxaları üstə düşürdülər və bundan sonra uşaqlar onları oyuncağa çeviriridilər. Həmin tilsimi sındırdılar və o, öz qüvvəsini itirdi.

**(92) FƏYYUM -** Misirin qərb hissəsində Nil çayının axdığı düzənlikdə vilayətdir. Buralar bataqlıq idi və Səidin (Yuxarı Misirin) su ilə gətirilmiş torpaqları burada yığışırdı. Yusif əs-Siddiq, - ona alamlar olsun! - əmr etdi ki, bu torpaqları becərsinlər və burada o, üç yüz altmış kənd saldırdı. Müəyyən edildi ki, hər kənddən hasil edilən ərzaq Misir əhalisinin bir günlük ruzusunu təmin etsin. Bu təminat da o vaxt vacib olar ki, Nil çayının suyu qalxmayacaq.

Bu barədə əmr bəyan olundu və [əhali] çoxlu xurma və meyvə ağacları əkdi. Bundan sonra [Fəyyumun] böyük hissəsi bağlara çevrildi. Camaat da Yusif əs-Siddiqin, - ona salamlar olsun! - əməlinə heyran qaldı.

**(93) FƏMM ƏD-DİK -** Vasit nahiyəsində bir kənddir. Dəclə çayının bir qolunun sahilindədir. Kənd bu nahiyədə olan rafiqiyyə təriqətinin şeyxlərinə məxsusdur. Onların evləri xeyirxahdır. Adamları qonaq çağırmaq və onlara xidmət etmək adətləridir.

Kasıblarının arasında birlik var. Deyirlər ki, onlar ilan yeyir və bədənlərinə od daxil edirlər. Bunlar yoxsullara mənsub paltar geyir və heç bir iltizama bağlı deyillər.

**(94) FİRUZABAD -** uzunluq dairəsi - 87°30', en dairəsi - 28°10'-dir. İran şahı Firuz tərəfindən Şirazda tikilmiş bir kənddir. Alim və zahid Əbu İshaq Firuzabadi[1] buralıdır. Onun fiqhə aid, o cümlədən Kitab ət-Tənbeh, əsərləri var. O, bu dünyanı 476-cı[*] (1083) ildə səksən altı yaşında tərk edib.

---

[*] Əlyazmada səhvən 446-cı-dır.

**(95) QADİSİYYƏ** - zəvvarlar yolunda, Kufə yaxınlığında şəhərcikdir. Buranın dehqanlarının sahibi olan Harat oğlu Qadisin adını daşıyır. Burada müsəlmanlar və əcəmlər arasında döyüş olub. Əmirləri Səəd ibn Əbu Vəqqas idi.[1]

**(96) QAHİRƏ** - Misirdə, Fustata yaxın olan məşhur şəhərdir. Hər iki şəhər bir divar arxasındadır. İndi bu, nəhəng bir şəhərdir. Ölkənin paytaxtı da buradadır. Bolluğuna görə bu Misirdə ən məşhur şəhərdir. Misirin əntiqə şeyləri buradan aparılır. Orada elə iki böyük qəsr var ki, onları tərif etmək üçün söz çatmaz. Onlardan aşağı, sağ və sol tərəfdə ölkədə tayı-bərabəri olmayan bazar var. Orada Qarafa adlı yer var. Burada əcaib binalar, geniş tikintilər bazar və ibadətgah var. Buraya Qahirənin və Fustatın əhalisi gəzməyə gəlir, xüsusən bayram günlərində İmam Şafeinin - Allah Təala ondan razı olsun və onun təlimini ucaltsın! - mədrəsəsi və qəbri oradadır. Orada Musa, - ona salamlar olsun! - qayası məşhədi var. O, burada firondan qorxub gizlənirdi. Şiarayn məhəlləsinin darvazası yaxınlığında bir məscid var. Deyilənə görə Yusif əs-Siddiqi, - ona salamlar olsun! - bu yerdə satmışdılar.

(97) QUBRUS - Tərsusun yaxınlığında adadır. Onun çevrəsi on altı günlük yoldur. Buradan başqa yerlərdə tapılmayan əla buxur və nadir keyfiyyətli, başqa növlərindən üstün olan Kubrus kuporosu gətirirlər.

**(98) QİFT** - Bağları və zəmiləri bol olan Misirin Yuxarı Səid vilayətində şəhərdir. Burada xurma və limonun iki növü var. Orada əcaib bir ev var ki, onun tavanı üç yüz altmış sütunun üzərindədir. Hər bir sütun bütöv bir daşdan düzəlib və sütunun üstündə, başında qalansüvassı olan insan timsalı var. Bütün tavan daşdandır, onun hər küncündə və həmçinin sütunlarının yuxarılarına daşlar qoyulub. Bunlar elə bəndlənib ki, aralarında oyuq görünməyir.

**(99) QƏYTƏT - ƏN-NƏCM** - Fərat çayına baxan möhkəm qaladır. Yaxınında Şamdan, Rumdan və İraqdan gələn karvanların üstündən keçdikləri körpü var. Ondan aşağıda bir-birlərinə qumarda kömək edən qumarbazlar yığışan bir yer var.

**(100) QAYRUVAN** - uzunluq dairəsi - 41º05', en dairəsi - 31°40'-dir. İfriqiyədə böyük şəhərdir. Müaviyyənin vaxtında məskun olunub. Onu, duası qəbul edilmiş Uqba ibn Nafi əl-Quraşi[1] bina etmişdir. Orada iki sütun var. Heç kəs bilmir ki, nə üçün hər cümə günü, gün doğana yaxın onlardan su sızır.

**(101) KABİL** - Hinddə məşhur şəhərdir. Orada xurmadan başqa hər cür meyvə var. Onun ətrafında qar yağır, şəhərin özündə isə yağmır. Əhalisi müsəlmanlar və kafirlərdir. Buradan ən yaxşı cins - Buxti cinsindən olan maya dəvələr gətirirlər.

**(102) KƏRYAN** - Farsda bir şəhərcikdir. Orada məsuslar ibadət edən böyük atəşgah var. Başqa ölkələrdə olan atəşgahlara odu buradan aparırlar. Şəhərin qalası var. Onu güclə heç kəs ala bilmədi. Qala gilli dağın başındadır.

**(103) KAZİRUN** - uzunluq dairəsi - 87°05', en dairəsi - 29º15'-dir. Farsda möhkəm, abad, barlı, nemətli şəhərdir. Şəhər bütövlüklə saraylardan, bağlardan sağ və şimal tərəfə uzanan palma ağacları əkilmiş sahələrdən ibarətdir.

Bu şəhəri Əcəmin Dumyatı adlandırırlar, çünki burada da qəsəbi və şətavi adlı kətan parçalarını hazırlayırlar. Şəhər evlərinin çoxu və Cümə məscidi təpə üstündədir, bazarları və sarayları isə təpənin altındadır. Orada elə meyvə var ki, başqa yerlərdə yoxdur və onu hədiyyə kimi aparırlar.

**(104) KİRD FƏNA XOSROV** - Şirazın yaxınlığında Əzudəddövlə tərəfindən bina edilmiş şəhərdir. O, şəhərə tərəf uzunluğu bir günlük yolu olan böyük bir kanal çəkdirdi və bunun üçün çoxlu pul xərclədi. Şəhərin yaxınlığında sahəsi fərsaha yaxın olan bağ saldırdı. O, işini bitirib, su çəkdirəndən sonra həmin günü bayram elan etdi. Bu şəhərin qazisinin xəyanəti zərbi-misala dönüb. Bu barədə hekayət var.

**(105) KERMAN** - Məşhur vilayətdir. Ondan şərqdə - Mukrn, qərbdə - Fars, şimalda - Xorasan səhrası, cənubda isə - Fars dənizidir. Təhmuras oğlu Kermanın adını daşıyır. Bu vilayət bərəkətlidir. Xurması taxılı və mal-qarası da çoxdur. Orada başqa ölkələrə ixrac olunan sink mədəni var. Orada odda yanmayan bir ağac növü bitir. Lap bir neçə gün də odda saxlasan, yanmaz. Bu ağac dağların birindədi.

Kermanla Xərzəncin arasında bir yer var ki, əgər iki daş bir-birinə dəysə yağış yağar. Bu - hamıya məlumdur. Orada qızılı rəngdə kuporos mədəni var. Kuporosu başqa ölkələrə aparırlar.

Əvhədəddin adlanan şeyx Əbu həmid Kermani buralıdır. O, ecazkar idi və o dünyadan xəbər verirdi. Onun təriqətə aid fars dilində şerləri var. O, 635 (1237-38)-ci ildə Bağdadda vəfat edib.

**(106) KAFARTAB** - Suyu olmayan səhrada, Xələblə Məərrənin arasındakı şəhərdir. Əhalisi üçün ən qiymətli şey sudur:

yağış suyundan başqa onlarınsuyu yoxdur. Deyirlər ki, onlar üç yüz dirsək [dərinliyində] quyu qazdılar, amma su tapmadılar.

**(107) KƏRKUYA -** Sicistanda qədim şəhərdir. Orada iki böyük qübbə var. Deyilənə görə, bunlar Rüstəm əş-Şədidin vaxtından qalıb. Qübbələrin yuxarısında öküz buynuzlarına bənzər bir-birinə mail iki buynuz var. Bunların bizim günümüzə gəlib çatması möcüzədir. Bu qübbələrin altında məcusların atəşgahı var. Onun alovu heç vaxt sönmür. Bu - məcusların ən əsas atəşgahlarındandır.

**(108) KAFARMANDA -** Ürdündə, Akka ilə Təbəriyənin arasında bir kənddir. Deyirlər ki, bu, Quranda adı çəkilən Mədyandır[*] və bu da Şüeybin qaldığı yerdir. Onun qızı, Musanın, - ona salamlar olsun! - arvadı olan Səfuərnin qəbri oradadır. Musanı, - ona salamlar olsun! - qəbul etməyən quyu da buradadır. Şüeyb, - ona salamlar olsun! - mal-qarasını burada sulayıb.

**(109) KUFƏ -** uzunluq dairəsi - 79°30', en dairəsi - 31º30'-dir. Ömər ibn əl-Xəttabın, - Allah ondan razı olsun! - xilafəti zamanında Bəsrənin [bina olunmasından] il yarım sonra müsəlmanlar tərəfindən bina olunmuş məşhur şəhərdir. Orada əs-Səhla adlı məscid var. Deyilənə görə, bu məscid İdris, - ona salamlar olsun! - olduğu binanın yerində tikilib. O, buradan göylərə ucalıb. İbrahim, - ona salamlar olsun! - elə buradan amalik tayfasının əleyhinə yürüş edib. Xızır da burada ayaq saxlamışdı. Burada Tamar adlı bir qəsr var. Bura hakimlərin yaşadığı yerdir. Hüseynin, - Allah ondan razı olsun! - öldürülməsindən bir az qabaq Übeydallah ibn Ziyad[1] əmr etdi ki, Müslim ibn Uqeyli[2] bu qəsrin yuxarısından yerə atsınlar. Əli ibn Əbu Talib, - Allah ondan razı olsun! - elə burada hicri 40-cı ilin ramazan ayında (8. 1.-6. II. 661) öldürülmüşdür.

İmam Əbu Hənifə ən-Numan ibn Sabit[3] buralıdır. O, alim, tərkidünya və Allahdan qorxan bir adam idi. O, Bağdadda 150-ci (767) ildə yetmiş iki yaşında vəfat etdi. Saur Atxal mənşəli olan Əbu Abdullah ibn Sufyan ibn Səid əs-Sauri[4] buradandır. O, ən mömin və bilikli adamlardan olub, fəsahətli və görkəmli imamlardan idi. O, 161-ci[*] (778) ildə öldürülüb. Şair və imam Əbu Təyyib Əhməd əl - Mütənəbbi də buradandır.

---

[*] Bax: Quran, 7, 85; 9, 70 və b.

[*] Əlyazmada səhvən 354-cü ildir.

**(110) KƏRX** - Bağdaddan bir mil yuxarıda kənddir. Əhalisi - qəti şiələr və yəhudilərdən ibarətdir.

Əbu Məhfuz Məruf ibn Firuz əl-Kərxi[1] buradandır. O, Sari əs-Səqatinin müəllimi olan Əli ibn Musa ər - Rizanın[2] azad edilmiş qulu idi. Onun duası qəbul olunmuşdu.

**(111) KƏSKƏR** - Bataqlıq düzənin yanında, Vasitlə Bəsrənin arasında olan nahiyədir. Sahəsi otuz fərsahdan artıq otuz fərsahadır. Sasanilər vaxtı bu düzəndə kəndlər və əkinlər var idi. Dövlətin işi pozulan zaman şahlar bu yerlərin abadlığına daha fikir vermədilər. Buranı su basdı və bataqlıqlar əmələ gəldi. İndi buralar qamışlıqdır, əhalisi balıq və quş ovlayır. Buradan əla düyü, şabbut adlı balıq, ördək, çəpiş, samış və inək ixrac olunur.

**(112) KUSA** - İraq Savadında qədim bir kənddir. İbrahim Xəlil, - ona salamlar olsun! - buradandır. O orada doğulub, orada da oda salınmışdı. Elə buna görə də Əli ibn Əbu Talib, - Allah Təala ondan razı olsun! - demişdi: «Əgər kimsə bizim nəsəbimizdən soruşsa, bilsin ki, biz nabatiyik, Kusalıyıq».

**(113) LAZİQİYYƏ** - Şam dənizinin sahilində yerləşən qədim şəhərdir. İçində gözəl bir pilləkan və ətrafdan üstün olan hündür yerdə bir-biriylə birləşən iki qala var. Hicri 500-cü (1106-07) ildə firənglər sahil vilayətlərini işğal edəndə şəhəri də zəbt etdilər. Müsəlmanların orada Cümə məscidləri, qaziləri və xatibləri var. 584-cü (1188-89) ildə buranı Salahəddin Yusif[1] yenidən aldı və şəhər indi də müsəlmanların əlindədir.

**(114) MƏCCANƏ** - İfriqiyədə bir şəhərcikdir. O, həm də Qələt Büsr adlanır, çünki şəhəri Büsr ibn Ərta1 fəth edib. Torpağı çox münbitdir. Orada, zəfəran bitir. Gümüş, dəmir, qurğuşun və sürmə mədənləri var.

**(115) MƏDYAN** - Şüeyb qovminin şəhəridir. Onu Şüeybin babası Mədyan ibn İbrahim, - ona salamlar olsun! - bina etmişdir. Şəhər Mədinəylə Şamın arasında, Tabukla üzbəüzdür. Orada bir quyu var. Şüeybin, - ona salamlar olsun! - mal-qarasını Musa, - ona salamlar olsun! - burada sulayırdı. Deyilənə görə, həmin quyunu torpaqla örtüb üstündə bina tikdilər və camaat buranı ziyarət edir.

Deyirlər ki, Mədyan - Təbəriyənin nahiyəsində olan Kafarmandadır.

**(116) MƏRSA ƏL - XƏRƏZ** -İfriqiyə sahilində bir şəhərcikdir. Orada mərcan tapırlar. Buraya tacirlər gəlib, yerli əhaliylə mərcanın dənizin dibindən çıxarılması haqqında sözləşirlər.

**(117) MARİSA** - Misirdə, Səid vilayətində bir kənddir. Misir eşşəklərinin ən yaxşı cinsi olan Maris eşşəkləri buradandır. Buranın eşşəkləri iri, yorğunluq bilməyən və başqa ölkələrdə tayları olmayan cinsdir. Bunlar soyuq yerlərdə yaşaya bilmir və çox tez ölürlər.

Xəlifə əl-Məmunun[1] vaxtında yaşayan mötəzili Bişr əl-Marisi[2] buralıdır. O təkid edirdi ki, Quranı [insan] xaliq edib.

**(118) MƏRYUT** - Misirdə, İskəndəriyyənin yaxınlığında olan kənddir. Möcüzələrindən - əhalisinin çox yaşamağıdır. Ən qoca adam burada tapılıb. Məryutun əhalisindən yaşlı olan heç yerdə yoxdur.

**(119) MİSİR** - uzunluq dairəsi - 56°05', en dairəsi - 30 dərəcədir. Məşhur nahiyədir. Ərazisinin uzunluğu qırx gecəlik yoldur, eni də o qədərdir. Uzunluğu - Ərişdən Asuana qədərdir, enliyi - Bərqədən - Əylaya qədərdir. Buraya Misir ibn Misraim ibn Ham ibn Nuhun, - ona salamlar olsun! - adı verilib. Buranın torpaqları ən münbit və ən baxımlıdır. Yer üzünə insan gəldikdən sonra burada həmişə bolluq olub.

Möcüzələrindən biri - orada yağışların yağmamasıdır. Əgər yağarsa, onda onların məhsulu azalır.

Möcüzələrindən - yayın sonunda bütün çayların suları azalan vaxt, Nil çayının suyu əksinə çoxalır və onun suyu ilə Misirin bütün torpaqları suvarılır. Suyu on iki dirsək qalxanda, qasid xəbər verir: «Allah Nilin suyunu filan qədər artırıb».

Nilin ortasında əl-Məmun, Misirdə olduğu vaxt, bir məscid tikdirib. Məscidin arxasında bir çən var və ortasında uzunluğu iyirmi dörd dirsək olan ağ mərmərdən sütun qalxır. Dirsəklər məsafəsi bir-birindən işarə ilə ayrılır. Hər bir dirsək iyirmi dörd barmağa bölünür və hər bir barmaq - altı hissəyə. Bu çən Nil çayı ilə birləşir və buraya su çaydan gəlir. Nilin suyunun qalxma dərəcəsi sütunun üzərində göstərilir.

Nil çayı qırx gün daşır, sonra su dala çəkilir. Bu çay dünyada ən uzun çaydır. O, bir ay ərzində islam ölkəsinin torpağında axır, iki ay - Nuba ölkəsində və dörd ay - səhrada. O, Qəmər ölkəsindən, ekvator xəttinin cənubundan, cənubdan şimala axır. Çayın suyu dəhşətli istilərdə qalxır və nizamına görə də su dala çəkilir.

Möcüzələrindən - yalnız Nildə olan timsahdır, Deyirlər ki, timsaha Sind çayında da rast gəlmək olar, lakin Nildə olan timsah

oradakından daha iridir. Orada, yunanca adı mukikus olan bir ağac var. Onu gecələr də görmək olur, çünki ağacın özündən göz qamaşdıran şüalar gəlir. Orada dalas adlı bir ot bitir. Bu otdan gəmi ipləri düzəldirlər. İpdən bir qədər kəsib yandırsan, şam kimi yanır. Əgər işıq lazım gəlirsə bu ipdən fitil düzəldirlər və o, özü-özünə yanır.

Orada Hind qarpızının bir növü var. Güclü bir dəvə belə qarpızın yalnız ikicini apara bilir. Çox şirin qarpızdır. Orada qoyun boyda və qətir kimi xallı eşşəklər var. Başqa yerlərdə belələri yoxdur. Orada qara tüklü, ağ başlı quş var və bu quş balıqla dolanır. Həmin quşa Nil qartalı deyirlər. Uçanda, quş aydın səslə: «Allah hamıdan ucadır!» çığırır.

Orada nims adlı kiçik boylu heyvan var. O, siçovuldan iri, lakin gəlincikdən kiçikdir; kürən rəngli, qarıncığı ağ olan heyvandır. Bu heyvan zəhərli ilanı görəndə ona yaxınlaşır. İlan ona hücum etməyə çalışır, lakin bu vaxt ondan elə murdar üfunət gəlir ki, ilan bunun təsirindən ölür.

Misirin möcüzələrindən - Fustatla üzbəüz olan iki ehramdır. Ehramlar kvadrat bünövrə üstündə nəhəng konusvari daşlardan tikilib. Perpendikulyar hündürlüyü üç yüz on yeddi dirsəkdir. Ehramın dörd bərabəryanlı üçbucaq səthli tərəfi var və bünövrəsi də dörd yüz altmış dirsəyə bərabərdir. Belə bir həcmi, möhkəmliyi, xarici ahəngliyi və hesablamaların düzgünlüyü olan ehram güclü küləklərə, aramsız yağışlara və zəlzələlərə davamlıdır. Zikr edirlər ki, bu iki ehramların üzərində müsnədli belə bir yazı var: «Bunları mən tikdirmişəm. Özünü mülkündə güclü hesab edən olsa, qoy bunları dağıtsın. Biz [hər iki ehramı] parça ilə örtdük. Hər kim bacararsa, qoy bunları [heç olmasa] həsirlə örtsün!»

Deyirlər ki, burada qədim zamanlarda yaşayanların birisinin qəbrində bir yazı tapılmışdır. Adam axtardılar ki, yazını oxusun. Deyr Qalamunda bir qoca tapdılar və o, aşağıdakıları oxudu: «Biz ulduzların işarə etdikləri ilə tanış olduq və göydən enən və yerdən çıxan bəlanı gördük. Sonra biz [bəla ilə] tanış olduq və gördük ki, o, yer üzünə, bitkilərinə və heyvanlarına fəlakət gətirəndir. Bizim qətiliyimiz sabitləşəndə, biz padşahımız Səhluq oğlu Sürayda dedik: «Əmr et ki, sənə və ailənin üzvlərinə sərdaba tiksinlər!». O da, özü üçün şərq tərəfdəki ehramı, qardaşı üçün qərbdəkini və qardaşı oğlu üçün kiçik ehram tikdirdi. Onların divarlarında biz yazırdıq ki, göydən yerə bəla enir. Bu əhvalat əl-

Əsəd (Şir) bürcünün mərkəzi əs-Səratan (Xərçəng) bürcünün zirvəsindən bir dəqiqə aşağıya enəndə baş verəcək. Enmə vaxtı ulduzlar səmanın aşağıdakı nöqtələrində olacaq. Günəş və Ay əl-Həməl bürcündən bir dəqiqə aralı olacaqlar, əz-Zəhəl (Saturn) əl-Həməldən bir dərəcə iyirmi səkkiz dəqiqə aralı, əl-Mərrix (Mare) - iyirmi doqquz dərəcə üç dəqiqə əl-Xut (balıq) bürcündən aralı, əz-Zəhra (Venera) iyirmi səkkiz dərəcə əl-Hut bürcündən aralı, əl-Utarid (Merkuri) iyirmi yeddi dərəcə əl-Hut bürcündən aralı və əl-Müştəri (Yupiter) əl-Mizan bürcündə olacaqlar..»

Sürayd öləndə şərq tərəfindəki ehramda, qardaşı öləndə qərb tərəfindəki ehramda, qardaşı oğlu Karuras isə kiçik ehramda dəfn edildilər. Bu ehramların yerin altında üstü tağlı giriş qapıları var. Hər tağın uzunluğu yüz əlli dirsəkdir. Şərqdə yerləşən ehramın giriş yolu şərqdədir, qərbdəkinin - qərbdədir, kiçik ehramınkı isə şimaldadır.

Ehramlarda misli görünməmiş həcmdə qızıl var. Yazıların qibti dilindən ərəb dilinə mütərcimi hadisələrin qısa tarixini hicri 225 (840)-cı ilə qədər vermişdir. Beləliklə, o vaxtdan 4321 il keçib. Sonra o, müəyyən etdi ki, Tufandan onun yaşadığı günlərə qədər 3941 il keçib. Birinci rəqəmdən ikincini çıxanda 395 qalır* və o bildi ki, həmin yazılar Tufandan 325 il qabaq tərtib olunub. Amma düzünü Allah bilir!

Möcüzələrindən biri də ustalıqla düzəldilmiş, insana oxşar sfinksdir (Əbuhövl). Onun çox hissəsi torpaq altındadır. Deyirlər ki, bu Ciza vilayətini torpaq basmasının əleyhinə olan tilsimdir.

Möcüzələrindən biri Anatul adlı çeşmədir. Bu - Misirdə olan bir yerin də adıdır. Orada bir mağara içində bulaq var. Bulağın quyu kişin üstünə axır və gil çevrilib siçan olur.

Möcüzələrindən - əl-Muqəttəm dağlarını göstərmək olar. Bu dağlar Qərəfənin üstündən başlanıb Nil çayının şərq sahili ilə Həbəş ölkəsinə qədər uzanır. Dağ başında məscid və sövməələr var. Oralarda heç bir şey bitmir, nə də su var. Yalnız xaçpərəstlərin monastırında kiçik bulaq var. Deyirlər burada xrizolit mədəni var. Meyitlər burada çürümür və orada çoxlu çürüməmiş meyit var.

**(120) ƏL-MƏTƏRİYYƏ -** Misirin bir kəndidir. Orada balzam ağacı bitir. Orada bir quyu var. Suyunu suvaranda istifadə edirlər. Deyirlər ki, bu - xüsusi bir quyudur, çünki burada İsa

---

* Qəzvində - 399-dur. Faktiki isə - 380-dir.

peyğəmbər yuyunub. Balzam ağacının budaqları xına və nar ağaclarına bənzəyir. Bu ağacların tutduğu yerin sahəsi ölçülməzdir. Oradakı adamlar bu ağacları kökündən çıxarıb içindən ətirli şirəsini əldə edirlər. Onu çox çətinliklə şüşələrə yığırlar. Beləliklə, hər il, təxminən iki yüz Misir rətl həcmində şirə hasil edirlər.

Orada bir xaçpərəst yaşayır və o, həmin şirəni təkcə özü bildiyi üsulla da o, heç kəsi tanış etmir. O, bu şirədən yağ çıxarır.

**(121) MƏƏRRƏT ƏN-NÜMAN** - Hələblə Hamanın arasında şəhərcikdir. Orada çoxlu əncir və zeytun ağacları var.

Gözü kor və dərrakəsiylə məşhur olan Əbülələ Əhməd ibn Abdullah ibn Süleyman əl-Məərri buralıdır. Bəhs edirlər ki, o, noxud dənəsini götürüb deyib: «Bu dənə şahin başına oxşayır». Bu çox əcaib müqayisədir, çünki nəinki korlara, hətta görənlər üçün də ləyaqətlidir.

**(122) MAMŞAN** - Xurması və meyvəsi bol olan Bəsrə yaxınlığında bir kənddir. İnsan üçün çox zərərli yerdir, suyu şor, havası da pis.

Məqamət əl-Xəririyyənin müəllifi Əbu Məhəmməd əl-Qasim ibn Əli əl-Xəriri[1] buralıdır.

**(123) MEYSAN** - Çoxlu kəndləri və xurma ağacları olan, Bəsrə ilə Vasit arasındakı dairədir. Əhalisi şiələrdir. Peyğəmbər Üzeyirin, - ona salamlar olsun! - məşhur türbəsi oradadır. Ona yəhudilər qulluq edir. Şəhərin limanı möhkəm qayalıqdır və oraya otuz lut edir. Buranın vəqfləri var və nəzirlər buraya gəlir.

**(124) MƏDAİN** - uzunluq dairəsi - 72°50', en dairəsi - 33°10'-dir. Sasanilər Dəclə çayının sahilində yeddi şəhər bina etmişlər. [Xəlifə] Ömər ibn əl-Xəttabın vaxtında burada Sasani sülaləsindən olan şahlar yaşayırdı. Onlar buranı sağlam iqliminə, dadlı suyuna və münbit torpağına görə seçmişdilər.

Ərəblər farsların ölkəsinə sahib olandan sonra Bəsrə və Kufə kimi şəhərləri saldırdılar və camaat da buralara köçdü. Sonra əl-Həccac Vasit şəhərini bina etdirdi. Şəhər əmirlərin iqamətgahı oldu və bu şəhər də məskunlaşdı. [Xəlifə] əl-Mənsur Bağdadı bina etdirdikdən sonra camaatın çoxu buraya köçdü.

İndiki dövrdə [Mədain] Dəclənin qərb sahilində olan bir kəndə dönüb. Əhalisi şiə imamilərdir. Onlarda belə bir adət var: arvadları gündüz heç vaxt küçəyə çıxmırlar.

[Mədaindən] şərq tərəfdə Səlman əl-Farisinin,[1] - Allah Təala ondan razı olsun! - məqbərəsi yerləşir. Kənddə bayram şaban

ayının ortasında keçirilir. Hüzeyfə ibn əl-Yəmənin,[2] - Allah ondan razı olsun! - qəbri buradadır. Sasanilərin burada [xəlifə] əl-Müqtəfidə buradadır. Sasanilərin burada [xəlifə] əl-Müqtəfinin[3] vaxtına kimi qalan qəsri var idi. Xəlifə əmr etdi ki, onu dağıtsınlar və əvəzinə xəlifələrin Bağdadda olan Tac sarayını bina etsinlər. Qəsrdən yalnız Xosrovun eyvanı qalıb. Deyirlər ki, onu Ənuşiravan tikdirib və bu - tikilmiş binaların ən böyüyü və ən hündürü idi. İndiki zamanda uzunsov və enli kərpiclərdən tikilən eyvandan yalnız qübbəsi iki tərəfi və tağı qalıb.

**(125) MUKRAN -** Sind ölkəsində vilayətdir. Çoxlu şəhər və kəndləri var. Oradan böyük çay axır və üstündə bir daşdan tikilən körpüsü var. Körpüdən keçənin mədəsi boşalır və içində heç bir şey qalmır.

**(126) MƏNBİC -** Şamda böyük, dövlətli və bərəkətli şəhərdir. Ribatı və mədrəsəsi var. Divarları yonulmuş daşlardandır. Çox möhkəm istehkamları var. Əhali suyu yeraltı kəhrizlərdən götürür.

Öz bəlağətilə məşhur olan Əbdülməlik ibn Saleh əl-Haşimi[1] buralıdır.

**(127) MƏNUF -** Musa zamanının fironunun şəhər» Deyirlər ki, Tufandan sonra bina olunan birinci şəhərdir. Allah Təala: «Şəhərə əhalisi xəbərsizkən girdi...»[*] buyuranda, məhz buranı nəzərdə tuturdu. Şəhər Fustanın yaxınlığındadır. Orada dörd çay axırdı və onların suları firon iqamətgahının yanında birləşirdi. Məhz elə buna görə o, deyirdi: «Bu çaylar mənim altımdan axırlar». Şəhərin xarabaları hələ də qalıb, sarayların daşları indi də görünür.

**(128) MUTA -** Şamda, Bəlqa dairələrinin birindədir. Buranın torpağı yəhudiləri qəbul etmir, onları burada dəfn etmək mümkün deyil və gənc qadın orada doğa bilməz. Qadının doğum vaxtı gəlib çatanda o, buradan gedir, haradasa doğur və qayıdır.

Müşrəf adlanan qılınclar buradandır. [Muta] Şamın Müşrəf adlanan[*] yerlərindəndir.

**(129) ƏL-MEHDİYYƏ -** uzunluq dairəsi - 40°05', en dairəsi - 32°30'-dir. İfriqiyədə, Qayruvanın yaxınlığında şəhərdir. Bu ölkənin fatehi olan əl-Mehdi[1] tərəfindən hicri 300 (913)-cü ildə

---

[*] Quran, 28, 15.

[*] Müşrəf (cəmi - Məşarif) - Şamla və Ərəbistanda əkinçiliklə məşğul olan yerlərin qonşuluğunda olan hündür yerlərin adı idi.

bina olunub. Oranı tikdirib öz iqamətgahına çevirdi. Dəmir qapılı hündür divarlarla əhatə etdirdi və yüksək bir qəsr bina etdi. Şəhərdə ilin günlərinə görə üç yüz altmış su çəni var. Əhaliyə hər gün bir çən su kifayət edirdi. Şəhərin limanı möhkəm qayalıqdır və oraya otuz gəmi yerləşir. Limanda aralarına dəmir zəncir salınmış iki bürc var. Gəmi limana girdikdə qarovul göndərilir və onlar zənciri aşağı salırlar. Bunu da ona görə edirlər ki, başqa ölkədən gələn gəmi limana daxil olsun. Sonra da zənciri yenidən qaldırırlar.

İndi buranın sahibi Əbdülmöminin nəslidir.[2]

**(130) NƏHRAVAN -** Dəclədən şərqdə olan Bağdadla Vasitin arasında geniş əyalətdir. Bura Bağdadın ən gözəl, zövq verən, mənzərəli və şöhrətli əyaləti idi. Tale ona zərbə vurdu və bu əyalət səlcuq sultanları arasında gedən hərc-mərcliyə və daxili müharibələrə görə talan olundu. Əyalət ordular gedən yolda olduğu üçün əhalisi onu tərk etmişdi.

Qazi Əbülfəras əl-Muafa ibn Zəkəriyyə ən - Nəhravani[1] buradandır. O, layiqli alim idi və vaxtında onun tayı-bərabəri yox idi.

**(131) VADİ ƏR-RƏMAL -** Əndəlus ölkəsindon o yana, Məqribdə bir vadidir. Əbu Naşir[1] padşah olanda o, qərbə tərəf getdi və Vadi ər-Rəmala çatanda onu keçmək istədi, lakin orada qumun su kimi axması ona bu imkanı vermədi. Vadini keçməyə ümidini itirəndə o, əmr etdi ki, onun kənarında mis ata minmiş insana oxşar bir sənəm qoysunlar. Onun altında belə yazılmışdı: «Məndən o yana yol yoxdur!»

**(132) VADİ MUSA -** Beyt əl-Müqəddəsin yaxınlığındadır. Çoxlu zeytunu olan yerdir. Orada ölümünə yaxın Musa ibn İmran, - ona salamlar olsun! - ayaq saxlamışdı. O, daşa söykənəndə daşdan on iki çeşmə açıldı. Sonra Musa, -ona salamlar olsun! - vəfat etdi, daş isə orada qaldı. Daş keçi başı boydadır.

**(133) VADİ ƏN-NƏML -** Cibrinlə Əsqəlunun arasındadır. Davud oğlu Süleyman, - ona salmalar olsun! - Şama yürüdüyü zaman buradan keçmişdir. O,. burada nəhəng qarışqa qoşunlarına rast gəldi və külək ona onların danışıqlarını gətirdi: «Ey qarışqalar! Yuvalarınıza girin ki, Süleyman və ordusu özləri də bilmədən sizi [ayaqları altında] basıb əzməsinlər»* Qarışqalar da öz yuvalarına girdilər. Bu barədə çox möcüzəli hekayət var.

---

* Quran, 27, 18.

**(134) VƏDDAN** - İfriqiyənin cənubunda şəhərdir. Möhkəm qalası var. Şəhər iki hissədən ibarətdir və burada iki ərəb qəbiləsi yaşayır: səhmilər və xədramilər. Onlar bir-biriylə müharibə edirlər.

Onun yaxınlığında daşdan bir büt var. O, Kərzə adlı təpənin üstündədir. Şəhər ətrafında bütə sitayiş edən və ondan yağış istəyən bərbər qəbilələri yaşayır.

**(135) VASİT** - uzunluq dairəsi - 81°30', en dairəsi - 32°20'-dir. Qərb tərəfdə, Kufəylə Bəsrə arasında şəhərdir. Torpağı münbit, özü bərəkətlidir. Şəhərin içindən Dəclə çayı axır. Şəhər xoş iqlimli və çoxlu suyu olan yerdədir. Bataqlıqlardan gələn küləklə qarışanda havası korlanır. Şəhər, görkəminə gəldikdə isə, onun kimi gözəl mənzərələri yoxdur. Onun tikilməsinə əl-Həccac ibn Yusif Səqafi hicri 84 (703)-cü ildə başladı və 86 (705)-ci ildə bitirdi. Özü orada 95 (714)-ci ilədək yaşayıb, elə həmin ildə də vəfat etdi.

Quran qiraəti elminin yeddi növünü bilənlərdən bir dəstəsi buradandır. Onların arasında Əbülizz əl-Qalanisi[1] də var.

**(136) HİNDİYAN** - Farsda, iki dağ arasında olan kənddir. Orada içərisindən tüstü çıxan quyu var və heç kəs ona yaxınlaşa bilmir. Əgər quyunun üstündən bir quş uçsa belə o, yanıb yerə düşür.

**(137) HİT** - Bağdad nahiyəsində, Fəratın sahilində, Ənbərdən bir qədər yuxarıda yerləşən gözəl şəhərcikdir. Çoxlu ağacları, xurması var; bərəkətli, təmiz havası və içməli suyu, bağlı-bostanlı bir yerdir.

Abdullah ibn əl-Mübarəkin,[1] - Allah Təalanın ona rəhmi gəlsin! - qəbri buradadır.

**(138) YƏZD** - uzunluq dairəsi - 89°05', en dairəsi - 32°05'-dir. Farsda şəhərdir. Əhalisi çox, bərəkətli, taxıllı və meyvəli bir yerdir. Orada sundus adlı parça toxuyurlar. Gözəl və qalın parçadır. Onu buradan başqa ölkələrə aparırlar.

## DÖRDÜNCÜ İQLİM

Gecə-gündüzün bərabərliyində günorta vaxtı kölgənin uzunluğu dörd qədəm, beşdə üç qədəm və beşdə bir qədəmin üçdə biri olan yerdə başlanır. Axırı isə gecə-gündüzün bərabərliyində günorta vaxtı kölgənin uzunluğu beş qədəm, beşdə üç qədəm və beşdə bir qədəmin üçdə biri olan yerdədir. İqlim Çin, Tubbat (Tibet) və Xutan torpaqlarından başlanıb, Kəşmir dağlarını aşır və Billuru, Bədəxşanı, Kabulu, Ğuru, Xorasanı, Qumisi, Cürcanı, Təbəristanı, Kuxistanı, Azərbaycanı, İraqın ucqarlarını, Cəzirəni [Rodosu, Siciliyanı] və Əndəlusu keçib Muhit dənizinə qədər uzanır.

İqlimin əvvəlində günün uzunluğu on dörd saat on beş dəqiqə, ortasında - on dörd saat yarım və axırında - on dörd saat qırx beş dəqiqədir.

Məşriqdən Məqribə qədər uzunluğu səkkiz min iki yüz on dörd mid on dörd dəqiqə, enliyi isə - iki yüz doxsan doqquz mil dörd dəqiqədir.

İndi isə iqlimin daxilində yerləşən bəzi ölkələrin adlarını əlifba sırasıyla yada salaq.

**(1) AVƏ** - uzunluq dairəsi - 85°10', en dairəsi - 34°40'-dir. Savənin yaxınlığında görkəmli şəhərdir.

Əhalisi - qatı şiələrdir. Buranın əhalisi Savə əhalisilə düşmənçilik edir, çünki Savəlilər sünnüdür. Bu iki şəhərin arasından, payızda daşan, böyük çay axır. Atabəy Şirkir[1] onun üstündən yetmiş gözlü körpü saldı. Yer üzündə bu körpünün bərabəri yoxdur.

**(2) AZƏRBAYCAN** - Kuxistan, Arran və Ərminiyyə arasında yerləşən geniş nahiyədir. Orada çoxlu şəhər kənd, dağlar və çaylar var. Orada, Ərdəbil yaxınlığında, Savalan dağı var, bu da dünyanın ən böyük dağlarındandır. Onun başında bir bulaq var, suyu da şiddətli soyuqlara görə donmuşdur.

Peyğəmbərin, - Allah ondan razı qalıb onu salamlasın! - [adından söyləyirlər ki,] Erməniyyəylə Azərbaycanın arasında Savalan adlı dağ var və onun başında cənnət bulaqlarından biri axır. Bundan başqa elə orada peyğəmbərlərdən birinin qəbri var və ətrafında xəstələr müalicəsini görən isti sular axır. Dağın başında yayda da, qışda da qar olur.

Orada, Təbrizlə Marağa arasında böyük Səhənd dağı var. Ətrafında adamlar yaşayır, suları və taxıl zəmiləri də çoxdur.

Orada isti su var ki, camaat da yayda bu yerə axışıb gəlir. Dağın başında həmişə qar var. Orada Uveys çayı var. Ərzən ər-Rum dağlarından axan bu çayın suları çox gurdur. Bu çay çoxlu ölkələrin torpaqlarından axır və vaxtında, Naxçıvan yaxınlığında Ziya əl-Mülkün[1] körpüsünə çatır. Körpü daşdan tikilib və dünyanın möcüzələrindəndir. Orada elə bir çay var ki, suyu daşa dönüb daş lövhələrinə çevrilir. Orada çoxlu mis, dəmir, malaxit, kuporos və lazurit mədənləri var.

**(3) AMUL** - Təbəristanda məşhur şəhərdir. Əhalisi həddindən artıq cılızdır. Əgər buraya bir qoyun girsə və nə qədər yağlı olursa olsun, tezliklə o cılızlaşar, elə ki, onu heç bir arıq keçiylə də müqayisə etmək olmaz.

**(4) ƏBHƏR** - uznuluq dairəsi -84°30', en dairəsi - 36°45'-dir. Suyu və ağacları bol olan, Cibal vilayətində, Qəzvin yaxınlığında şəhərdir. Onu Sabur Züləktaf[1] bina etdirib. Çox münbit torpaqlı, təmiz havalı və bağlı-bostanlı yerdir. Bayırdan görkəmi daha yaxşıdır, nəinki daxildən. İçqalası var. Orada qəribə bir bulaq var: əgər suyuna qılınc salınsa o, həmişə iti qalacaq. Orada girdə, portağal boyda armud bitir. Çox dadlıdır və başqa ölkələrdə beləsi yoxdur.

Şiblinin[2] nə ilə müasirlərindən biri olan şeyx Əbubəkr Zahiri[3] buradandır. Onun zaviyəsi də buradadır.

**(5) ƏBİVƏRD** - Xorasanda, Səraxsın yaxınlığında şəhərdir. Onu Cudarz oğlu Bavərd bina etdirib. Çox pis suyu var: əgər bu sudan kimsə içsə, onu Mədinə təri basar.

Əli əl-Füzeyl ibn Əyyad[1] buradandır. O, Allahın saf bəndələrindən idi. O, Səmərqənddə anadan olub. Bavərddə böyüyüb və Məkkədə 187 (803)-ci ildə vəfat edib.

**(6) AMİD** - uzunluq dairəsi - 73°40', en dairəsi - 38°05'-dir. Daşdan tikililəri olan Cəzirənin möhkəmlənmiş bir şəhərlərindəndir. Şəhər yüksək yerdədir və Dəclə çayının suları onu üç tərəfdən aypara kimi əhatə edir. Şəhərin mərkəzində bulaqlar və iki dirsək dərinliyində olan quyular var. [Şəhərin] bol ağacları, bağ-bostanları, zəmiləri və meyvələri var.

Onun möcüzələrindən: 627 (1230)-ci ildə Xarəzmşah Cəlaləddin[1] tatarlar tərəfindən məğlub olub. Amidə gəldi. Kimsə yanına gəlib, ona dedi: «Tatarlar arxandadır və onlar yaxındadır». Cəlaləddin dedi: «Gələn Amid sahibinin adamıdır və o, istəyir ki, biz onun torpaqlarından çıxıb gedək». Amma səhər açıla-açılmaya

tatarlar onları əhatə etdilər. Onlar da tatarlardan qaçıb Amidə üz tutdular. Amid camaatı divarların üstündən bunlarla atışmaya girişdilər. Bu döyüşdə Cəlaləddin həlak oldu. Tatarlar çıxıb gedəndə Amidin yaxınlığına ordusuyla əl-Məlik əl-Kamil[2] gəldi, şəhəri mühasirəyə alıb zəbt etdi. Şəhərin hakimi isə tatarlardan qaçıb onun şəhərində sığınaq axtaranlara bəla gətirdiyi üçün öz mülkünü itirdi.

**(7) İRBİL** - uzunluq dairəsi - 77°20', en dairəsi - 35°05'-dir. Möhkəm qalası var. Onu tatarlar da ala bilmədi, baxmayaraq ki, onların almadığı qala olmayıb. Orada bir məscid var və içində, üstündə insan əlinin ləpiri olan daş var. Bu da çox təəccüblü şeydir.

İslam qazisi, cəsur və əliaçıq əl-Məlik Müzəffərəddin ibn Əli əs-Saqır[1] buradandır. O, firəngləri amansızcasına qırırdı.

**(8) ƏRDƏBİL** - uzunluq dairəsi -82°30', en dairəsi - 38°05'-dir. Azərbaycanda münbit torpaqlı, içməli sulu, xoş havalı şəhərdir. Orada çoxlu çay axır, amma buna baxmayaraq ətrafda meyvə ağacları yoxdur. Şəhəri Firuzşah tikdirib. Şəhərdən dəniz sahilinə iki günlük yol var. Ərdəbilin əhalisi öz qarınqululuğu ilə məşhurdur.

**(9) URMİYA** - uzunluq dairəsi - 79º45', en dairəsi - 37°05'-dir. Azərbaycanda möhkəm, meyvəli, barlı-nemətli şəhərdir. Onun yaxınlığında üfunətli bir göl var. Göldə balıq yoxdur. Bir adası var, üstündə kəndləri, dağları və möhkəm qalası var. Gölün çevrəsi əlli fərsahdır. Onun şərq sahilində, Dehhərqanın yaxınlığında, elə bulaqlar var ki, külək olanda onun suyu bərkiyib ağ mərmərə dönür.

«Kürd yatıb ərəb oyandım» deyən şeyx, alim və zahid [Əbubəkr] Hüseyn ibn Əli Yəzdənyar buralıdır. O, 333 (945)-cü ildə vəfat edib, burada da dəfn olunub. Tacəddin Urmavi adlanan şeyx Əbu Əhməd də buradandır. Vaxtında dini, fiqhin, tibbin və ədəbiyyat elmlərində onun tayı-bərabəri olmayıb. O, 654 (1256)-cı ildə vəfat edib.

**(10) ALTUNAVƏND**[*] - Reyin bir nahiyyəsində, Dünbavənddə məşhur qaladır. Çox qədim qaladır və içqalası da möhkəmdir. Üç min il bundan əvvəl tikilib. Heç kəs onun güclə alınması haqqında o vaxta qədər eşitməyib ta ki, bu qalaya tatarlardan qaçan Xarəzmşahın oğlu Ruknəddin Ğursancdı,[1] sığınmadı. 618 (1221)-ci ildə tatarlar qalanı aldılar Onlar çoxlu odun

---

[*] Qəzvində - Üstünavənddir.

yığıb qalanın dövrəsinə töküb yandırdılar. Oddan onun daşları parçalanıb dağıldı. Sonra buraya tatarlar qalxdı. Xarəzmşahın oğlu onlarla həlak olana qədər vuruşdu.

**(11) ƏSFƏCİN** - Həmədanın kəndlərindəndir. Orada vəhşi eşşək dırnaqlarından düzəldilmnş minarə var. Hündürlüyü əlli dirsəkdir, çevrəsi isə otuz dirsək. Özü əhəng və daşdandır, heyvan dırnaqları isə dövrəsinə mıxlanıb. Bu minarə çox məşhurdur. Onun tikilməsinə Ərdəşir şahın oğlu Şapur əmr vermişdi.

**(12) İSFƏRAİN** - uzunluq dairəsi - 81º05', en dairəsi - 36°55'-dir. Xorasanda məşhur şəhərdir. Əhalisi xoşxasiyyət və mömindir. Şəhərin fəxr etdiyi adamlardan bir Əbülfəth Məhəmməd ibn əl-Fəzl əl-İsfərainidir. O, alim, imam, ləyaqətli adam və zahid idn. O, Hamıdan tez suallara cavab verir və isnadarda başqalarına nisbətən danışmırdı.

O, Əbu Yəzid əl-Bistami[1] ilə yanbayan dəfn olunub.

**(13) İSFAHAN** - uzunluq dairəsi -86º40', en dairəsi - 32°25'-dir. Böyük, şöhrətli və adı tez-tez çəkilən şəhərdir. Çox münbit torpağı, sağlam iqlimi və şirin suyu var. Şəhərin tədim adı Caydır. İsfahanın əsas hissəsi (Böyük şəhr) Yahudiyyə adlanır, çünki Buxt Nəssar Beyt əl-Müqəddəsi zəbt edəndə, əsir edilmiş əhalisinin arasından sənətkarları seçib ayırmışdı. Bunlar İsfahana gəldikdə gördülər ki, buranın suyu, havası və torpağı Beyt əl-Müqəddəsdəki kimidir və buranı özlərinə yurd seçdilər. Burada qalıb məskunlaşdılar.

Buranın alması ilin bütün vaxtında təzə qalır. Buğda burada xarab olmur, ət də iylənmir. Alma orada qaldıqda o qədər də iyi gəlmir, elə ki, onu şəhərdən çıxardırlar ondan ətir iyi gəlir. Orada məlaci adlı armud növü var və buna bənzəri başqa ölkələrdə yoxdur. Əhali bu armudu söyüdə peyvənd etdi.

Buranın sənətkarları hər bir incə sənətdə mahirdir. İsfahan əhalisi öz fərasəti ilə məşhurdur.

Orada Zərəmurd adlı çay axır. Suyu çox dadlı və ləzzətlidir. Çayınsuyu ilə İsfahanın və onun rustaqlarının bağları suvarılır. Sonra çayın suyu oradakı qumlarda yox olur və daha sonra Kermanda, itdiyi yerdən yetmiş fərsah uzaqda üzə çıxır. Çayın suları ilə Kerman zəmilərini suvarırlar. Sonra da çay Hind dənizinə tökülür.

Ərəblər haqqında məlumat verən Kitab əl - əğaninin müəllifi, dəyərli ədib Əbülfərəc əl-İsfahani,[1] möcüzələr yaradan,

Xilyat əl-övliyanın müəllifi Hafiz Əbu Nüeym əl-İsfahani[2] buralıdırlar. Sədrəddin Əbullətif əl-Xucəndi də buradandır. O elə bir rəis idi ki, İsfahan əhalisi onun ardınca gedirdi. Çox rəhimli, insaflı adam, vaiz və şair idi. O, 523 (1129)-cü ildə vəfat edib.

**(14) ƏFŞANA** - Xərməsyan nahiyəsində olan Buxaranın bir kəndidir. Əbu Übeyd əl-Cüzcani[1] belə demişdi: «Müəllimim Əbu Əli Hüseyn ibn Abdullah ibn Sina[2] mənə danışıb ki, onun atası Bəlxdən idi, sonra Nuh ibn Mansur Samaninin[3] vaxtında Buxaraya köçdü. O, vergi toplayan idi. Əfşanada evlənib. Mən də orada dünyaya gəlmişəm. Mənim ulduz falım belədir: Müştəri ulduzu Saratan bürcündə idi. Zəhra, Ay və Utarid - Sünbül bürcündə, Mərrix - Əqrəb bürcündə, Günəş - Əsəd bürcündə, Müştəri Saratan bürcünün ən yüksək dərəcəsində, Şirə (Sirius) isə öz zirvəsi ilə doğmanın dərəcəsində idi. Bütün ulduzlar xoşbəxtlik göstərən yerlərdə idilər».

O demişdi: «Həddibuluğa çatanda o, məni Quranı öyrədən müəllimə, sonra da ədəbiyyat müəlliminə verdi. Uşaqlar ədəbiyyatdan nə öyrənirdilərsə, mən hamısını əzbərləyirdim. Müəllimim mənə əzbərləmək üçün «Kitab əs-Sifət,» «Kitab ğərib əl-müsənnəf,» sonra «Ədəb əl-kuttab,» «İslah əl-məntiq» adlı kitabları, «Kitab əl-eyn,» «əl-Xəməsə şerlərini,» İbn ər-Ruminin[4] «Divanını,» əl-Məzininin[5] «Təsrifini,» Sibaveyhin[6] «Nəhvini» verdi. Və mən də bütün bu kitabları il yarım ərzində əzbərlədim. Əgər müəllimim məni saxlamasaydı, mən bunları daha tez əzbərləyərdim. Deməliyəm ki, bundan başqa mən məktəbdə uşaqlardan tələb edilən hər şeyin öhdəsindən gəlirdim. On yaşım tamam olanda məndən Buxarada heyrətə gəlirdilər. Sonra mən fiqhə qərq oldum. On iki yaşım tamam olanda mən artıq Buxarada İmam Əbu Hənifənin,[7] - Allah ondan razı olsun! - məzhəbinə uyğun mühakimələr verirdim. Bundan sonra mən tibb elminə girişdim və on altı yaşım tamam olanda «Qanun» tərtib etdim.

Bu vaxt Nuh ibn Mansur Samani xəstələndi. Onun müalicəsinə bütün həkimlər yığışdı. Mən də bunlarla idim və onlar gördülər ki, mənim müalicəm hamınınkından yaxşıdır. Mənə görə o, sağaldı. Mən ondan xahiş etdim ki, o, öz kitabxanasının mühafizinə əmr etsin ki, istədiyim hər hansı bir kitabı mənə versin. O da icazə verdi. Mən onun kitabxanasında Əbu Nəsr (Məhəmməd) ibn Tarxan əl-Farabinin[8] əsərləri kimi müdriklik öyrədən kitablar gördüm. Bundan sonra mən müdrikliyə sahib oldum. Mənim iyirmi dörd

yaşım tamam olanda başa düşdüm ki, elmlərdə elə bir qalmayıb ki, mən onu bilməyəm».

Samanilər dövləti yox olandan sonra Mavəraünnəhr ölkəsi Səbüktəqin sülaləsinin əlinə keçdi. Padşahlıq sultan Mahmuda[9] keçəndə Əbu Əlinin əleyhinə intriqalar başlandı və o, Buxaradan əvvəlcə Xorasana, sonra da Təbəristana qaçdı. O, Şəms əl-Məali Kabus ibn Vuşməgirin[10] qulluğuna girdi. Sonra da o, Buveyhilərin torpağına - Cibala üz qoydu, bundan sonra Həmədana getdi. Deyirlər Həmədanın hakimi Şəmsəddövlə[11] onu özünə vəzir təyin etdi. O, bu vəzifədə bir qədər çalışdı, sonra isə İsfahan hakim Əlaəddövlənin[12] yanına gedib, onun yanında ölümünə qədər xidmət edib. O, bu dünyanı 428 (1037)-ci ildə, əlli səkiz yaşında tərk edib və Həmədanda dəfn olunub.

**(15) ƏLƏMUT** - Uzunluq dairəsi -85°37', en dairəsi - 36°21'-dir. Qəzvinlə Xəzər dənizinin arasında, Rüdbar nahiyəsində, dağ başında möhkəm bir qaladır. Ətrafı düzənlikdir, buna görə də onun hündürlüyünə mancanağın atdığı qumbaralar və atılan oxlar çata bilmir. Bura - ismaililələr hökmranının iqamətgahıdır. Batinilər daisi Həsən əs-Sabbağ[1] buradandır. O hikmət sahibi idi, münəccimliyi, həndəsəni və sehri bilən idi. Nizamülmülk,[2] fəzilətinə görə ona hörmət bəsləyirdi.

**(16) ƏYZƏC** - İsfahanla Xuzistanın arasında şəhərdir. Burada tez-tez zəlzələ olur. Çoxlu mədən var. Dünyanın möcüzələrindən hesab edilən Xurrazad adlı körpü burdadı. Xurrazad Ərdəşir şahın anasının adıdır. Körpü qurumuş vadidə tikilib. Burada su yalnız arası kəsilməyən yağışlar vaxtında olur. Onda ətraf coşğun bir dənizə dönür və bunun suları min dirsəklik və dərinliyi yüz əlli dirsək olan sahəni basır. Bu körpünün əcaib quruluşu və möhkəmliyi olan bir tağı var.

**(17) İRAVA** - Təbəs yaxınlığında, dağ başında yerləşən kənddir. Çoxlu bağları və meyvələri var. Möhkəm içqalası var.

Möcüzələr yaradan şeyx Əbu Nəsr əl-İravi buradandır.

**(18) ƏNTAKİYƏ** - Uzunluq dairəsi - 71°26', en dairəsi - 35°30'-dir. Rum dənizinin sahilində yerləşən Şamın məşhur şəhərlərindəndir. Xoş təbiəti, gözəl təmiz Havalı və dadlı suyu olan şəhərdir. Şəhərin daxilində bağlar, bostanlar var. Onu Rum ibn əl-Yəqan ibn Sam ibn Nuhun, - ona salamlar olsun! - qızı Əntakiyə tikdirib. Şəhəri əhatə edən və çevrəsi on iki mil olan divarlarının üstündə üç yüz altmış bürc var. Şəhərdə uzaqdan görünən içqala var.

Bu o qədər yüksəkdir ki, günəş onun arxasından yalnız gündüz saat ikidə görünür. Orada havarilər başçısı olan Futrus adlı oğlunu dirildən çar Qəsyanın adını daşıyan kilsə var. Orada içində Zəkəriyyə oğlu Yəhyanın, - ona salamlar olsun! - məqbərəsi olan kilsə də var.

**(19) BƏDƏXŞAN** - Uzunluq dairəsi - 104°24', en dairəsi - 37°10'-dir. Yuxarı Tuxaristanda məşhur şəhərdir. Orada yaquta oxşar bədəxşan ləli, lazurit, Süleymandaşı[1] və saf büllur mədənləri var.

**(20) BƏRQAİD** - Mavsillə Nisibinin arasında şəhərcikdir. Qədim zamanlarda o, yanından karvanlar keçən böyük şəhər idi. Əhalisi oğurluğa görə zərbi - misala dönüb. Müğənni əl-Bərqaidi buradandır. Onun eybəcər sifəti və iyrənc səsi zərbi - misala dönüb.

**(21) BƏRUCİRD** - Həmədanın yaxınlığında gözəl və möhkəm şəhərcikdir. Burada çoxlu su, ağac və meyvə var. Onun torpağında zəfəran becərirlər. Deyirlər ki, qədim zamanlarda onun qapısında qoşunlar dayandı, səhər isə onların hamısı daşa döndü. Qalıqları indi də görünür.

**(22) BİSTAM** - Uzunluq dairəsi -89°30', en dairəsi - 36º10'-dir. Qumisdə, Damğan yaxınlığında böyük şəhərdir. Möcüzələrindən biri odur ki, sakinlərinin arasında aşiq olan yoxdur. Əgər aşiqlərdən birisi şəhərə gəlib suyunu içsə onun eşqi yox olar. Bundan başqa burada heç vaxt gözü qızarmış adam görməzsən. Buranın suyu ağızdan gələn pis qoxunu aparır. Buranın əzvayının heç bir iyi yoxdur, toyuqları da tullantı yemirlər. Kiçik sıçrayan ilanları var.

Qəribə möcüzələr yaradan Əbu Yəzid Təyfur ibn İsa əl-Bistami[1] buradandır. O, - Allah Təala ona rəhmət etsin! - 261 (875)-ci ildə Bistamda vəfat edib.

**(23) BAMYAN** - Uzunluq dairəsi -102°05', en dairəsi - 34º35'-dir. Xorasanla Qur arasında olan Qəznə nahiyəsidir. Çoxlu şəhərləri, kəndləri, dağları və çayları var. Orada yüksəkliyə qalxan, sütunlarında quşlar həkk olunan bina var. Orada nəhəng daşdan düzəldilmiş iki sənəm var. Civə mədəni var. Müdrik Əfzəl əl-Bamyani buradandır. O, müdrikliyin müxtəlif sahələrində məlumatlı idi. Onu Farsın sahibi atabəy Səd ibn Zəngi[1] öz yanına dəvət etdi və ölümünə qədər onun yanında idi.

**(24) BAĞŞUR** - Heratla Mərvərrudun arasında şəhərdir. Səyyid əl-Əbdal Əbülhüseyn Əhməd ibn Məhəmməd ən-Nuri

buradandır. O, xarabalıqda yaşayır və şəhərə yalnız cümə günləri gəlirdi. O, 295 (908)-ci ildə vəfat edib. Ən bilikli imam Mühyi əs-Sünnə Əbu Ömər* Hüseyn ibn Əhməd ibn Məsud əl-Fərra əl-Bəğəvi[1] də buradandır. Quranın təfsirində və Allah rəsulunun - Allah onu salamlasın! - Hədislərini bilməsində onun tayı-bərabəri yox idi. O, Xuccat əl-İslam əl-Ğəzalinin,[2] - Allah ondan razı olsun! - müasiri idi.

**(25) DƏYLƏM ÖLKƏSİ** - Qəzvinin yaxınlığında Cibaldadır. Ölkə dağ və dərələrdən ibarətdir. Orada yaşayanların çoxu dəyləmililərdir, bunlar da ən axmaq və ən cahil adamlardır. Onlar bir-biriylə müharibə edirlər. Əgər onlardan kimi isə öldürüblərsə, onda qatilin tayfasından kim gəldi öldürüləcək. Ləyaqətli hökmdar, mütəfəkkir və ədib Şəms əl-Məali Qabus ibn Vuşməgir buradandır.

**(26) BƏLX** - Uzunluq dairəsi -101°05', en dairəsi - 36°41'-dir. Xorasanın baş şəhərlərindəndir. Böyükdür. Şəhərin əsasını Mənuçöhr ibn İrəs ibn Əfridun qoyub. Əhalisi lovğalığı ilə fərqlənir. Orada Növbahar adlı çox böyük bütxana var. Onun uzunluğu - yüz dirsək, eni yüz dirsək, yüksəkliyi isə yüz dirsəkdən çoxdur. Bu bütxanaya Bərməkilər[1] xidmət edirlər. Buraya Hind və Sind padşahları gəlirdi. Gələndə, onlar bütün qabağında səcdə edir, Bərməkin əlindən öpürdülər. Bu ölkəni Bərmək idarə edirdi və Bərməkilər bir-birini Xorasan Osman ibn əl-Əffanın[2] vaxtında zəbt olunana qədər əvəz edirdilər. Bütxana xidməti islama meyl göstərən Bərmək ibn Xalidin əlinə keçdi. O, Osmanın yanına var-dövlətlə gedib şəhərin təhlükəsizliyini təmin etdi. Sonra Abdullah ibn Amir ibn Kurayz[3] bütün Xorasanı fəth edib [əl-Əhnaf Səhr ibn] Qeys ibn Heysəmi[4] Növbahara göndərir və bu da şəhəri dağıdır.

İbrahim ibn Ədhəm əl-İsli,[5] - Allah Təala ona rəhmət etsin! - buradandır. O, 161 (778)-ci ildə vəfat edib. Xorasanın böyük şəxslərindən və şeyxlərindən olan, Hatim ibn əl-Asammın[6] müəllimi Əbu Əli Şəqiq İbrahim əl-Bəlxi də buradandır. O, 194 (810)-cu ildə Kulanın alınması vaxtında şəhid olub. Əl-Vatvat[7] adı işə məşhur olan Əbdülcəlil ibn Məhəmməd ər-Rəşid də buralıdır. O, Xarəzm sultanının katibi idi. O, çox ləyaqətli və nəsrlə şerdə mahir idi.

**(27) BÜLLÜR** - Uzunluq dairəsi -108º05', en dairəsi - 37"05'-dir. Kəşmir yaxınlığında nahiyədir. Orada bir yerdə ildə üç

---

* Qəzvində - Əbu Məhəmməddir.

ay arası kəsilmədən qarla yağış yağır və buna görə günəş heç görünmür. Orada iki döşlü qadına oxşar bir sənəm var. Özünün uzun çəkən xəstəliyindən hər bir yorulan adam həmin sənəmi ziyarət edir və onun döşünün birinə əliylə toxunur. Döşdən üç damcı düşürdü. [Xəstə] bu damcıları su ilə qarışdırıb içirdi və bundan sonra ya sağalırdı, ya da ölürdü.

**(28) BUŞƏNC** - Xorasanda suyu, ağacları və bağları olan böyük şəhərdir. Böyük vaiz və qəribə natiq olan Mansur ibn Əmmar buradandır. Onun moizələri məşhurdur.

**(29) BAXƏRZ** - Xorasanda şəhərdir. Ləyaqətli və mahir ədib, gözəl şer ustası olan Əbülhəsən Əli əl - Baxərzi[1] buradandır. Ləyaqətli alim və şeyx Seyfəddin Səid əs-Sufi[2] də buralıdır. O, 655 (1257)-ci ildə vəfat edib.

**(30) BEYHƏQ** - Xorasanda şəhərdir. Sağlığında fiqhdə, hədislərin şərhində və üsulda tayı-bərabəri olmayan imam Əbu Bəkr Əhməd əl-Beyhəqi[1] buradandır.

(31) TƏBRİZ - Uzunluq dairəsi -82°05'; en dairəsi - 38°05'-dir. Ən şöhrətli və əhalisi çox olan şəhərdir. Sağlam iqlimli, münbit torpaqlı və suyu şirin olan yerdir. Möhkəm divarları və qəribə tikintiləri var. Bura Azərbaycanın paytaxtıdır. Orada çoxlu çaylar axır və şəhər bağların içindədir. Üçüncü dəfə şəhər 434 (1042-43)-cü ildə əmir Vəhsudan ibn Məhəmməd ər-Rəvvadi[1] tərəfindən bərpa olunub. Münəccimlər deyirdilər ki, şəhər türklər tərəfindən işğal olunmayacaq, çünki şəhərə Əqrəb bürcü kömək edir və şəhərin sahibi Cadiyyə bürcündə olan Mərrix ulduzudur.

Şəhər çox bərəkətlidir, meyvəsi də boldur. Əhalisi varlı və sənətkarlardır. Şəhərin yaxınlığında qəribə xeyirli kükürd hamamları var. Buraya xəstələr çox gəlir. Hamamlar Təbrizdən səkkiz fərsahlıq məsafədə olan Uçan şəhərindədir.

Təbrizin diqqətəlayiq yerlərindən sultan Ğazanın[2] tikdirdiyi [məqbərənin] tağıdır. Məqbərə mədrəsə və böyük binalarla əhatə olunub. Surxab dağının döşündə, şərq tərəfdə Rəşidəddinin[3] şəhristanı var. Orada hesaba alınmaz məscid, mədrəsə, saray və qəribə tikintilər var. İndi bura İlxanilərin paytaxtıdır.[*] Şəhərdən dörd fərsah aralı bir kənd və onun içində su çeşməsi var. Əgər bu suda həlim hazırlanıb içilsə, onun mədəyə təsiri olur, çünki əla işlətmə

---

[*] Bu abzas Qəzvində yoxdur.

dərmanı kimidir. Buraya camaat axışıb gəlir. Orada duzlu dağ var və buradan duz aparırlar.

Çoxlu əsəri olan alim Əbu Zəkəriyyə Təbrizi[4] buradandır.

**(32) TEHRAN -** Reyin böyük kəndlərindəndir. Çoxlu bağları və dadlı meyvələri var. Düşmənlərin qorxusundan əhalisinin yer altında zirzəmiləri var.

Orada elə gözəl nar var ki, başqa ölkələrdə onun bərabəri yoxdur.

**(33) CACƏRM -** Xorasanda, İsfərain yaxınlığında məşhur şəhərdir. Orada yerin altından boru ilə axan çeşmə suyu var. Həmin su ilə qoturluqdan xilas olunurlar.

**(34) CİBAL -** Kuxistan adı ilə tanınan məşhur nahiyədir. Şərqdə Xorasanın səhrası ilə, qərbdə -Azərbaycanla, şimalda - Xəzər dənizi ilə, cənubda - İraqa həmsərhəddir. Havasına, suyuna və torpağına görə bu ən sağlam nahiyələrdəndir. Təbiətinə görə əhalisi ən sağlam və gözəldir. Deyirlər ki, bu - ədaləti qəbul etməyən Xəyləmilər torpağıdır və onu idarə edənlər üsyançı olurlar. Sasanilər buranı özləri üçün yay iqamətgahına çevirmişlər, çünki bu yerlərin suyu şirindir. İraqda olan isti küləklər burada əsmir, oranın ılıq suyu və həşəratı da burada yoxdur.

Nahiyənin əsas şəhərləri İsfahan, Rey, Həmədan və Qəzvindir. Orada üzərində zövq verən bitkiləri olan Ərvənd dağı var. Həmin dağ Həmədanın üstündədir. Həmədanla Xulvan arasında Bisütun dağı var. Çox yüksək və əlçatmaz dağları, zirvəsinə də qalxmaq çətindir. Zirvədən tutmuş ətəyinə kimi bu dağ sanki yonulmuşdur, hamardır. Dağın enliyi 3 günlük [yol] qədərdir. Bisütunun yamacında daşdan yonulmuş eyvan var. Ortasında da Xosrov Pərvizin və mindiyi Şəbdiz adlı atın təsviri var. Eyvanın divarında Şirinin və onun yaxınlarının [təsviri] var. Bu təsviri Sinnimar oğlu Futrus həkk edib. Bu, Xiranın yanında olan Xavarnaqı tikən Sinnimardır. Bu həmin dağdır ki, onu Fərhad yarmaq istədi. O, həmin dağda bayraqlardan hündür olan iyirmi atlı üçün keçid çəkmişdir. O, dağı bütün günü yarır və [daşları] bütün gecə daşıyırdı. Bu əhvalat tarixlərdə yazılmışdır.

Reyin yaxınlığında zirvəsi ulduzlara çatan Dəmavənd dağı var. Deyirlər ki, bu, əlçatmaz bir dağdır, onun üzərinə nə qoyun dırmaşa bilər, nə də quşlar üstündən uçar. Çox yüksək və əzəmətli dağdır və üstündəki qar nə yayda əriyir, nə də qışda. İnsan onun zirvəsinə çıxa bilməz. Dağ Həmədanın keçidindən görünür və

Reydən baxana elə görünür ki, guya dağ onun üstündədir və aralarında [yalnız] iki fərsahlıq məsafə var.

Dağda kükürd çeşməsi var və onun ətrafında daşa dönmüş kükürd yerləşir. Elə orada Savə dağı var. Bu, çox yüksək dağdır. Daha sonra, Reylə Qumun arasında
olan səhrada Kərkəskuh dağı var. Sonra Nəhavənd dağı var və üzərində balıq və öküz şəklində iki tilsim var,

(35) CƏRBAZQAN - Uzunluq dairəsi - 85°25', en dairəsi - 24°05'-dir. İsfahanla Həmədan arasında Kuhistan ölkəsində olan kiçik şəhərdir. Divarları və içqalası var. Oranın hakimi heç vaxt heç bir padşaha baş əyməyib. Hakim çox möhkəm yerdə yaşayır, evinin möhkəm qapıları var və qorucuları da çoxdur. Buna görə padşahlar ona qarşı mərhəmətli olub deyirdilər ki, ona toxunmaq və onu narahat etmək insafsız olar.

Belə vəziyyət [Xarəzmşah] Rüknəddin ibn Məhəmmə Cibalı alana qədər çəkdi. Bu barədə hekayət var.

**(36) CURCAN** - Uzunluq dairəsi - 90°05', en dairəsi - 36 50'-dir. Təbəristan yaxınlığında böyük və məşhur şəhərdir. Aralarında gəmilər üzən çay axır. Orada həm isti, həm də soyuq ölkələrin meyvələri olur. Şəhər düzənlə dağın və sahillə dənizin arasındadır. Orada xurma, zeytun, nar, limon, şəkər qamışı və hamı üçün ucuz olan, düzəndə və dağlarda yetişən meyvə və giləmeyvə var. Oranın əhalisi kasıbdır. Bura - dənizdə və quruda uçan quşların toplaşdığı yerdir. Lakin buranın iqlimi çox pisdir. Əli [ər-Rizanın],[1] - Allah Təala ondan razı olsun! - övladından birinin məqbərəsi buradadır. İranlılar onu Kuhe Surh adlandırırdılar. Bura məşhəddir.

Quranın oxunuşunda ən nəcib və sabit olan və hər gün onu üç dəfə başdan-başa oxuyan Kuraz ibn Vəbərə, - Allah Təala ona rəhmət etsin! - və bəyan elmində arif olan imam Əbdültahir[2] buralıdırlar. Əbdül-qahir «Kitab fi enaz əl-Quran» adlı kitabın müəllifidir.

**(37) CƏZİRƏ** - Özünə Diyar-Bəkri və Diyar Rəbiəni daxil edən ölkədir. Buranı Cəzirə («Ada») ona görə adlandırırlar ki, ölkə Dəclə ilə Fəratın arasındadır. Bu iki çayın suları Rum ölkəsindən başlayaraq yan-yana axır və axırda Fars dənizinə tökülürlər. Buranın baş şəhəri Mavsildir. Xarran və Mavsildən yuxarıda yerləşən Cəzirət [ibn Ömər] də bu ölkənin [şəhərlərindəndir]. İkinci şəhəri Dəclə öz suları ilə əhatə edir. Buraya yalnız bircə yolla daxil olmaq

mümkündür. Bu ölkənin xüsusiyyəti ondadır ki, burayda çoxlu çiban çıxır.

**(38) CAUHƏBƏ** - Həmədanın kəndlərindəndir. Bəhram Kurun qəsri buradadır. Bu bircə daşdan tikilmiş çox əzəmətli qəsrdir. Bütün otaqları və başqa yerləri - hamısı bir daşın içərisindədir. Sayı çox olan zal və eyvanları var və bunlar keçmişdə yaşayan İran şahlarından və təqdirə layiq həyatlarından xəbər verirlər.

**(39) CÜVEYN** - Xorasanla Kuhistanın arasında bərəkətli və bol məhsullu nahiyədir. Orada dörd yüz kənd var və hərəsində yüksək yerlərdə qazılmış quyu var. Kəndlərin özləri düzənlikdə, bir-birinin yaxınlığındadır.

Məkkə və Mədinənin imamı olan Əbülməali Əbdülməlik ibn Məhəmməd[1] - buralıdır. Geniş biliklərdə və bəlağətdə onun kimisinə insanlar rast gəlməyiblər. O, iyirmi cildlik «Nihayət əl-mətləb» adlı əsər yazıb. O, 488 (1095)-ci ildə vəfat edib.

Sahib əs-Səid Şəmsəddin Məhəmməd ibn Məhəmməd[2] də buralıdır. O, ləyaqətli və ağıllı vəzir idi. Onu 683 (1284)-cü ildə öldürüblər.

**(40) CİLAN (GİLAN)** - Qəzvinlə Xəzər dənizi arasında cəngəllikdir. Dağların və dərələrin, meşələrin və suların çoxluğundan oraya daxil olmaq çətindir. Oranın hər bir guşəsinin heç kəsə tabe olmayan öz hakimi var. Onların arasında arası kəsilməyən müharibələr gedir. Oralarda çoxlu yağış yağır. Bəzən yağış qırx gün yağır. Evləri ağacdandır. Qadınları çox gözəldir və üzlərini kişilərdən gizlətmirlər. Orada çox gözəl yorğa atlar var. Oranın əhalisi barama becərməkdə və ipək parça toxumaqda çox mahirdir. Orada əla düyü əkirlər.

**(41) XİSN ƏT-TAQ** - Təbəristanda möhkəm qaladır. Qədimdə burada İran şahlarının xəzinəsi saxlanılırdı. Buranı bina etdirən İrəc oğlu Mənuçöhrdir. Bura yüksək dağın altından çəkilən və yolu çətin olan yerdir. Giriş yolu kiçik darvazaya oxşardır. Adam oraya girəndə bir milə yaxın qaranlıqda yol gedir, sonra da hər tərəfdən dağlarla əhatə olunan, açıq, şəhərə oxşar yerə gəlib çıxır. Bu yerdə mağara və zağalar var və aralarında bol suyu olan çeşmə var və onun suyu bir dəlikdən çıxıb başqa dəliklə yenə də yerin altına gedir. Dəliklərin arasında on dirsək məsafə var.

**(42) XULVAN** - Uzunluq dairəsi - 82º45', en dairəsi - 34°05'-dir. Həmədanla Bağdad arasında şəhərdir. Əvvəlcə şəhər

məskun olub abad idi indi isə xarabadır. Ətrafında bəzi xəstəliklərdən xilas edən çoxlu kükürd çeşmələri var.

**(43) XƏYZAN** - Çoxlu bağları və axar suları olak Diyar-Bəkr ölkəsində Əsərtin yaxınlığında kiçik şəhərdir. Orada elə şabalıd var ki, ona bənzəri nə Cəzirədə, nə Şamda, nə də İraqda var. Orada fındıq da çoxdur.

**(44) XAVƏRAN** - Xorasanda çoxkəndli və bərəkətli bir nahiyədir. Sufilər təriqətini yaradan şeyx Əbu Səid ibn Əbülxeyr[1] buralıdır. O, xanəgah tikdirib, süfrəsini də təyin etmişdi. Gözəl şerləri olan şair həkim əl-Ənvəri[2] də buradandır.

**(45) XORASAN** - Şərqdə Mavəraçinəhrlə, qərbdə Kuhistanla həmsərhəd olan məşhur ölkədir. Əsas şəhərləri Herat, Mərv, Bəlx və Nişapurdur. Bura Allahın ən gözəl, ən sağlam və ən bərəkətli ölkələrindəndir. Əhalisi ən gözəl, ağıllı, xoşxasiyyətli və dinlə - elmdə qeyrətlidir.

Orada eyvana oxşar mağarası olan Gülüstan dağı var. Mağarada olan dəhlizin axırında ağıla oxşar bir hasar var və burada bulaq axır. Onun suyu bərkiyib, dəyənək şəklində daşlara dönür. Hasarın içində yerdə bir dəlik var və buradan elə iyrənc qoxu gəlir ki, içərisinə daxil olmaq qeyri-mümkündür.

Mərvdə Zarnit adlı kanal var, sahilləri boyu bağlar, əkinlər və dəyirmanlar yerləşir. Həmin dəyirmanların birində Osman ibn əl-Əffanı, - Allah ondan razı olsun! - vaxtında Sasani şahlarından axırıncısı Yəzdicird ibn Şəhriyar ödürülüb.

Orada quşlarda olduğu kimi ikiqanadlı uçan tülkülər var. Ceyran balasına oxşar müşk siçanı da var.

Ləyaqətli insan və möcüzələr yaradan şeyxlərdən olan Həbib əl-Əcəmi buralıdır. 237 (851)-ci ildə vəfat edən Əbu Əbdürrəhman Hatəm ibn Yusif əl-Əcəm də buralıdır.

**(46) XƏRQAN** - Bistam yaxınlığında şəhərdir. Aralarında dörd fərsahlıq yol var.

Şeyx Əbülhəsən əl-Xərqani[1] buralıdır. Onun qəbri də buradadır. Buraya gələnlər qəbzlik azarına tutulur.

**(47) XUVAF** - Xorasanda, Nəsənin yaxınlığında, əhalisi çox olan şəhərdir. Burada çoxlu kənd, bağ və axar sular var. Öz kamilliyi ilə, xüsusən dialektikada, məşhur olan imam Əbdülmüzəffər əl-Xuvafi buralıdır. O, Məkkə və Mədinənin imamı Əbdülməali ki, bunlar da birləşib Xabur çayına dönürlər. Bulaqların

ən məşhuru - Eyn əs-Sərrardır. Elə şəffafdır ki, dibində olan daşlar görünür. Dərinliyi on dirsəkdən çoxdur.

**(60) RƏXBAT ƏŞ-ŞAM** - Uzunluq dairəsi - 74°35", en dairəsi - 34°40'-dir. Məşhur şəhərdir. Aşkar möcüzələr yaradan Əbu Hamid ər-Rəxbi buradandır.

**(61) RUDBAR -** Cibal torpağında nahiyədir. Başdan-başa kəndlərdən, qalalardan, düzənlik və dağlardan, meşə və axar sulardan ibarətdir. Əhalisi deyləmilərdir. Bura Bağdadda yaşayan Əbu Əli Əhməd Rudbarinin vətənidir. O, Cüneydi müşayiət etmiş və 722[*] (1322)-ci ildə Misirdə ölmüşdür.

**(62) RUDRAVƏR -** Həmədandan üç fərsah aralı şəhərdir. Ona bağlarla əhatə olunmuş su arxları va taxıl zəmiləri olan doxsan üç kənd tabedir. Hər cür meyvəsi var. Buranın torpağında zəfəran becərirlər.

**(63) RUYAN** - Mazandaranda, Təbəristanla Xəzər[1] dənizinin arasında nahiyədir. Bura batinilərin küfrü haqqında birinsi qərarı çıxaran imam Fəxrülislam Əbülməxasin Ruyaninin, - Allah ona rəhmət etsin! - vətənidir. Onu fədailər[*] öldürdülər.

**(64) REY** - Uzunluq dairəsi - 86º20', en dairəsi - 35°35'-dir. Ölkənin bərəkətli və gəliri çox olan baş şəhərlərindəndir. Çox məşhurdur. Bu qədim şəhər Kəyumərsdən sonra hökmranlıq edən Huşəng tərəfindən bina olunmuşdur. Amma deyirlər ki, şəhəri [Raz ibn] Xorasan bina etdirib. Çünki burada yaşayanların mənsubiyyəti Razidir. Şəhər düzənlikdədir. Yaxınlığında üzərində heç bir şey bitməyən yalın dağ var. Dağın adı Təbərəkdir. Deyirlər ki, orada qızıl mədəni var amma qızılın istehsalı baha olduğu üçün mədən atılıb.

Şəhərin bütün binaları yerin altındadır, zülmət içindədir və oraya girmək çətindir. Əhali bu yeraltı binaları düşmən basqınlarına görə tikiblər. Şəhər padşahın daim qaldığı yeri olduğu üçün burada çoxlu dəfinə var. Hərdən bir bunlar aşkar olunur. Buranın havası, xüsusən payızda, zəhərlənmiş oxlara bənzəyir və əsasən bunlar gəlmələrə dəyir. Meyvələri çoxdur və ucuzdur. Orada məllahi adlı üzüm növü var və salxımının vəzni yüz rətl və bəlkə də çox olur. Rey əhalisinin arasında ölüb-öldürmə və qan tökmə əhvalatları olur.

---

[*] Qəzvində 322-ci ildir.
[*] İsmaililər.

Zəmanəsinin imamı, nadir insanı və möcüzəsi, ən bilikli imam Fəxrəddin Razi, yəni Əbu Abdullah Məhəmməd ibn Ömər ər-Razi[1] buradandır.

Allah Rəsulunun, - Allah onu salamlasın! - adından İbn Hüreyrə[2] və onun adından Əbülqasim Əli ibn əl-Həsən ibn Əsakir[3] deyir ki, Peyğəmbər buyurub: «Allah yüz ildə bir dəfə bu ümmətə onun dinini yeniləşməsi üçün adam göndərir». Və o dedi: «hicrətin birinci yüzilliyində bu, Ömər ibn Əbdüləziz,[4] ikincisində - Məhəmməd ibn İdris [əş-Şafei], üçüncüsündə - Əhməd ibn Şüreyh, dördüncüsündə - Əbu Bəkr əl-Bağillani,[5] beşincisində - Əbu Həmid əl-Ğəzali, altıncısında - 606-cı ilin İbn əl-fitr bayramı (I şəvval) günündə (29. III. 1210), Heratda vəfat edən Məhəmməd ibn Ömər ər-Razi idi». Cüneydin və Səvrinin arxadaşı olan Əbu İshaq İbrahim ibn Əhməd əl-Xəvvas; öz vaxtının şeyxi, əl-Lisan fi-l-vağz və-l-qəbul ində-n-nas adlı əsərin müəllifi, Əbu Yəzid əl-Bistamiyə yaxın olan Yəhya ibn Müaz ər-Razi[6] və tibb elminin ustadı, ləyağətli Abu Bəkr Məhəmməd ibn Zəkəriyyə ər-Razi7 də buralıdırlar.

**(65) RƏVAVƏ** - Xorasanda dairədir. Məşhur insan, təəccüblü işlər görən şeyx Heydər buradandır. Yayda o, odun, qışda isə qarın içinə girirdi. Şeyx, tatarlar islam ölkələrinə 617 (1220)-ci ildə soxulana qədər sağ idi.

**(66) ZƏNCAN** - Uzunluq dairəsi -83°40', en dairəsi - 36°30'-dir. Rum və Xorasan yolunda, Cibalda, Əbhərlə Xalxal arasında məşhur şəhərdir. Şəhərin əhalisi çox hazırcavabdır. Ətrafında dəmir mədənləri var. Əgər əhalidə çörək qıtlığı əməl gəlirsə, onlar çörəyi dəmirə dəyişdirirlər.

**(67) SAVƏ** - Uzunluq dairəsi -85°05', en dairəsi - 36°30'-dir. Düzənlikdə yerləşən bərəkətli, meyvəsi və ağacları böl olan gözəl şəhərdir. Qədimdə şəhər göl kənarında idi. Peyğəmbərimiz, Allah rəsulu Məhəmməd, - Allah onu salamlasın! - dünyaya gələndə bu gölün suyu yox oldu. Şəhər əhli gözəlliyi, xoş əxlaqı, ölçüləri bilməyi və oxumağı ilə fərqlənir. Bunlarda hətta qadın və uşaqları da mahirdirlər. Əhalinin hamısı imam əş-Şafeinin, - Allah Təala ondan razı olsun! - məzhəbindəndir.

Orada cümə məscidinin qapısı üzərində Xosrovun tacına bənzər yüksək tağ var. Hər iki yanında çox yüksək iki minarə var. Başqa ölkələrdə buna oxşarı yoxdur. Möcüzələrindən - orada bitən

ağacların üstündə yeddi ildən bir şir Həştin* əmələ gəlməsidir. Xüccət əl-İslam əl-Ğəzalinin müasiri olan ədib, fakih, həkim və qazi Ömər ibn Səhlan[1] buradandır.

**(68) SƏRAXS** - Uzunluq dairəsi -94°30', en dairəsi - 36°05'-dir. Mərvlə Nişaburun arasında olan şəhərdir. Onu Səraxs ibn Cudarz bina etdirib. Böyük, əhalisi çox olan, varlı və bərəkətli şəhərdir. Yayda buranın suyu quyulardan çəkilir. Əhalisi zərli sarıq və örtüklərin toxunmasında mahirdir.

**(69) SALMAS** - Uzunluq dairəsi -79º15',en dairəsi - 37°40'-dir. Azərbaycanda, Mərəndlə Urmiyanın arasında şəhərdir. Bol taxılı və balı var. Orada bir su var: əgər qoturu və ya cüzamı olan kimsə burada yuyunsa, o saat sağalar.

**(70) SƏMİRAM** - Uzunluq dairəsi -85°40', en dairəsi - 30°15'-dir. İsfahanla Şirazi arasında dairədir. Orada bir bulaq var, onun suyu çəyirtkədən xilas edir. Çəyirtkələr yerə enəndə bu sudan gətirib yeri sulayırlar. Suyun üzərinə çoxlu quşlar gəlib çəyirtkələri yeyirlər. Amma iki şərti var: gərək su ilə dolu qab yerə qoyulmasın və suyu yerə tökən adam geriyə baxmasın.

**(71) SUNABAD** - Tusdan bir mil aralı kənddir. [Xəlifə] Harun ər-Rəşidin[1] qəbri buradadır. Xəlifə əl-Məmun onunla birlikdə Xorasanda idi. Harun ər-Rəşidin və Əli ibn Musa ər-Rizanın qəbirlərini o, bir türbədə yerləşdirdi. Bu kəndin əhalisi şiələrdir. Onlar ər-Rizanın hesab etdiyi qəbiri həddindən artıq bəzəyirlər. Lakin bu, xəlifənin qəbridir. Bunu əl-Məmun edib.

**(72) SULTANİYYƏ** - Uzunluq dairəsi - 84°05' en dairəsi - 36°29'-dir. Bu Cibalda, Qəzvinlə Zəncanın arasında yeni şəhərdir. Onu 705 (1305-06)-cı ildə sultan Ulcaytu Məhəmməd ibn Ərğun-xan[1] bina etdirib. Bu, Allahın ən şöhrətli şəhərlərindəndir. Təmiz Havası, dadlı suyu və bərəkətli torpağı var. Çox əcaib tikintiləri var. Orada hər hakimin qəsri var, hər əmirin və vəzirin evi var. Şəhərin gözəl bazarları və sultanın mədrəsələri var.

Orada, qalanın ortasında ucalan qübbə və kənarında eyvan var. Behişt bağlarına bənzər bağlarına görə buranın yayı dünyada ən gözəldir. Qışda burada elə soyuqdur ki, əhalinin çoxu şəhərdən çıxıb gedir. Burada bütün yay və qış meyvələr bitir, yazda və payızda isə onlar yetişir. Buranın suyu quyulardan və kəhrizlərdəndir, çox şəffaf, şirin və dadlıdır. Şəhərin ətrafları bağlı-bostanlıdır.

---

* Bəzi bitkilərin dondurulmuş şirəsi.

Burada bütün dünyanın möcüzələri toplanıb. Şəhərin yanında sultan Əbu Səid[2] gözəl bina tikdirdi, lakin tikinti işləri qurtarmamış o, vəfat etdi və indi bura onun məqbərəsidir.

Qədimdə şəhərin yerində (böyük şahların Şərviyazak adlı yay iqamətgahı olub və heç bir başqa ev və tikinti yox idi. Allah Təala buranı məskun etdirdi.

**(73) SƏNCƏR** - Uzunluq dairəsi -76°05', en dairəsi - 35°05'-dir. Cəzirədə, Nisibinin yaxınlığında, yüksək dağın altında yerləşən şəhərdir. Çox gözəl şəhərdir, bol suyu, bağları və evləri var. Elə bil ki, kiçik Dəməşqdir. Şəhər hamamları gözəldir və tutumludur. Döşəməsi yastı daşlardandır. Hər borunun altında daşdan düzəldilmiş səkkizguşəli hovuz, damlarında isə rəngli camlar var. Deyirlər ki, Nuhun, - ona salamlar olsun! - gəmisi Səncər dağına altı aylıq və səkkiz günlük yoldan sonra oturub və bu dağ Nuhun, - ona salamlar olsun! - xoşuna gəldi. Burada o gördü ki, su çəkilməyə başladı və dedi: «Bu dağ mübarək olsun!» Burada gözəl şəhər əmələ gəldi, çoxlu xurma, portağal, limon ağacları əkildi, sular axdı, bağlar salındı.

Bura - sultan Səncərin[1] vətənidir və [şəhər] onun adını daşıyır. Yaxınlıqda Misir valisi əl-Abbas ibn Abdullahın[2] qəsri yerləşir. Çox əcaib tikintidir, bağların və arxların üzərində ucalan görkəmli bir yerdədir. Bura - hökmdarların iqamətgahı idi. Onların arasında Qarvaş ibn əl-Müqəlləd,[3] Seyfüddövlə Əli ibn Abdullah ibn Həmdan[4] [bunu əl-Mütənnəbi[5] mədh edirdi] və başqaları var idi.

**(74) SÜHRƏVƏRD** - Cibalda, Zəncanın yaxınlığında şəhərdir. Şihabəddin Əbülfəth Məhəmməd ibn Yəhya[1] buradandır. O, alim, həkim, dünyanı tərk etmiş zahid və möcüzələr yaradan bir adam idi. O, Fəxrəddin ər-Razinin, - Allah ona rəhmət etsin - müasiri idi.

**(75) ŞƏHRƏZUR** - Uzunluq dairəsi - 82°20' en dairəsi - 34°30'-dir. Cibalda, İrbillə Həmədanın arasında yerləşən dairədir. Şəhər və kəndləri var. Əhalisi quldur kürdlərdir. Allah İsrail oğullarına hökmdar göndərdiyi Talut buradandır. Orada bir dağ var ki, üzərində cinsi ehtiras yaradan dərman düzəltmək üçün əz-zalam adlı toxum bitir. Beləsi başqa yerdə yoxdur.

**(76) ŞƏHRƏSTAN** - Xorasanda, Nisaburla Xarəzm arasında, qumlu səhrada bir şəhərdir. Buranın bağları şəhərdən uzaqdadır. Küləklər qumluqları bir yerdən o biri yerə keçirir və qum da su kimi axır. Kitab əl-Miləl və-n-nihəl adlı əsərin müəllifi əş-

Şəhrəstani[1] buradandır. O, layiqli adam, alim və ilahiyətçi idi. Deyirlər ki, o, Xira olan yerə gəlmiş...[*]

**(77) ŞİZ** - Azərbaycanda, Marağayla Zəncanın arasında yerləşən şəhərdir. Orada qızıl, gümüş, arsen, civə və qurğuşun mədənləri var.[1]

Atəşpərstlərin peyğəmbəri Zərdüşt[2] buradandır. Deyirlər ki, o, insanlardan ayrılıb Savaqan [dağına] gedib. Sonra Löhrasb oğlu Güştasbın yanına gəlib ona peyğəmbərliyini bəyan etdirib. Güştasb da onun dəvətini möcüzədən sonra qəbul edib. Zərdüştün üstünə ərimiş misi töküb onu sınaqdan çıxardılar. Mis ona heç bir zərər gətirmədi.

**(78) TƏLİQAN** - Uzunluq dairəsi - 85º15' en dairəsi - 36°10'-dir. Kuhistanda, Dəyləm dağlarında, Qəzvinlə Cilanın arasında çoxlu kəndi olan diyardır. Orada zeytun və nar bitir.

Raziəddin adlı Əbülxeyir Əhməd ibn İsmayıl buradandır. O, layiqli insan və açıq möcüzələr yaradan idi.

**(79) TƏBƏRİSTAN** - Mazandaran adlanan, Rey, Qumis və Xəzər dənizi arasında məşhur ölkədir. Çoxlu çayları və meşələri var, lakin iqlimi sağlam deyil. Orada barama qurdu saxlayırlar və çoxlu ipək əldə edib müxtəlif ölkələrə aparırlar. Orada əl-xələnc ağacı bitir. Ondan qab-qacaq və boşqablar düzəldirlər. Orada çox incə örtüklər və örpəklər hazırlanır.[1]

Orada elə bir ağac var ki, əgər onun bir parçasını suya atsan, balıqlar ölüb suyun üzərinə qalxarlar.

Təfsirin və Qarixin müəllifi imam Əbu Cəfər Məhəmməd ibn Cərir ət-Təbəri[2] və Əbu Həmid əl-Qəzalinin xələfi olan layiqli insan və alim Əbülhəsən əl-Kiya Kəhrasb buralıdırlar. Bu, xəlifə ən-Nasirlidin Allahın[3] vaxtında Nizamiyyə mədrəsəsində müdərris idi.

**(80) TƏBƏS** - Uzunluq dairəsi -92°05', en dairəsi - 33°05'-dir. İsfahanla Nisaburun arasında məşhur şəhərdir.

Kitab əş-şamil fi təsxir əl-cin adlı əsərin müəllifi Fəxr əl-Əimmə Əbülfəzl Məhəmməd ibn Əhməd ət-Təbəsi[1] buradandır. Kitabında o, cinləri necə tabe etməkdən danışır. O, Əbu Həmid əl-Qəzalinin müasiri idi.

**(81) TƏRSUS** - Uzunluq dairəs -68°40', en dairəsi - 36°12'-dir. Antakiya ilə Hələbin arasında şəhərdir. Tərsus ibn ər-Rum ibn əl-Yaqan ibn Sam ibn Nuhun, - ona salamlar olsun! - adını

---

[*] Mətn natamam qalıb.

daşıyır. Harun ər-Rəşid buraya gələndə buranın binalarını bərpa edib, kanal çəkdirmişdi. [Şəhərin] divarları və xəndəyi var. Şəhər Rum padşahı hücum edib alana qədər, müsəlmanların sərhəd qalası idi. [Xəlifə] əl-Məmun burada vəfat edib.

**(82) TƏSUF** - İsfahan yaxınlığında şəhərdir. Əhalisi fil sümüyündən və ebenos ağacından gözəl şeylər hazırlamaqda mahirdir. Bu şeyləri başqa ölkələrə aparırlar. Başqa yerlərin ustaları bu sənətdə acizdirlər.

**(83) TAMĞAC** - Türklər ölkəsində böyük şəhərdir. Onun ətrafında iki dağ arasında olan dərənin içində yerləşən çoxlu kənd var. Oraya yol təkcə bu dərənin içindəndir. Orada qızıl mədəni var. Əhalisinin saçı seyrəkdir. Nə kişilərin, nə də qadınların bədənlərində tük yoxdur. Qadınlarının bir xüsusiyyəti var: hər dəfə cinsi əlaqədən sonra onlar yenə də bakirə qalırlar.

**(84) TUS** - Uzunluq dairəsi - 92°30', en dairəsi - 37°05'-dir. Xorasanda, Nişaburun yaxınlığında məşhur şəhərdir. Ətrafında çoxlu kənd, axar sular, bağ və bostanlar var. Dağlarında firuzə mədənləri var. Firuzədən cürbəcür qablar düzəldirlər.

Vəzir Nizamülmülk əl-Həsən ibn Əli ibn İshaq buradandır. Onun dami qüdrətli, xeyirxah və gözüaçıq vəzir yox idi. Allah da ona kömək edirdi. O, incidilmişin haqqını incidəndən qeyrətlə tələb edirdi xəstə idi və İsfahandan onu xərəklə gətirirdilər. Nəhavəndin Qaydascan kəndinə gələndə qabağına bir şəxs çıxıb: «İncidilmiş, incidilmiş!» - deyə bağırır. Vəzir deyir: «Bir baxın, onu kim incidib?» O adam dedi: «Yanımda vəzirə verəcək məktubum var!» həmin adamı vəzirin yanına gətirəndə o, hücum edib vəziri bıçaqla vurur. Bu əhvadat cümə axşamı, 485-ci il ramazan ayının 11-də[*] (14. X. 1092) olub. Vəzirin meyidini İsfahana gətirib tikdirdiyi mədrəsədə dəfn etdilər.

İmam Xüssət əl-İslam Əbu Həmid Məhəmməd ibn Məhəmməd əl-Qəzali buradandır. Dünyada onun kimi bilikli, işgüzar, fərasətli və ağıllı adam olmayıb. O, öz tay-tuşlarından üstün idi. Məkkə və Mədinənin imamının[1] şagirdlərindən Nizamülmülk onu seçib Bağdaddakı Nizamiyyə mədrəsəsinə müdərris təyin etir. Sonra o, həccə gedir və dünyəvi işlərdən uzaqlaşır. O, zahidliyi seçərək Şama getdi. O, «Kitab ehya ülum əd-din» əsərini yaradıb.

---

[*] Qəzvində - ramazan ayını 21-dir.

Sonra o, Xorasana qayıdıb Allah yolunda səylə çalışır və 505 (1111)-ilində əlli dörd yaşında Tusda vəfat etdi.

Açıq-aşkar möcüzələr yaradan onun qardaşı Məlik əl-Abdal Əhməd ibn Məhəmməd əl-Qəzali[2] də buradandır.

Müdrik Firdovsi də buralıdır. O, Tus dehqanlarından idi. O, altmış min beytdən ibarət olan və müdrik kəlamları, nəsihətləri, gələcəkdən xəbər verməyi, arzuları və xəbərdarlıqları əhatə edən Kəyumərsdən Şəhriyar oğlu Yəzdəcirdə qədərki dövrü işıqlandıran «Şahnamə» adlı şer kitabını yazıb.

Əllamə, imam və xoca Nəsirəddin Məhəmməd ət-Tusi[3] də buradandır. Dəqiq elmlərdə ona çatan yox idi. O, 672-ci ilin zülhüccə ayında (8. VI-6. VII. 1274) Bağdadda vəfat edib.

**(85) AKKA -** Urdu dairələrinin birində, Şam dənizinin sahilində yerləşən şəhərdir. Sahilin ən gözəl və ən çiçəklənən şəhəridir. Çoxlu istehkamları var. İbn Tulun[1] buraya gəlməsindən əvvəl istehkamları yox idi. İbn Tulun əvvəlcə Sur şəhərini və onun divarlarını görüb Akka üçün də bunları tikmək istədi. Orada, Adəmin yanına gələn «Öküzün bulağı» var. Həmin öküzlə o, yer şumlayardı. Bu, uğurlu bulaqdır və onu camaat ziyarət edir.

**(86) ABDULLAHABAD -** Qəzvinlə Həmədanın arasında bir kənddir. Orada başqa yerlərdə ona oxşarı olmayan hamam var. Onun isti suyu fəvvarə kimi insan boyu hündürlüyünə qədər yuxarıya vurur. Əgər bu vuran suya bir yumurta salsan yumurta elə o an bişər. Sonra [su] hovuza yığılır və şikəstlər buraya müalicə üçün gəlir və suda çimib xeyrini görürlər.

**(87) QUR -** Heratla Ğəznə arasında əhalisi çox olan vilayətdir. Çoxlu bağ-bostanı və bulaqları var. Torpağı münbitdir. Dağlar, vilayəti qala divarları kimi hər tərəfdən əhatə edir. Vilayət ərazisindən Herat çayı axır. Buranın çox soyuq iqlimi var. Orada siçana bənzər Səməndər heyvanı var. O, odun içinə girir, lakin yanmayır. Onun dərisindən şahlar üçün yaylıq düzəldirlər. Bu yaylıqlar çirklənəndə, onları odun içinə atırlar və odda bunları təmizləyir.

Bilikli, ədalətli və bütün döyüşlərində və müharibələrində qalib olan hökmdar Ğiyasəddin Əbülfəth Məhəmməd ibn Sam[1] buradandır.

**(88) FƏRƏHAN -** Həmədan [dairəsində] məşhur kənddir. Orada əcaib, suyu şor göl var. Səthi dörd fərsah dördədir. Onun

xüsusiyyətlərindən biri budur: su göldən çıxdıqca göl quruyur. Əgər suyun çıxmasına bir maneə olsa, onda su duzlu daşa dönür.

**(89) FƏNƏK** - Cəzirət əl-Ömərdən iki fərsah aralı olan, yüksək dağın zirvəsində bir qaladır. Qalanın üstündə qayadan [oyulmuş] və özünə görə ayrıca [qalaya] çevrilmiş bir bürc var. Bu qala Bəşnəvi kürdlərin* əlindədir. Bu kürdlərdə şücaət və qəbilələrinə bağlılıq adətidir və onlar özlərindən kömək istəyən hər kəsə qəyyumluq edirlər.

**(90) QAŞAN** - Uzunluq dairəsi -86º05', en dairəsi - 34°05'-dir. Qumla İsfahan arasında şəhərdir. Əhalisi - şiələr, imamilərdir. Onlar xaricə aparılan cürbəcür şeylər və qablar hazırlanmasında mahirdirlər. Orada çox dadlı əriklər yetişir. Bunu qurudub hədiyyə kimi bütün ölkələrə aparırlar. Orada başqa yerlərdə olmayan iyrənc böyük əqrəblər var.

**(91) QİRMİSİN** - Uzunluq dairəsi - 83°57', en dairəsi - 34°30'-dir. Həmədanla Xulvanın arasında Kermanşahanın yaxınlığında, zəvvarlar yolunda şəhərcikdir. Deyirlər ki, Firuz oğlu Qubad ölkə ilə tanış olanda o, Mədainlə Bəlxin arasında havasına, suyuna və torpağına münbitliyinə görə Qirmisindən yaxşı yer tapmadı və buranı məkun etdirdi. Orada o, qala tikdirib, adını Qəsr əl-Lalus qoydu.

Möcüzələrindən - uzunluğu və eni yüz dirsək və hündürlüyü - iyirmi dirsək olan qaladakı skamyadır. Daşları yonulmuş və bir-biriylə dəmir qullablarla elə bərkidilib ki, daşın biri harada qurtarır və ikincisi haradan başlanır müəyyən olunmur. Baxana elə görünür ki, bu bütöv bir daşdır. Xosrov Pərvizin vaxtında buraya bütün dünyanın padşahları toplanırdı.

**(92) QƏZVİN** – Uzunluq dairəsi -85º05', en dairəsi - 37º05'-dir. Bağlı-bostanlı, münbit torpağı olan, düzəndə tikilmiş məşhur çiçəklənən şəhərdir. Cibal ölkəsində fərəhli şəhər və diyardır. Qəzvin üzbəüz olan iki şəhərdən ibarətdir. Onu bina etdirən Şabur Züləqtaf olub. Harun ər-Rəşid Xorasana gedəndə bu yerdən keçərkən şəhəri əzəmətli divarlar əhatə edirdi. Məscidi isə burada 154 (770-771)-ci ildə tikiblər.

Möcüzələrindən - məscidin qarpıza oxşar çox yüksək maqsurasıdır. Bənzəri başqa ölkələrdə yoxdur. Orada başqa bir

---

* Yaqut Həməvidə: «Şimali Mesopotamiyada olan Zavazanda yaşayan kürdlərdir» kimi gedir.

möcüzə də var: ildə bircə dəfə sulanan bağlar. Möcüzələrindən - yəhudi qəbiristanlarıdır. Əgər yerli heyvanlarda mədə ağrıları olursa, onları buraya gətirirlər və ağrılar kəsilir. Belə bir adət Təbrizdə də var.

Şaban adı ilə tanınan şeyx Əbu Bəkr buradandır. O, çox ləyaqətli bir insan idi və zahidlər axışıb yanına gəlirdilər. Şeyx Əbülqasim Məhəmməd ibn Əbdülkərim ər-Rafii də buralıdır. O, Quranın şərhində, hədislərdə, fiqhdə və ədəbdə mahir alim idi. Onun çoxlu yaxşı əsərləri var. O, 623 (1226)-cı ildə təxminən altmış yaşında vəfat edib.

**(93) QƏSRAN -** İki hissədən – Daxili Qəsran və Xarici Qəsrandan ibarət olan Rey kəndlərinin birinin adıdır. Vaxtında həndəsədə tayı-bərabəri olmayan Yaqub ibn Əli əl-Qəsrani buradandır. O, həndəsəyə aid kitabların müəllifidir.

(94) QƏSR - İ ŞİRİN - Bağdadla Həmədanın arasında, düzəndə, Xabur çayını sahilindədir. Şəhəri Xosrov Pərviz öz nişanlısı Şirin üçün tikdirmişdir. Şirin Allah Təalanın ən gözəl məxluqlarından idi. Xosrov Pərviz bir adam göndərib onu qaçırdır və o, Şəbdiz adlı atı minib Xosrovun yanına gəlir. Xosrov bu yerdə, çayın sahilində onun üçün qəsr tikdirdi.

**(95) QUM -** Uzunluq dairəsi - 35°40', en dairəsi - 34°45'-dir. Cibalda, Savə ilə İsfahanın arasında şəhərdir. Həccəc ibn Yusifin vaxtında bina olunub. Əhalisi - qatı şiələrdir. İndi şəhərin çox hissəsi xarabalıqdır. Suları quyulardandır və əsasən şordur. Orada suvarma şəbəkələri boyunca bağlar yerləşir və əsasən püstə və fındıqlıqdır. Orada, bir qayalıqda Balinas tərəfindən tilsimlənmiş duz mədənləri var. Elə ki, buradan axan su heç vaxt kəsişmir. Su duza dönür və buradan keçən hər şəxs özü üçün istədiyi qədər duz götürür. Orada insanlardan gizlənən qızıl və gümüş mədəni var. Ona görə gizlədirlər ki, insanlar əkinçiliyi və torpağın becərilməsini atmasınlar. Ora da ilanların və əqrəblərin əleyhinə tilsim var. İlanlar və əqrəblər buna görə bir dağa toplaşıblar və heç kəs indiyə qədər ilanlarla əqrəblərin çoxluğundan bu dağı keçə bilmir. Orada əqrəblərlə dolu bir dərə də var.

**(96) KƏRKAN -** Qirmisin yaxınlığında kənddir. Orada il boyu açıq olan bazar var. Sasani padşahlarından biri Balinasa əmr etdi ki, bu bazarı əqrəblərdən tilsimləsin. O, bunu yerinə yetirdi və bundan sonra burada heç vaxt əqrəb olmayıb. Əgər əqrəb kimi isə çalsa belə bu kəndin torpağından bir ovuc götürüb suya salırlar və

sonra çalınan adama içirdirlər. Həmin adam elə o an sağalır. Əgər kimsə bu torpaqdan bir qədər götürüb gillə qatışdırsa və bunu yaşadığı evin divarına sürtsə, həmin adamın evinə əqrəblər heç vaxt gəlməzlər.

**(97) KƏŞMİR** - Uzunluq dairəsi - 105º05', en dairəsi - 35°05'-dir. Nişaburun Bust rustağında kənddir. Orada gözəlliyinə və yüksəkliyinə görə tayı-bərabəri olamayan və şah Güştasbın əkdiyi çox hündür azad deyilən sərv ağacı var. Bu ağac Xorasanın fəxri idi. Onun haqqında xəlifə əl-Mütəvəkkilə[1] dedilər və o, ağacı görmək istədi. Lakin özü Xorasana gedə bilmədiyi üçün Tahir ibn Abdullaha[2] yazıb əmr etdi ki, sərvi kəsib gövdəsini və budaqlarını dəvələrə yükləyib gətirsinlər onun hüzuruna. Lakin sərvi gətirənlərin hamısına bədbəxtlik üv verib və əl-Mütəvəkkilin özü də sərv gəlib çatana qədər öz məmlükləri tərəfindən öldürülmüşdür.

**(98) MAHABAD** - Qaşan yaxınlığında böyük kənddir. Əhalisi şiə imamilərdir. Öz vaxtında ədəbiyyatı bilənlərin arasında tayı-bərabəri olmayan fəzilətli ustad Əfzəl Mahabadi adlanan Həsən ibn Əhməd ibn Əli buradandır. Camaat onun yanına hər tərəfdən gəlirdi.

**(99) MAUŞAN** - uzunluğu üç günlük yol olan Ərvənd dağının ətrafında yerləşən Xorasan dairələrindən biridir. Burada çoxlusu, ağac və meyvə var. Çiçəklərindən müşk qoxusu gəlir. Çaylarının suyu təmiz və durudur. Həmədanın əhalisi adətən Mauşana yayda, əriklər yetişəndə gedir. Ərik ağaclarının sahibləri icazə verirlər ki, gələnlər bunların altında istirahət etsinlər.

**(100) MARDİN** - Uzunluq dairəsi - 74°05', en dairəsi - 37°15'-dir. Cəzirədə dağ başında yerləşən məşhur qaladır. Yer üzündə bunun kimi böyük, gözəl tikilmiş və alınmaz qala yoxdur. Qala Dunaysər, Dara və Nisibindən yüksək yerdədir. Qalanın önündə böyük bir yerdə bazarlar, karvansaraylar və mədrəsələr yerləşir. Buradakı evlər pilləkən kimi bir-birinin üstündə tikilib və küçələr də bir-birinin üstündədir. Əhalisi içmək üçün suyu evlərində saxladıqları çənlərdən götürürlər. Su bulaqları çox azdır.

**(101) MƏRVƏRUD** - Uzunluq dairəsi - 94°05', en dairəsi - 36°30'-dir. Ğurla Qəznənin arasında böyük nahiyədir. Layiqli qazi və imam Hüseyn əl-Mərvərudi[1] buradandır. Bilikdə və möminlikdə onun bərabəri yox idi.

**(102) MƏRV** - Uzunluq dairəsi -94°05', en dairəsi - 37°40'-dir. Xorasanın ən məşhur, ən qədim, ən bərəkətli və ən gözəl

şəhəridir. Onu [İskəndər] Zülqərneyn bina etdirib. Şəhərin ən qədim hissəsi onun içqalasıdır. Deyirlər ki, onu Təhmuras tikdirib. Orada əhalini xəstəliyə salan Mədinə qızdırmasından başqa təəccüblü bir şey yoxdur. İndi [Mərv] xarabalıqdır.

Alim, imam, mömin və zahid Abdullah ibn Mübarək buradandır. O, 120 (738)-ci ildə anadan olub və 181 (797)-ci ildə vəfat edib. Əbu Bəkr Abdullah ibn Əhməd əl-Qaffal əl-Mərvazi də buradandır. Vaxtında ona bənzər faqih və hafiz yox idi.

**(103) MAVSİL** - Uzunluq dairəsi - 77°05' en dairəsi - 36°30'-dir. İslam ölkəsində məşhur və ən böyük şəhərlərdəndir. Yüksək və geniş yerdə tikilib. Şəhəri Ravənd ibn Bayvərəsp əl-Əjdəhaq Dəclə çayının qərb sahilində saldırıb. Şəhərin divarları, səddləri, dərin xəndəyi və içqalası var.

Şəhərin ətrafı bağlardır. Yazda havası cənnətə bənzər, yayda isə cəhənnəmə dönür, çünki binların daşları yay istisini gücləndirir. [Şəhər] qeyri-sağlamdır, çox palçıqlıdır. Orada bir il sağlamlıq olur, bir il xəstəlik. Qışı çox soyuqdur. Dəclənin sahilində gözəl binalar və görkəmli qəsrlər tikilib. Şəhərin özündə peyğəmbər Circisin, - ona salamlar olsun! - məşhədi yerləşir. Şəhərdən şərqə Tövbə təpəsi var. Orada Yunisin, - ona salamlar olsun! - qövmi toplaşmışdı. Əzablarını görəndən sonra tövbə etdilər.

Orada çox gözəl bağlar və eyvanlar var. Əhalisi qoçaq, xoşxasiyyətdir və gözəl sənətkardırlar.

Bu dünyanın ən nəcib adamlarından olan Camal əl-Mavsili buradandır. Özü İsfahanlıdır. Mavsil hökmdarının vəziri idi. Ənənələr vasitəsilə əxz olunmuş və əql ilə əldə edilmiş elmlərin bütün sahələrini əhatə edən şeyx Cəmaləddin ibn Yunis də buradandır. Qorxu və oxşamalara mübtəla olmuş şeyx Fəth əl-Mausili də buralıdır.

**(104) MARAĞA** - Uzunluq dairəsi - 82°05', en dairəsi - 37°20'-dir. Əhalisi, bərəkəti, suyu və meyvəsi bol olan məşhur şəhərdir. Orada qədimdən məsuslardan qalan mədrəsələrin və başqa binaların xarabaları var. Orada Qiyamətabad adlı, ölçüsü bir fərsah bir fərsaha olan bağ var. Onun yanında çoxlu isti sular var ki, buraya da çimməyə şikəstlər gəlir. Orada Hülaqu - xanın əmri ilə tikilmiş rəsədxana var. Onun qurulmasında səy göstərən imam xoca Nəsirəddin Tusi olub. Adları ilə fəxr edilən marağalılar içərisində əliaçıqlığı və nəcibliyi ilə məşhur qazi Sədrəddini göstərmək olar. Onun yaxşı işlərindən biri Qəzvin şəhər divarlarının tikilməsidir.

**(105) MASABZAN -** Şirvan yaxınlığında, çoxlu ağaclığı, isti suları, kükürdü, boraksı və duzu olan şəhərdir. Orada elə bir bulaq var ki, onun suyunu içən adamın ürəyi bulanır.

**(106) MƏYAFARİQİN -** Uzunluq dairəsi - 74°15', en dairəsi - 38°05'-dir. Diyar-Bəkrdə məşhur şəhərdir. Orada qəmli qalmaqdan ötəri söz verənlərdən başqa heç kəs qəm yeməz. Orada Məsihin, - ona salamlar olsun! - vaxtından kilsə durur. Divarları bu günlərəcən qalır. Orada qara mərmərdən düzəldilmiş və üstü şüşə ilə örtülmüş xaç suyu üçün qab var. Onun üzərində Nun oğlu İsanın, - ona salamlar olsun! - qanı qalıb. Bu qan bütün xəstəliklərə dərmandır və əgər onu cüzamlının bədəninə sürtsələr, xəstə sağalar.

**(107) MƏRƏND -** Uzunluq dairəsi - 80°15', en dairəsi - 37°50'-dir. Təbrizdən on fərsah aralı qədim şəhərdir. Burada çoxlu su, meyvə ağacları və taxıl zəmiləri var. İndiki zamanda şəhərin əksər hissəsi xarabalıqdır. Orada atabəy İsmayıl[1] tərəfindən tikilmiş böyük mədrəsə var. Şəhərin yaxınlığında çox yüksək Mişad adlı dağ var və ətrafı çaylar, zəmilər və bağlıqdır.

**(108) NAUS ƏZ-ZƏBYA -** Həmədanın yaxınlığında, hündür təpədə yerləşən Bəhram gurun qəsri ilə yanaşı olan məntəqədir. Buradan çoxlu bulaq və çaylar axır. Bu yerdə Bəhram oxu ilə ceyranı qulağından və ayağından vurdu. O, ceyranın dırnağını və qulağını bir oxla deşdi.

**(109) NƏSƏ -** Xorasanda Səraxsla Abivərdin yaxınlığında şəhərdir. Şəhəri Yəzdicird Ənuşirvan oğlu Firuz bina etdirib. Orada çoxlu çaylar və ağaclar var, lakin ağacları zəhərlidir. Orada xüsusən yayda, adamlar Mədinə qızdırmasına tutulur. Az adam olur ki, xəstələnsin. Orada İmadəddin Həmzə ən-Nəsəvi[1] tərəfindən tikilmiş xanəgah var. Bu, çox böyük xanəgahdır, bağların içindədir və ona oxşarı heç yerdə yoxdur.

**(110) NƏXŞƏB -** Xorasanda məşhur şəhərdir. Bura övliyalar və həkimlər yeridir. Müdrik ibn əl-Miqaffa[1] buradandır. O, içindən Ay çıxan quyu qazmışdır. Adamlar bunu görəndə elə biliblər ki, [həqiqi], Aydır. Bu əhvalatın xəbəri yayıldı və insanlar hər yerdən Nəxşəbə Ayı görmək üçün gəlib, buna təəccüblənirdilər. Cahil adamlar onu sehirbaz kimi tanıyırdı. Lakin bu, mühəndis hiyləsi və yalnız həqiqi ayın əksi idi, çünki quyunun dibində civəylə dolu təşt tapıldı. Amma nəticədə bu əhvalat möcüzəyə döndü. Onun haqqında hər yerdə danışırdılar və şöhrəti o qədər artdı ki, bu barədə şerlər və zərbi - misallar deyildi.

Xatim əl-asamm adlı əsərin müəllifi Əbu Turab Əskər ibn əl-Hüseyn ən-Nəxşəbi[2] buradandır. O, - Allah ona rəhmət etsin! - 245 (852)-ci ildə vəfat edib.

**(111) NƏSRABAD** - Xorasanın kəndlərindəndir. Əş-Şiblinin[1] sirdaşı, Xorasanın şeyxlərindən Əbülqasim İbrahim ibn Məhəmməd ən-Nəsrabadi, buradandır. Altmış dəfə həccə gedən və 367 (978)-ci ildə Məkkədə vəfat edən əl-Mürtəişlə Əbu Əli ər-Rudbari buradandırlar.

**(112) NİSİBİN** - Uzunluq dairəsi -75°20', en dairəsi - 37°05'-dir. Cəzirədə Səncər yaxınlığında çiçəklənən şəhərdir. Çoxlu çayları və bağları var. Şəhərin divarları və içqalası var. Buralar səhhət üçün çox pis və zərərli yerdir, xüsusən qəriblər üçün. Onun xüsusiyyətlərindən biri də haqqın olmamasıdır. Nisibin əqrəbləri haqqında əfsanələr gəzir.

**(113) NİHAVƏND** - Uzunluq dairəsi - 83º45', en dairəsi - 34°20'-dir. Həmədan yaxınlığında qədim şəhərdir. Deyirlər ki, bu, Nuhun, - ona salamlar olsun! - tikdirdiyi şəhərlərdəndir və onun əsl adı Nuhavənddir, yəni «Nuh qoyub bünövrəsini». Orada Vazvaz adlı yerdə böyük bir daş var. Ortasında bir qarışboyda dəliyi var. Buradan gündə iki dəfə su vurur və güclü səs gəlir. Bu su torpağın böyük sahəsini suvarıb yenə öz çıxdığı yerə qayıdır.

Möcüzələrindən Zərirə adlı qamışıdır. Nihavəndə və ya onun bir mahalında qaldıqda onun başqa ağaclar kimi heç bir iyi yoxdur. Elə ki, onu buradan çıxarıb Aqaba ər-rukkab («Atlılar keçidi») adlı dağ keçidindən o yana apardılar, ondan qoxu gəlməyə başlayır.

**(114) NİŞABUR** - Uzunluq dairəsi - 92°30', en dairəsi - 36°21'-dir. Xorasanın böyük şəhərlərindəndir. Diqqətəlayiqdir, çoxlu binaları və bol meyvəsi var. Bura - layaqətli insanların məskəni və alimlərin vətənidir. Orada başqa ölkələrə aparılan firuzənin mədəni var.

Orada başqa yerlərdə olmayan yeyilən gil var.

Nişabur Allahın ən yaxşı şəhərlərindən idi. Oğuzlar Səlcuq sultanı Səncər ibn Məlikşahın əleyhinə çıxıb onu məğlub və əsir etdilər, sonra da Nişabura qoşun göndərdilər. Lakin Nişaburun əhalisi onlarla döyüşə girdilər və bu da çox dəhşətli döyüş idi.

Oğuzlar kafir xristian idilər. Bundan sonra buraya oğuzların hökmdarı gəlib şəhəri güclə aldı. Kimə şəhərdə rast gəlirdilərsə, öldürürdülər, şəhəri isə dağıdıb yandırdılar. Qalan

əhalisi Şadyaxa köçdü, bu da Abdullah ibn Tahir ibn əl-Hüseynin[1] bağı idi. Əhali burada yurd saldı, divarlar tikdi və bu şəhər əvvəlkindən də gözəl oldu. Əvvəlki şəhəri isə tərk etdilər.

İnsanlar üçün nümunə və rəhbər olan imam və görkəmli alim Raziəddin ən-Nişaburi buradandır. Nişaburda anadan olub, Buxarada yaşayırdı. O, imam Əbu Hənifənin, - Allah ondan razı olsun! - tərəfdarı idi. Onun dərnəyində Amidi kimi dörd yüz ləyaqətli fəqih dərs alırdı. O, elə bir təriqətə qulluq edirdi ki, başqaları ona qədər bunu etmirdi. Onun vaxtına qədər müzakirə elmi çox da dəqiq deyildi, o isə bu elmə dəqiqlik və nizam gətirdi.

Ustad və şeyxlərin nümunəsi, Risalə əl-Quşeyriyyənin müəllifi Əbülqasim əl-Quşeyri[2] buradandır. Bilikdə, təcrübədə, möminlikdə və zahidlikdə onun vaxtında ona bənzəri yox idi.

Cüneydin ən ləyaqətli sirdaşı Əbu Məhəmməd Abdullah ibn Məhəmməd əl-Mürtəiş də buradandır. O, 368 (979)-ci ildə vəfat edib. Müdriklərdən filosof, müxtəlif elmlərin, xüsusən riyaziyyatın ustadı olan Ömər əl-Xəyyam da buradandır. O, Səlcuq sultanı Məlik şahın dövründə yaşayırdı.

**(115) NİNEVİYA** - Qədimdə bu, Dəclədən şərqdə Mavsillə üzbəüz yerləşən şəhər və kəndlərin adı idi. Allah onların yanına Yunisi, - ona salamlar olsun! - göndərdi və o, bunları Allah Təalaya inanmağa çağırdı. Onlar isə onu yalançı hesab etdi. O, onları Allahın qəzəbinə düşəcəklərini xəbərdar edib, müəyyən olunmuş vaxtda buranı tərk etdi. Qəzəb vaxtı çatanda onlar bunu gözləriylə gördülər və arvad - uşaqları ilə birlikdə təpənin üstünə qalxıb başlarını açdılar, and içdilər və inandılar. Allah da onları qəzəbindən xilas etdi.*

**(116) VARCƏND** - Həmədanın bir dairəsində kənddir. Onun möcüzələrindən: əgər kiminsə bədənində şiş varsa və təbiblər onun müalicəsində aciz olublar, o, Varcəndə getsin və əhalisi onu sağaldar. Bu, ona görə mümkündür ki, əhalisinin cadusu və yalnız onlara məlum olan bir bitkisi var. Onlar bu cadunu həmin bitki üstündə oxuyurlar və xəstə də qısa müddət içində sağalır.

**(117) HERAT** - Uzunluq dairəsi -94°20', en dairəsi - 31°30'-dir. Xorasanın şəhərləri arasında ən nəhəngidir. Orada bunun kimi inkişaf etmiş və möhkəmlənmiş şəhər yoxdur. Onu İskəndər bina etmişdir. Orada çoxlu bağ və axar sular və yel dəyirmanları var.

---

* Bax: Quran, Yunis surəsi.

Buradan başqa ölkələrə gümüşlə işlənmiş qablar aparırlar. Tatarlar gələnə kimi Herat Allahın ən yaxşı şəhərlərindən olduğu kimi qalırdı. Tatarlar onu başqa şəhərlər kimi dağıtdılar.

**(118) HƏMƏDAN** - Uzunluq dairəsi - 88º05', en dairəsi - 35º30'-dir. Cəzirənin məşhur şəhərlərindəndir. Deyilənə görə, onu Həmədan ibn Fəlus ibn Sam ibn Nuh, - ona salamlar olsun! - tikdirib. Onun səthi dörd fərsah dörd fərsahadır. İndi şəhərin səthi bu qədər də olmasa, yenə də böyükdür. Sahəsi çox genişdir, havası yaxşı, suyu şirin və torpağı münbitdir. Şəhər padşahların iqamətgahı idi. Burada hər şey ucuzdur, meyvəsi boldur. Şəhərin xüsusiyyətlərindən biri də odur ki, əhalisi böyük dərdin içində də olanda kədərlənmir, ez keyfində, əyləncələrində qalır, çünki bu şəhər Oğlaq bürcünün altındadır, bu isə böhranın məskənidir. Əhalisinin əksəriyyəti yelbeyindir. Deyilənə görə, Dara İskəndərlə müharibəyə hazırlaşanda, Həmədanı möhkəmlətmək istədi. O, şəhərin mərkəzində öz ailəsi və xəzinəsi üçün qala tikdirdi. Dara öldürüləndən sonra İskəndər şəhəri mühasirə edir, sonra alır və onun istehkamlarını və divarlarını söküb dağıdır.

Möcüzələrindən - şəhər darvazası üstündə olan böyük daşdan düzəldilmiş şirdir. Kubad Balinasdan xahiş etdi ki, o, şiddətli şaxtalardan və çoxlu qarlardan xilas etmək üçün şəhəri tilsimləsin. Balinas da bu şiri tilsim edəndən sonra oraya qar çox az yağdı. Buna qədər Həmədanda gəzmək mümkün deyildi, ona görə ki, bura olduqca çox qar yağırdı.

Əl-Məqamət əsərinin müəllifi Əbülfəzl Badi əz-Zaman[1] buradandır. Bu əsərdə o, biliyinin varlığını, natiqliyini, istedadını və mənliyinin incəliyini sübut edən hər şeyi toplamışdır. O, 398 (1008)-ci ildə vəfat edib.

Orada bir dərədən isti su axır. Su bir hovuza yığılır və buraya çimmək üçün həm sağlam, həm də şikəst adamlar gəlir.

**(119) YUMKAN** - Bədəxşan yaxınlığında, dağların mərkəzində yerləşən istehkamlı şəhərdir. Heç kəs onu ala bilməz və onun çətin yollarını aşa bilməz. Orada gümüş və lələ oxşar bədəxşan mədənləri var. Orada Nəsir-i Xosrovun[1] tikdiyi dünya möcüzələrindən olan hamamlar var. Hamamlar necə tikilib heç kəs bilmir və bunlar haqqında danışmaq çətindir. Gərək özün gedib görəsən.

Deyirlər ki, Bəlx hakimi Nəsir-i Xosrov öz yerini burada bərkitmək istədi, lakin Bəlxin əhalisi onun əleyhinə üsyan etdi və o,

çox möhkəm olan Yumkana köçdü. O, burada əcaib binalar, o cümlədən, qəsrlər və hamamlar tikdirdi, bağlar saldırdı və s.

## BEŞİNCİ İQLİM

Onun başlanğıc gecə-gündüzün bərabərliyində, günorta vaxtı, kölgənin uzunluğu beş qədəm, qədəmin beşdə üçünü və qədəmin altıda beşini təşkil edən yerdədir. Onun axırı günorta vaxtı, istər şərqdə, istərsə də qərbdə, altı qədəm, qədəmin onda birinin yarısını və qədəmin onda altısını təşkil edən yerdədir.

İqlim Məşriq türklərinin torpağında başlanıb Qaşqar, Fərqanə, Səmərqənd, Xarəzm və Xəzər dənizi ilə həmsərhəd olan türklərin torpaqlarından keçib əl-Abvaba, Bərdəyə, Ərminiyəyə və Rum ölkəsinə qədər uzanır və Muhit dənizinin sahilində qurtarır.

İqlimin əvvəlində burada günün uzunluğu on dörd saat yarım və on beş dəqiqədir, ortasında - on beş saat və axırında on beş saat on beş dəqiqədir. Şərqdən qərbə onun uzunluğu - yeddi min altı yüz yetmiş mil və bir neçə dəqiqə, eni - iki yüz əlli dörd mil və otuz dəqiqədir.

İndi isə onun bəzi şəhərlərini sıra ilə yada salaq.

**(1) ABRİQ** - Rum ölkəsində bir dağın altında olan yerdir. Buraya bütün dünyadan zəvvarlar gəlir. Qapısından daxil olub yerin altı ilə o qədər yol gedirlər ki, bir geniş yerə çatırlar və buradan yalnız göy görünür. Orada məscid və kilsə var. Əgər buraya müsəlman gəlirsə, o, məscidə gedir, əgər xaçpərsətdirsə - kilsəyə. Burada çoxlu zəvvar olur. Onlar bir zala girirlər və orada bədənlərində nizə və qılınc yaralarının izi qadan bir neçə öldürülmüşlər var. Bəzilərinin bədənlərinin bir hissəsi yoxdur. Üzərlərində hələ də çürüməmiş pambıq parçası var. Oradaca uşağına süd verən qadın var.

**(2) ARRAN** - Azərbaycan, Ərməniyə və Ləzgilər ölkəsinin arasında yerləşən nahiyədir. Burada çoxlu şəhər və kəndlər var. Əsas şəhərləri Gəncə və Beyləqandır. Orada Kür çayı axır. Onun başlanğıcı Curzan ölkəsindədir, sonra o, Abxaz ölkəsindən Allan vilayətinin və Tiflisin yanından keçib Gəncənin, Şəmkürün və Bərdənin qapısı yaxınlığından axır. Bundan sonra Kür, ondan kiçik olan Arazın suları ilə qarışır və Xəzər dənizinə tökülür. Burda balıq ovlamaq üçün bənd qurulub və müxtəlif balıqlar tutulur. Orada çoxlu su quşları və çəltik zəmişəri var.

**(3) ƏRZİNCAN** - Uzunluq dairəsi - 74º05', en dairəsi - 35°05'-dir. Ərməniyədə şəhərdir. Əhalisi və bərəkəti çox olan yerdir. Əhalisi müsəlman və xaçpərəstlərdir. Orada, bir dağda mağara var, onun yuxarısından su damcılayır və sonra bu su daşa dönür.

**(4) ƏRZƏN ƏR-RUM** - Uzunluq dairəsi - 77°05' en dairəsi - 39°40'-dir. Xilatın yaxınlığında olan Ərməniyyənin məşhur və qədim şəhərlərindəndir. Fərat çayının başlanğıcı buradadır. Bahar vaxtı onun suyunda çimənin həmin ildə heç bir xəstəliyi olmaz.

**(5) ƏRMİNİYƏ** - Azərbaycanla Rumun arasında yerləşən nahiyədir. Burada çoxlu şəhər, tala və kənd var. Əhalisi xaçpərəstdir. Orada əl-Xəris[1] və əl-Xuvayris2 dağları var. Onların zirvələrinə heç kəs qalxa bilməyib. Deyirlər ki, həmin iki dağ erməni çarlarının məqbərələridir. Çarlarla bir yerdə onların mülkləri və xəzinələri də basdırılıb. Balinas bu yerləri tilsimləyib ki, buraya heç kəs daxil ola bilməsin. Ərməniyə gölünün yanında, kürdlər olan yerdə, Zəravənd adlı bulaq var. Bu, yaralardan, xoralardan və çibanlardan xilas edən məşhur sudur.

**(6) AŞBUNA** - Əndəlusda, Bacanın yaxınlığında gözəl şəhərdir. Orada müxtəlif meyvələr yetişir və yerdə də, suda da yaxşı ov olur. Şəhər dənizin daşlı burnunda yerləşir və dənizin ləpələri şəhər divarlarına çatır. Orada, bir dağda əl-baradi adlı daş tapılır. Gecələr bu daşdan sanki çıraqdan gəlirmiş kimi işıq gəlir, həmin dağda damarlı əqiqin[1] mədəni var.

**(7) İŞBİLİYA** - Əndəlusda, Lablanın yaxınlığında şəhərdir. Bu şəhər bütün Əndəlusda öz yaxşı cəhətləri ilə fərqlənir və üstünlükləriylə başqa yerləri ötüb. Buranın havası gözəl, suyu dadlı, torpağı münbit, mal-qarası və meyvələri çoxdur. Həm quruda həm də suda ovlaqları var. Orada keyfiyyətlərini uzun zaman itirməyən və xarab olmayan yaşıl zeytun bitir. Burada çoxlu bal alınır.

**(8) ƏFƏSUS** - Rum torpağında şəhərdir. Bu - Zalim Duqyanusun şəhəridir. Yeddi yuxulamış gənc oğlan bunun əlindən qaçmışlar. [Onların qaldığı] mağaradan şəhərə qədər bir fərsahlıq yoldur. Mağaranın [ağzı] Böyük Ayı ulduzlarına tərəfdir. Onun içində elənlərin meyidləri çürümür. Onlar yeddi nəfərdir: altısı arxaları üstə yatır, yeddincisi də mağaranın uzaq küncündə arxası

mağaranın divarına sağ böyrü üstə söykənib yatır. Onların ayaqlarının altında heç bir yeri zədələnməmiş ölü it yatır.*

Mağaranın yanında məscid var və buraya gələnlərin duası Allaha çatır. Gecələr şəhər əhalisi mağaranın içindən çıxan parlaq işığı görür.[1]

**(9) ƏFLUCUNİYA** - Ərməniyə nahiyəsində böyük şəhərdir. Əhalisi xaçpərəstdir. Buranı başqa yerlərdən fərqləndirən əhalisinin cüzam xəstəliyinə düşməsidir. Bu da onların çoxlu kələm yeməyindən irəli gəlir. Əhalisi qonaqsevərdir və onları aldadan rahiblərinə tabedir. Əgər onlardan kimsə evlənmək istəyəndə, o, xahiş edir ki, rahib nişanlısının razılığını alsın və buna görə gələcək arvadı onun üçün uğurlu olsun.

**(10) ALŞ** - Əndəlusda, Tudmirin yaxınlığında şəhərdir. Buranın xüsusiyyətlərindən biri: bütün Əndəlusda xurmalar yalnız burada axıradək yetişir. Burada olan kişmişi üzüm başqa yerlərdə yoxdur.

Burada toxunan xalçalar da əladır.

**(11) ƏNDƏLUS** - Məğribdə böyük yarımadadır. Bir hissəsi məskundur, bir hissəsi - xarabalıqdır. Yarımadanın uzunluğu bir aylıq yoldan az, eni - iyirmi mərhələdən çox, çevrəsi isə - üç aylıq yoldan artıqdır. Orada elə bir yaşayış yeri yoxdur ki, yarımadanın mərkəzindən iki günlük yoldan uzaq olsun.

Əndəlusu və Frənglər ölkəsini bir - birindən ayıran dağdır. Özü isə iqlimlər arasında yerləşir: bir hissəsi dördüncü iqlimdədir, bir hissəsi - beşincidə. Orada çoxlu şəhər, kənd, çay və meşə var. Burada ucuzluq və bolluq hökm sürür. Burada qızıl, gümüş, qurğuşun, dəmir, civə, qırmızı və sarı kükürd, əla kinovar, sink, zəy və İsfahan sürməsinə oxşar sürmə[1] mədənləri var.

[Qiymətli] daşlardan orada yaqut, büllur, damarlı əqiq, mağnatis,[2] şazənəc,[3] yəhudi daşı[4] kolçedan[5] ülgüc daşı, bitkilərdən isə kiasint, kist,[6] əşqaqil, əznay və ənbərbaris (?) var.

Dünya möcüzələrindən Əndəlusda ikisi var: birincisi - hər tərəfdən frənglərlə əhatə olunmuş islam dövləti. Bununla başqa müsəlmanlar arasında dəniz var. İkincisi də - hər tərəfdən müsəlmanlarla əhatə edilən və Şam (Aralıq) dənizinin sahilində yerləşən xaçpərəstlər dövlətidir. Bununla frənglər arasında da dəniz var.

---

* Bax: Quran, Mağara surəsi.

Orada Əndəlusu qərbdən və şimaldan əhatə edən əl-Əsvad («Qara») və ya başqa əz-Zələmat («Zülmət») adı ilə tanınan dəniz var. Əndəlusun lap axırında Allah Təalanın Quranda adını çəkdiyi iki dənizin birləşdiyi yer var.* Onun eni - üç fərsah, uzunluğu isə - iyirmi beş fərsahdır. Oralarda suyun yüksəlməsi və çəkilməsi olur. Bir günün ərzində suyun iki yüksəlməsi və iki çəkilməsi olur. Bu ona görədir ki, əl-Əsvad dənizi gün çıxanda yüksəlir, suları boğazdan keçib Əndəlusun cənubunda və şərqində olan Rum dənizinə tökülür. Suyunun rəngi yaşıldır, əl-Əsvad dənizinin suyu isə mürəkkəb rəngindədir. Əgər bu suya bir şəffaf qabda baxsan qaralığı görünmür. Əl-Əsvad dənizinin suları əl-Əxdər («Yaşıl») dənizinə gün batana qədər tökülür. Gün batanda da hər şey tərsinə olur: əl-Əxdər dənizinin suları əl-Əsvad dənizinə tökülür və həmişə belə olur. Bu da Uca və hər şeyi bilən Allahın buyruğudur.

Bu barədə Allahın Elçisindən, - Allah onu salamlasın! - soruşanda, O, dedi: «Okeanın hökmdarı öz ayağını dənizə basanda, dəniz daşır, ayağını çıxaranda dəniz yerinə qayıdır».

Orada mağarası olan bir dağ var. Onun içində heç kəs işıq görmür, lakin uzun bir ağacın ucuna yağlanmış fitil bağlayıb mağaraya salsan, fitil öz-özünə alışar.

**(12) ƏL-BİRA** - Əndəlusda, Qurtubanın yaxınlığında şəhərdir. Şanlı və gözəl şəhərlərdəndir. Çaylarının çoxluğundan, meşələrini sıxlığından və meyvələrinin bolluğundan Dəməşqin Ğutasına oxşayır. Onun sahil hissəsində banan ağacı bitir. Orada şəkər qamışı da bitir. Qızıl, gümüş, dəmir, mis, qurğuşun, sink və mərmər mədənləri var. Bütün bunlar Əndəlusun başqa vilayətlərinə aparılır.

**(13) BAB ƏL-ƏBVAB** - Uzunluq dairəsi - 85°05', en dairəsi - 43°05'-dir. Uzunsov qayaların üstündə, Xəzər dənizinin sahilində yerləşən əcaib şəhərdir. Dənizin ləpələri şəhərin divarlarını döyür. Uzunluğu üç fərsaha yaxındır, eni isə - oxun atıldığı məsafəyə qədərdir. Şəhərin dəmir qapıları və çoxlu bürcləri var. Hər bürcün yanında dini dərslərlə məşğul olan şagirdlər üçün məscid var. Divarların üstündə şəhəri düşmənlərdən qoruyan keşikçilər var.

Şəhəri Xosrov Ənuşiravan onu əhatə edən müxtəlif xalqlardan ibarət olan düşmənlərin çoxluğunu nəzərə alaraq bina etdirib və o, ən güclü sərhəd qalalarının birinə çevrildi.

---

* Bax: Quran, 18, 60.

Bu tərəfdən böyük təhlükənin və qorxulu vəziyyətin əmələ gəlməsini nəzərə alaraq, sasanilər bu yerə çox böyük diqqət edirdilər. Onlar buranın divarlarını qayalardan və qurğuşundan düzəltdilər. Onların eni iki yüz dirsəyə, hündürlüyü isə dağların zirvələrinə çatırdı. Divarlarının müəyyən yerə qədər uzunluğu yeddi fərsahdır, bu yer də - Aşab adlı əyri və çatılmaz bir dağdır. Ənuşiravan divarları yonulmuş daşlardan tikdirdi. Bu daşların ən kiçiyini əlli nəfər dartıb çəkirdi. Daşları bir-biriylə qurğuşun və qullablarla bərkitdirdi. Bu yeddi fərsahlıq məsafədə o, yeddi keçid düzəltdi və hər keçidin yanında şəhər saldırdı. Hər şəhərdə o, sehirli timsal qoydurdu ki, türkləri dəf etdirsin, çünki türklər bu tərəfdən daim İrana basqın edirlər. Bunlar - iki şirin timsalıdır və hər ikisi Cihad darvazasının qabağında iki daşdan düzəlmiş sütunlar üstündədir.

**(14) BUTTAM** - Fərğanə nahiyəsində möhkəm qəsrdir. Burada qızıl, gümüş və naşatır mədənləri var. Naşatırı başqa ölkələrə aparırlar. İçqalası mağara kimi dağın içindədir. Burada qapıların və onların göz yerlərini təhlükəsizliyini təmin edən istehkam qurulmuşdur. Gündüzlər buradan tüstüyə bənzər buxar çıxır, gecələr isə - atəş. Çox şiddətli istisinə görə içəriyə yalnız yaş keçədən örtük geyib keçmək olar, Buraya daxil olur, istədiyini götürür çox tez bayıra çıxırlar.

**(15) BACCANA** - Əndəlusda, Əlmeriyanın yaxınlı-ında şəhərdir. Orada suyu çox olan bulaq var. Buraya uzun sürən xəstəlikləri olan adamlar gəlir və qalırlar. Bulaq suyuna gələnlər üçün burada möhkəm binaları olan mehmanxanalar var. Amma bəzən gələnlərin çoxluğundan qalmaq üçün yer tapılmır. Bulaq başında iki ev var. Birisi kişilər üçündür, bu da lap bulağın başındadır. İkincisi qadınlar üçündür, onun suyu da kişilər olan evdəng.

**(16) BUXARA** - Uzunluq dairəsi -96°50', en dairəsi - 39°10'-dir. Mavəraünnəhrdə görkəmli, məşhur, əzəmətli və qədim şəhərdir. Onunla Səmərqəndin arasında yeddi günlük və otuz yeddi fərsahlıq yol var. Bura - Suğd ölkəsidir. Bu dünyanın ən gözəl yerlərindəndir. Şəhərin özü, sarayları, bağları və ətrafları olan kəndləri möhkəm divarla əhatə olunub. Divarların içindəki yerin ölçüsü on iki fərsah on iki fərsahadır və bütün bu sahədə nə bir boş yer var, nə də bir dağınıq.

Şəhər divarlarının daxilində ikinci divar da var. Bu divarın içində olan sahənin ölçüsü təxminən bir fərsah bir fərsahadır.

Buxara faqihlərin mərkəzi, ən ləyaqətlilərin mədəni və mücərrəd elmlərin mənbəyi idi. Şəhərdə başçılıq edən şəxs nəcib evə mənsub idi və evin rəisini xoca və imam adlandırırdılar. Onun nəsli indi də durur, amma nəslin əvvəli Ömər ibn Əbdüləziz ibn Mərcana çatır.

Dünyada elə bir şəhər yoxdur ki, onun əhalisi buxaralılar kimi elm adamlarına böyük hörmət göstərsinlər. Əs-Səhih adlı əsərin müəllifi imam Məhəmməd ibn İsmayıl əl-Buxari[1] buradandır. Bu əsər hədislərin ən qədim və ən mötəbər toplusudur.

İmamın özü Buxarada anadan olub, İraqda, Vasitdə yaşayıb.

**(17) BAKUYƏ -** Uzunluq dairəsi -84°30', en dairəsi - 39°30'-dir. Xəzər dənizi sahilində, Dərbəndin nahiyələrinin birində, Şirvan yaxınlığında binaları daşlardan tikişmiş şəhərdir. Onun divarlarını dəniz suları əhatə edir. Dəniz suları bürclərindən bir çoxunu basıb məscidə yaxınlaşıblar. Torpağı qayalıqlardır və evlərin çoxu qayalar üstündə tikilib havası yaxşıdır, suyu şirindir və qayalıq yerlərdə qazılmış quyulardandır. Quyuların suyu yeraltı bulaqlardandır. Taxılın məhsulu burada azdır və onu buraya Şirvandan və Muğandan gətirirlər. Burada çoxlu əncir, nar və üzüm var. Bağlar şəhərdən uzaqdır və əhalinin əksəriyyəti oraya yay vaxtı gedir, orada müəyyən vaxt qalır, sonra da şəhərə qayıdır. Hər il də belə olur.

Şəhərin daşdan tikilmiş iki, həddindən artıq möhkəm qalası var. Onlardan birisi böyükdür və dəniz kənarında, ləpədöyəndədir. Bu həmin qaladır ki, tatarlar onu ala bilmədilər. İkinci qala birincisindən yuxarıdadır. Onun üst tərəfi məncaniqlərlə dağılıb. Bu şəhərin xüsusiyyətlərindən biri də odur ki, burada gecə-gündüz külək əsir. Bəzən bərk külək əsəndə insan ona qarşı yeriyə bilmir, atları və qoyunları isə qış vaxtı küləklər qaldırıb dənizə atır.

Burada qətran (qır) yataqları və neft bulaqları var və hər gün iki yüz dəvə yükündən çox neft hasil olunur. Bunların yaxınlığında arası kəsilmədən, gecə-gündüz, yasəmən yağı kimi ağ neft axıdan başqa bir bulaq var. Bunun icarə haqqı təxminən min dirhəmə yaxındır.[1] Bulaqların yanında şam kimi yanan sarı rəngli bərkimiş torpaq var. Bundan parça-parça qoparıb şəhərə aparırlar və evlərlə hamamların qızdırılmasında istifadə edirlər.

Şəhərdən bir fərsah aralı bir yer vardı, oradan heç vaxt sönməyən alov çıxır. Deyirlər ki, bu - kükürd mədənidir. Bunun yaxınlığında bir kənd var və bura nın əhalisi xaçpərəstdir. Onlar əhəng yandırır və bunu arabalarla şəhərə daşıyırlar.

Orada duz qazmaları var. Buradan hasil edilən əla duz [başqa] ölkələrə ixrac olunur.

Şəhərin yaxınlığında məskun olunmuş ada var və buradan su itilərinin ovuna gedirlər. Su itlərinin dərisini soyur və çıraqlarda [istifadə edilən] yağlarını əridirlər. Dərilərindən tuluqlar düzəldib neftlə doldururlar və [başqa] ölkələrə aparırlar. Orada çoxlu, bənzəri heç yerdə olmayan ceyran var. Orada bəzi illərdə dənizdən çıxıb yüksəkliyə qalxan və uzaqlardan, iki günlük və daha da çox məsafədən görünən böyük alov müşahidə edilirlər. Bu alov uzun müddət yanandan sonra sönür.

Şəhərin yaxınlığında çoxlu kənd yerləşir və hər bir kəndin möhkəm divarı və qalası var. Bu kəndlərin bütün sakinləri xaçpərəstlərdir. Şəhər əhalisi isə imam Şafeinin, - Allah ondan razı olsun! - məzhəbinə etiqad edirlər.

Bura atamın - imam və alim, özündə ləyaqətləri cəm edən Saleh ibn Nurinin vətənidir. O, 806 (1404)-cı ildə yetmiş yeddi yaşında vəfat edib.

**(18) BƏRDƏ** - Uzunluq dairəsi -83°05', en dairəsi - 30°40'-dir. Arranda şəhərdir. Onu şah Qubad bina etdirib. Bura gözəl yerdir. Burada fındıq, şabalıd və quşarmudu boyda dərqal (zoğal) adlanan meyvə var. Bütün nahiyələrdə olan qətirlərin ən yaxşısı buradadır.

**(19) BƏZZ** - Arranla Azərbaycanın arasında olan çox dumanlı dairədir. Göylər orada çox az açıq olur. Burada xəlifə əl-Mötəsimbillahın[1] vaxtında Babək əl-Xürrəmi[2] zühur edib. Burada elə bir yer var ki, əgər insan həmin yerdən Şanlı və Ulu Allaha müraciət etsə, onun duaları mütləq qəbul olunacaq. Deyirlər ki, [bu yerin altından] böyük çay axır. Əgər çoxdan qızdırması olan adam burada çimsə, xəstəlik ondan əl çəkər.

**(20) BALANSİYA** - Əndəlusda sahəsi böyük olan, yerin və dənizin bərəkətlərini toplayan, taxıl zəmiləri, mal-qarası və münbit torpaqı olan tədim şəhərdir. Rudravərdə olduğu kimi, orada da zəfəran bitir.

**(21) BEYLƏQAN -** Uzunluq dairəsi - 83°30', en dairəsi - 39°50'-dir. Arranda, hündür divarları olan müstəhkəm bir şəhərdir. Onu şah Qubad bina etdirib. Nə özündə, nə də ətrafında daş var.

Mücirəddin əl-Beyləqani[1] buradandır. O, ləyaqətli imam və şair idi.

**(22) TİFLİS -** Uzunluq dairəsi - 83°05', en dairəsi - 43°05'-dir. Özündən o yana islam dini yayılmamış möhkəm şəhərdir. Bura - Gürcülər ölkəsinin paytaxtıdır, Onu Xosrov Ənuşirvan bina etdirib, Əməvilərin mövlası İshaq ibn İsmayıl isə möhkəmləndirib. Şəhərdən Kür çayı axır. Əhalisi müsəlman və xaçpərəstlərdir. Kürün bir sahilində azan deyilir, digərində isə kilsə zəngləri çalınır. Şəhər evlərinin damları şam ağacındandır.

Möcüzələrindən - çox isti hamamlarıdır. Onun suyunu qızdırmırlar və bura heç su da daşımırlar, çünki hamam isti suyun üstündə tikilib.

**(23) TÜRKİSTAN -** Bütün türk ölkələrinin ümumi adıdır. Onun sərhədi birinci iqlimdə başlanır və Məşriqə daxil olub yeddinci iqlimə qədər uzanır. Əhalisinin əksəriyyəti çadırlarda yaşayır,* amma aralarında elələri də var ki, kəndlərdə yaşayırlar.

Türklər bütün iqlimlərin şərt tərəfində, cənubdan şimala tərəf uzanan yerlərdə yaşayırlar. Başqa xalqlardan çoxluqları, böyük mərdlikləri, davamlı olmaları və geniş üzlərinə, yastı burunlarına, nəhəng əllərinə və pis xasiyyətlərinə görə, vəhşi heyvanlara oxşamaqları ilə fərqlənirlər. Onlar qəzəbli, zülm edən və zorakıdırlar. Onlar heyvan əti yeyir və bunu hər şeydən üstün tütüb heç bişirməsi haqda da fikirləşmirlər. heyvan adəti üzrə onlar gücə üstünlük verirlər və onların həyatı arası kəsilməyən basqınlardan, qorxan ceyranların və uçan quşların təqibindən ibarətdir. Fikirləşirsən ki, onlar artıq yorulublar amma baxıb görürsən ki, onlar elə həmin vəziyyətdədirlər, atlarını qovur, dağlara dırmaşırlar.

Orada yerli qəbilənin adını daşıyan Ranək adlı dağ var. Orada qızıl və gümüş mədənləri var. Orada evə oxşar mağarası olan yanar dağ var. İçərisinə heyvan girsə, o, həmin oddan yanar. Orada ləl, lazurit və süleymandaşı mədənləri var.

Diqqətəlayiq şeylərdən - sərt qoxulu müşk, samur, sincab və yaşəm daşıdır.

---

* Yəni köçəridir.

**(24) CÜRCANİYYƏ** - Xarəzm nahiyəsinin mərkəzidir. Bu, Ceyhun çayının sahilində böyük və məşhur şəhərdir. Əsas şəhərlərindən biridir. Əhalisinin hamısı mötəzilələrdir və daim kəlam elmi ilə məşğuldur. Biri-biriylə hətta bazarlarda və küçələrdə də münaqişə edirlər. Lakin artıq-əskik danışıb qəzəblənmirlər. Onlar çox dəqiq sənətlərlə məşğul olurlar - dəmirçilik, xarratlıq və s. Onların qadınları iynə ilə çox gözəl şeylər işləyirlər - qızıl sapla tikib toxuyurlar.

Möcüzələrindən yemişin yetişdirilməsidir. Şəhər qumluqlarla əhatə olunub. Bunların sahəsi səksən firsah səksən fərsahadır və Misirin qumluqlarına oxşayırlar. Orada bir tikanlı bitki var və bu dəvətikanıdır. Bundan Xorasanda tərəncubin şirəsi hasil olunur.

Yemiş əkilməsinin vaxtı gələndə bu qumluğa Xarəzm camaatı gəlib, hərəsi özünə yiyəsiz sahə seçib onu daşlarla hörür. Sonra bu tikanın kökünü ikiyə ayırır və buraya yemişin toxumunu yerləşdirib çıxıb gedirlər. Tikanın şirəsinə görə yemiş tumları boy verir və bunlara nə su lazım gəlir, nə də başğa bir şey.

Yemişin yığılma vaxtı gələndə, camaat buraya gəlib görür ki, yer üzü başdan - başa yemişlikdir. Şirinliyinə və dadına görə bu yemişlərin [başqa] ölkələrdə tayı-bərabəri yoxdur. Bu yemişlər çox ucuzdur. Onları dilimlərə bölüb [qurudurlar] və hədiyyə kimi [başqa] ölkələrə aparırlar.

**(25) CƏNZƏ** - Uzunluq dairəsi -83°05', en dairəsi - 41º20'-dir. İstehkamları olan Arranın şəhərlərindəndir və şəhərin gürcülərə yaxın olduğundan müsəlmanların sərhədyanı qalalarındandır. Çox bərəkətli və çörəkli şəhərdir. Əhalisi dindardır. Orada Gürcü ölkəsindən axan Qərdəqəs çayı axır. Suyu altı ay olur, altı ay olmur.

Əhalisi barama becərməklə və ipək toxumaqda mahirdir. Şəhərdən bir mənzil aralı Hərək adlı qala var, ətrafında ətirli otlar bitir, axar sular və bağlar var. Yayda buranın havası gözəldir və Gəncə camaatı buraya köçür. Orada böyük bir dağ və onun üstündə Şam tutuna bənzər Xur adlı bitki var. Həmin bitki cigər xəstəliyindən xilas edir. Gəncədən və Şirvandan başqa bu bitki heç yerdə yoxdur.

Görkəmli şair, arif və həkim Əbu Məhəmməd Nizami buradandır. Onun gözəl «Divanı» və «Xosrov və Şirin» «Leyli və Məcnun,» «Məxzən əl-əsrar» və «həft peykər» adlı gözəl dastanları var.

**(26) XUTTALAN -** Türklərin torpağında məşhur şəhərdir. Orada iki dağ arasında bir dərə var. Hər il müəyyən bir vaxtda, üç gün ərzində bu dərədən çoxlu quş çıxır və bu günlərdə evlərin damları quşla dolur. Sonra bu əhvalat yalnız (bir ildən sonra təkrar olunur. Oradan yorğa atlar aparılır və başqa yerlərdə bunlara oxşar at yoxdur.

**(27) XİLAT -** Uzunluq dairəsi - 75°30', en dairəsi - 39º20'-dir. Böyük şəhərdir. Ermənİyənin mərkəzidir. Bərəkətli və meyvəli yerdir, çoxlu suları və ağacları var. Əhalisi - müsəlman və xaspərəstlərdir, əcəmcə, ermənicə və türkcə danışır. Şəhərin möhkəm divarları var. Əhalisi qıfıl qayırmaqda mahirdir. Başqa yerlərdə belə qıfıllar tapılmır.

Buradan başqa öləkələrə tirrix adlı balıq aparılır.

**(28) XARƏZM -** Çoxlu şəhər və kəndləri olan məşhur və geniş nahiyədir. Əhalisi cəsur ürəkli və inadlıdır. Onlar soyuqqanlı, dindar, sözlərində duran və səmimidirlər. Onların inamı xeyirxahlıqdır və nifrəti hər cür pisliyədir. Qəriblərə xeyirxah, zəiflərə - rəhmlidirlər.

Havası ən sağlam, suyu ən şirin və ən görkəmlidir. Nahiyə yorğa atları, şahinləri, müxtəlif yunu və rəngarəng geyimləri ilə məşhurdur.

Oradan Çeyhun çayı axır. Onun başlanğıcı Bədəxşandadır. Bu çaya Xuttalın, Buttamın, Sağaniyanın çayları və türklər ölkəsindən tökülən, Vaxş torpağından və ən dar yerin üzərində tikilən körpünün altından axan Vaxşab çayının suları tökülür. Bu körpü Xuttal ilə Vaşcirdin arasında sərhəddir. Sonra Ceyhun çoxlu şəhərlərin yanından keçib Xarəzmə çatır. Xarəzmdən başqa onun suları ayrı vilayətlərdə istifadə olunmur. Sonra çay buradan axıb Xarəzm adlı gölə tokulür. Göllə Xarəzm [şəhərinin] arası altı günlük yoldur.

Göldən qarpıza oxşar və yəhudi daşı adlanan daş çıxarırlar. Bu daşın çoxlu faydalı xassələri var, biri də - böyrəklərdən daşların çıxarılmasıdır.

**(29) XOY -** Uzunluq dairəsi - 79°40', en dairəsi - 37º40'-dir. Azərbaycanda möhkəm divarları, suyu, bağ-bostanı və nemətləri bol olan məskun şəhərdir. Orada Kankala adlı bulaq var. Onun suyu yayda soyuq və qışda isti olur.

Şəriət fənlərini və əqli elmləri bilən qazi Şəmsəddin əl-Xuvəyyi[1] buradandır. Tatarların basqını zaman o, Xorasandan qaçıb Şama getdi və gənc yaşında 637 (1240)-ci ildə vəfat etdi.

**(30) XİVAQ** - Xarəzmdə bir kənddir. Şeyx, imam, şeyxlər nümunəsi, Nəcməddin əl-Kubra kimi tanınan Əbdülcənnab Əhməd ibn Ömər ibn Məhəmməd əl-Xivaqi buradandır. O, zəmanəsinin ustadı və tayfanın şeyxi idi. O, Risalə əl-xaif əl-haim fi min laumat əl-laim əsərinin müəllifidir. Buna bənzər əsər heç kəs tərəfindən yazılmayıb. O, 617 (1221)-ci il radələrində vəfat edib.

**(31) DEYR BAR SAUMA** - Rum ölkəsində, Malatiya yaxınlığında, dağ başında yerləşən xaçpərəstlərin hörmət bəslədiyi monastırdır. Deyirlər ki, Bar Sauma havarilərindən idi. Burada çoxlu rahib var. Buranı Rumdan, Diyar - Bəkrdən və Şamdan gələnlər ziyarət edirlər.

**(32) RUM** - Geniş ölkədir. Ən gözəl və ən bərəkətli diyardır, çoxlu nemətləri, möcüzələri var. Buranın suyu ən dadlıdır, havası ən sağlam, torpağı isə ən münbitdir.

Onun xüsusiyyətlərindən - heyvanlardan aldıqları məhsuldur və firavanlıqdır. Əhalisi müsəlman və xaçpərəstlərdir. Buranın qışı elə soyuqdur ki, su buza dönüb daş kimi olur. Rumun əhalisi beşinci və altıncı iqlimin qərbində yaşayırlar.

Soyuğa görə bu ölkə əhalisinin çoxunun dərisi ağ və saçları sarışındır. Ləzzət və şadlıq əhalinin əsas zövqüdür, çünki Rum ölkəsi Zöhrə ulduzunun altındadır. Xüsusiyyətlərindən birisi də burada dəvələrin olmamasıdır. Dəvələr burada balalamır.

Rumun əhalisi öz çarlarının, hakimlərinin və rahiblərinin şəkillərini çəkirlər və onlar öləndən sonra bu şəkillərdə təsəlli tapırlar. Onlar rəssamlıqda elə mahirdirlər ki, insanın şəklini gülən, ağlayan, şən və kədərli vəziyyətdə də çəkə bilirlər.

Orada olan Ustan dağının ortasında dağ keçidinə bənzər bir yer var. Buradan keçənlər üçün burada yaşayış yerləri var. Yoldan keçən pendir - çörək yeyir və buna görə yolun əvvəlindən axırınadək onu buradakı itlər dişləmir, başqalarını isə dişləyirlər. İtlər pendir - çörək yeyənlərin ayaqlarının arasından keçib, onlara heç bir xətər yetirmirlər. Bu - məlum şeydir.

Aqşəhərlə Antakiyanın arasında atəş mənbəyi var və əgər onun içinə qamış parçasını salsan, o alışar. Bu barədə sultan Əlaəddinə[1] xəbər verirlər, o da inanmayıb əmr edir ki, bunu yoxlasınlar. Yoxlayıb görürlər ki, düzdür.

**(33) RUNDA -** Əndəlusun nahiyələrindən birində şəhərdir. Qədimdə buraya suyu şərq və qərb nahiyələrindən gətirirdilər və şəhərdə tədricən su ehtiyatı əmələ gəlirdi.

Oradan Runda çayı axır. Onun suyu mağaranın içinə tökülüb yerin altına gedir. Bir neçə mil çayın suyunu heç kəs görmür. Sonra çayın suyu yer üzünə çıxıb öz yolu ilə axır.

**(34) ZƏMƏXŞƏR -** Xarəzmin kəndlərindən biridir. İmam və alim Əbülqasim Ömər ibn Mahmud Carullah əz-Zəməxşərin buradandır. O, ərəb dilinin və bəyan elminin ustadı idi, və o, gözəl əsərlərin müəllifidir. Mahiyyət və məna baxımından onun kimi belə gözəl əsər yazan olmayıb. O, Məkkədə Kitab əl-kəşşaf fi-l - haram əş şərif hətta vəqəə ət-təuvil xaysu vəcədə ət-tənzil adlı əsəri tərtib edib.

**(35) SƏMƏRQƏND -** Uzunluq dairəsi - 98°20', en dairəsi - 40°05'-dir. Mavəraünnəhrdə məşhur şəhərdir. Suqdun paytaxtıdır. Deyirlər ki, onun birinci hökmdarı Keykavus olub. Yer üzündə bunun kimi gözəl və qəşəng şəhər yoxdur.

Orada mağaralı bir dağ var, içindən su axır. Yayda bu su buza dönür, qışda isə yanır.

Gözəl imam, zəmanəsinin möcüzəsi olan Ruknəddin əl-Amidi[1] buradandır. Onun şöhrəti aləmə yayılmışdı. O, 615 (1218)-ci ildə vəfat edib.

**(36) SİVAS -** Uzunluq dairəsi - 71°30', en dairəsi - 39º30'-dir. Rumda bərəkətli, barlı, meyvəli, məşhur və möhkəm şəhərdir. Əhalisi - müsəlman və xaçpərəstdir. Müsəlmanlar tərəkəmələrdir və Əbu Hənifə məzhəbindəndirlər. Onların pozğunluğu və avaralığı hamıya məlumdur.

Sivasda qışda quşlara yem verməklə bağlı olan vəqf var. Bu hal yer üzünə qar yağanda və quşların səhralardan yaşayış məntəqələrinə uçuşu vaxtında olur. [Əhali] bu vəqfin hesabına gələn vəsaitə dən alır. və evlərin damlarına səpirlər. Haldan düşmüş quşlar da həmin damlara qonurlar.

**(37) ŞAŞ -** Uzunluq dairəsi - 99°10', en dairəsi - 42º30'-dir. Ceyhun çayının sahilindən o yana, türklər ölkəsiylə həmsərhəd olan nahiyədir. Türklər ölkəsinə görə burada ən böyük sərhəd istehkamları tikilib. Şaşın özü, bərəkətləri çox olan Allahın sağlam şəhəridir. Bütün evlərinin yanından su axır, özü də yaşıllıq içindədir. Şəhər sultan Məhəmməd Xarəzmşahın vaxtında viran edilmişdir.

Əbu Bəkr Məhəmməd ibn Əli ibn İsmayıl əl-Qəffal əş-Şaşiq buradandır. O, alim, fəqih və çoxlu əziyyətlər gördüyü üçün onu işgəncələrə saldırdı. Onu zəncirləyib həmin quyuya saldı və quyunun ağzını da böyük qaya ilə örtdü. Rüstəm gizlincə gəlib qayanı quyunun üstündən götürdü və Bicanı çıxarıb İran ölkəsinə apardı. Bican öz mülkünə qayıtdı, qaya isə orada qaldı.

Buradan adı «Şahnamə»də çəkilən Dəclə əl-Xənazir çayı* axır. Burada başqa ölkələrə aparılan vəhşi qızıl boya kökü** bitir.

**(45) SUĞD** - Buxara ilə Səmərqəndin arasında vilayətdir. Dünyanın cənnətlərindən biridir. Bağlar içində yerləşən və araları kəsilməyən kəndlərdən ibarətdir. Çoxlu ağacları, bir - birini səsləyən quşları və suyu çox çayları olan Allahın ən yaxşı guşələrindəndir. Onun uzunluğu beş günlük yoldur, sahəsi otuz altı fərsah qırx altı fərsahadır. Orada yaşıllıqlar, bağlar, çəmənlər, axar sular və sahilləri boyunca zəmilər bir-birinin ardınca gəlir. Bağlar içində hovuzlar var. Bu - türklərin ən münbit və ən yaxşı ölkəsidir.

**(46) TARAZ** - Türkistanda yanaşı olan Şaşın ən uzaq vilayətində şəhərdir. Bura islam ölkəsinin sərhəddidir. Münbit torpağı, içməli suyu, yaxşı havası olan və cənnət bağına oxşar bir yerdir. Əhalisinin həm kişi, həm də qadınlarının gözəlliyi zərbi - misala çevrilib.

**(47) TURTUŞA** - Əndəlusda, Balanisyanın yaxınlığında, Abru çayının sahilində qədim şəhərdir. Şəhərin bir hissəsi sahildədir, bir hissəsi isə dənizdə və şəhər-şəhər içindədir. Onun xüsusiyyətlərindən biri də odur ki, heç vaxt qoşun buraya daxil olmayıb. Deyirlər ki, buraya heç vaxt ağcaqanad uçub gəlməz. Lakin əgər kimsə şəhər divarında durub əlini divardan o yana uzatsa, elə o an əlinə ağcaqanadlar qonar. Əlini aşağı salan kimi onlar uçub gedirlər. Orada əla sürmə və şüşə mədənləri var.

**(48) TULAYTULA** - Əndəlusda böyük şəhərdir. Əhəmiyyətinə və bol nemətlərinə görə Əndəlusun ən şöhrətli şəhəridir. Havası təmiz, torpağı münbitdir. Onu padşahlar şəhəri adlandırırlar. Taxılı anbarlarda yetmiş il qalıb xarab olmur. Orada dünyada bənzəri olmayan bir körpü var. Onu təsvir edənlər deyirlər ki, körpü çayın iki sahilini birləşdirən bir tağdan ibarətdir. Surda olan körpünün tağından başqa buranın nəhəng tağlı körpüsündən heç

---

* "Donuzların pələngi".
** Marena.

yerdə yoxdur. Deyirlər ki, cinlər Tulaytulanın yaxınlığından axan böyük çayın üzərindən nəhəng daşlardan hündür bir körpü tikdilər və bu körpü iki dağı göyqurşağı kimi birləşdirir. Buradakı hər daşın ölçüsü böyük ev kimidir. Bu daşlar dəmir lövhələrlə bağlanıb, qara qurğuşunla bərkidiliblər.

Orada yağış daşı[1] və iki daşdan düzəldilmiş öküzlərin timsalı var. Şəhərdə padşah evi var və hər ölən padşahı burada dəfn edirlər və sinə daşının üstündə neçə il yaşayıb padşahlıq etməsini həkk edirlər.

**(49) ĞARNATA -** Biranın yaxınlığında Əndəlusun böyük gözəl və istehkamlı şəhərlərindəndir. Şəhərin adı onların dilində «nar» deməkdir. Şəhərin içindən Falum adlı çay axır və onun suları çayın yatağından saf qızıl danələri çıxarır. Şəhər üzərində yüksələn qarlı dağ var. Orada dünyanın ən əcaib zeytun ağacı bitir. İlin müəyyən günündə gün çıxanda oradakı bulağın suyu həddindən çox artır və suları daşır və elə bu vaxt həmin zeytun ağacı gül açır, toxum verir, toxumlar böyüyür və yetişib qaralır.

**(50) FARAĞA -** Əndəlusda, Laridanın yaxınlığında şəhərdir. Yaxşı binaları, suları, bağ-bostanı, daxildən də, xaricdən də gözəl görkəmi olan şəhərdir. Orada çoxlu zirzəmilər var və düşmən şəhərə basqın edəndə əhalisi burada gizlənir.

**(51) FƏRĞANƏ -** Türklər ölkəsiylə həmsərhəd olan Mavəraünnəhrdə nahiyədir. Orada bol məhsullar və çoxlu meyvə olur. Nahiyəni Ənuşirvan abadlaşdırıb oraya hər evdən adam köçürtdü və adını hərxana qoydu. Əhalisi ən doğru və mömin adamlardır. Orada türklər ölkəsinə qədər uzanan dağlar var. Orada heç kəsdə olmayan üzüm, alma, qoz, ətirli otlar bitir və yenə də yiyəsi olmayan püstə var. Orada elə bir dağ var ki, onun daşları kömür kimi yanır və yanıb külə dönəndən sonra bu külü paltar yuyanda istifadə edirlər. Elə bulaqları var ki, suyu yayda donur, qışda isə çox isti olur. Orada qızıl, gümüş, civə, dəmir, mis, firuzə, kuporos, naşatır, neft, qətran və qır mədənləri var.

Rəşidəddin adlanan şeyx Ömər əl-Fərğani buradandır. O, alim, biliklər mənbəyi idi. Ədəbiyyatda, fiqhdə, qanunlarda və müdriklərdə fərqlənirdi. Xəlifə əl-Müstənsir[1] onu mədrəsəsinə müdərris təyin etmişdi.[*]

---

[*] Sonuncu abzas Qəzvində yoxdur.

**(52) QALİQALA** -Ərminiyədə şəhərdir. Buradan xalçalar və əzzəlali[1] ixrac olunur. Əhalisi bunların toxunmasında mahirdir. Orada Palma Budağı adlı xaçpərəst kilsəsi var. Orada onların yazıları və xaçları saxlanılır. İlin müəyyən bazar günündə bu yerin qapısını açıb oradakı ağ toz-torpağı təmizləyib xaçpərəstlərə paylayırlar. Bu adamları əqrəb və ilandan qoruyur. Əgər birisini əqrəb və ya ilan çalsa, həmin tozu suda qarışdırıb xəstəyə verirlər ağrı elə o an kəsir.

**(53) QURTUBA** - Uzunluq dairəsi - 38°26', en dairəsi - 05º05'-dir. Əndəlus ölkəsinin ortasında nəhəng bir şəhərdir. Bura - Qurtuba Əməvilərinin itamətgahı idi. Onun çevrəsi on dörd mil, genişliyi isə - iki mildir. Şəhər böyük çayın üzərindədir və çayın üstündə iki körpü var.

Şəhərdə bütün islam dünyasında ən böyük Cümə məscidi var. Orada əl-Usra[***] adlanan və xaçpərəstlərin ən hörmətli kilsəsi yerləşir.

Orada gümüş, sink və qan axınını dayandıran əş-şəzənc adlı daşın mədənləri var. Qurtubadan bahalı, hərəsi beş yüz dinara qədər qiyməti olan qətir ixrac olunur.

**(54) QƏLƏT ƏL-LAN (ALLAN)** - Uzunluq dairəsi - 83°05', en dairəsi - 44°05'-dir. Allan torpağında, Bab Allan adlı dağın başında yerləşən möhkəm qaladır. Onu Sindbad ibn Güştasb ibn Löhrəsb bina etdirib. Deyilənə görə burada təkcə bir adam yer üzünün bütün padşahlarının qoşunlarının keçməsinə mane ola bilər. Qala möhkəm bir qayanın üstündədir. Orada bir qayadan vuran şirin su bulağı var. Şəhərdə əcaib tikintilərdən sayılan böyük körpü var.

**(55) QEYSƏRİYYƏ** - Uzunluq dairəsi - 69'05', en dairəsi - 39º30'-dir. Əhalisi çox, binaları böyük və daşdan tikilən Rum ölkəsinin böyük şəhərlərindəndir. Orada xalq tərəfindən ziyarət edilən qədim abidələr var. Orada Məhəmməd ibn əl-Hənəfiyyənin[1] qaldığı zivdan və Əbu Məhəmməd əl-Battalın məscidi var. Dünyanın möcüzələrindən olan və suyu təkcə bir çırağın istisiylə qızınan, müdrik Balinasın Rum çarı üçün tikdirdiyi hamam da ordadır. Şəhərin yaxınlığında çoxlu ilanı olan bir dağ var, lakin bu ilanlar tilsimlənib və yenə üzünə çıxa bilmirlər.

**(56) KİŞŞ** - Uzunluq dairəsi - 99°30', en dairəsi - 39º30'-dir. Səmərqənd yaxınlığında içqalası və ribatı olan istehkamlı

---

[***] Əl – Usra – "Əsir olunanlar".

şəhərdir. Çevrəsi - üç fərsahdır. Çox gözəl binaları var. Orada axar sular və bağlar var, lakin suyu zəhərlidir. Orada başqa ölkələrə aparılan tərəncübin bitir. Dağlarında çoxlu dərman bitkiləri var. Burada daşa dönmüş duz çıxarılır.

**(57) KƏNDBADAM -** Mavəraünnəhrdə, Xocənddə bir kənddir. Burada əl-farik* adlı badam növü bitir. Çox incə qabığı var, barmaqlarını sürtsən qabığı düşür və buna görə də bunu kəndbadam adlandırırlar.

**(58) LABLA -** Əndəlusda, İşbiliyanın yaxınlığında, barlı, bərəkətli qədim şəhərdir. Burada qədim abidələr var. Buradan Lahaş adlı çay axır. Onun üç mənbəyi var: birincisi - suyu çox və dadlı olan Lahaş çeşməsidir, ikincisi - Şabb çeşməsidir, burada zəy yığırlar və üçüncüsü - Zac çeşməsidir, burada da kuporos yığırlar. Lahaşın suyu artanda, dadlı olur, Şabbın və Zacın suları artanda isə, dadı dəyişir.

Şəhərin divarları dörd sənəm heykəli üstündə qurulub və belə çıxır ki, şəhər dörd sənəm üstündədir. Yüksələn binalar bu sənəmlərin boyunları üstündə tikilib. Özünə görə bu şəhərin oxşarı dünyada yoxdur.

Orada ovçuluq ham quruda, həm də dənizdədir. Buradan gözəl vəhşi zəfəran və dünyada bərabəri olmayan innab aparılır. Burada Taif gönünə bənzər gön istehsal olunur.

**(59) LAŞBUNA -** Əndəlusda, Qurtubadan qərbdə, dəniz kənarında yerləşən qədim şəhərdir. Oradakı dağlarda yerlərdə olmayan cnis şahinlərin yuvaları var. Buranın şəkər kimi dadlı balından heç yerdə yoxdur. Orada saf qızıl mədəni var. Dəniz sahilində əla ənbərləri var. 563 (1167)-ci ildə şəhəri frənglər zəbt etdilər.

**(60) LURKA -** Əndəlusda böyük şəhərdir, Tudmir vilayətinin paytaxtıdır. Bura Əndəlusun ən bərəkətli yeridir, xüsusən meyvəsi çoxdur. Orada elə üzüm növü var ki, onun hər salxımının vəzni əlli rətldir, oranın buğda dənəsi adi buğdanın yüz dənəsi vəznindədir. Lurkanın torpağını orada axan Misirin Nil çayına oxşar çayın suyu ilə suvarılır. Orada bir dağın başında yerləşən kilsənin həyətində zeytun ağacı bitir. Hər il müyyən vaxtda o, bir günün içində gül açır, toxumlayır və yetişib qaralır.

---

* "Bərk badam".

(61) MAVƏRAÜNNƏHR* - «Nəhr» deyəndə Ceyhun çayı nəzərdə tutulur. Ən çiçəkli, münbit və bərəkətli vilayətlərdəndir. Orada heç boş yer yoxdur, hər tərəf ya şəhərdir, ya kənd, ya da taxıl zəmiləri. İqlimi ən gözəldir, suyu ən dadlıdır, o cümlədən də, dağlarında. Torpağı ən münbitdir. Şəhərləri Buxara, Səmərqənd, Cənd və Xocənddir. Əhalisi səxavətli, dində, bilikdə və əliaçıqlıqda təmizdirlər. Mavəraünnəhrdə insanlar sanki bir evdə yaşayırlar və hər bir insan qərib olsun, ya yerli, özgə evinə öz eni kimi gəlir. Oranın hər kişisinin fikri-zikri bir şeyin üzərindədir: öz qonağına bütün var-dövlətini verməyə hazırdır, baxmayaraq ki, o, bu adamı bu vaxta qədər heç tanımırdı da və bu hərəkətinə görə özü üçün heç bir mükafat ya qazanc da gözləmirdi. Buranın əhalisi karvansarayların tikilməsi, yollarını abadlaşması və cihad və elm adamları üçün vəqflər təşkil edilməsi ilə məşğuldur.

Mavəraünnəhrin özü, Xarəzmdən Fərğanayadək sərhədyanı vilayətdir.

(62) MƏDİNƏT ƏN-NAXXAS** -Şəhəri həmçinin Mədinət əs-Səfər adlandırlar. Onun haqqında əcaib və ziddiyyətli məşhur hekayət var. Onu İskəndər Zülqərneyn bina etdirib və o, burada öz xəzinəsini gizlədib şəhəri tilsimlədi. Heç kəs bilmir ki, bu xəzinə haradadır. Şəhərin içində əl-baxta[1] adlı daş qoyulub və əgər insan onunla üzbəüz dursa, daş onu sanki bir dəmir kimi özünə çəkir və [insan] ondan ayrıla bilməyib ölür. Bu daş Əndəlusun səhralarında tapılır.

Mədinət ən-Naxxasın çevrəsi qırx fərsah, divarlarının hündürlüyü isə beş yüz dirsəkdir. Onun bayır qapısı yoxdur, binası isə möhkəmdir. Həliqətdə isə onu Davud oğlu Süleyman tikdirib. [Xəlifə] Abdülməlik ibn Mərvanın amili Musa ibn Nüsəyr[2] öz qoşunu ilə şəhərə yaxınlaşıb onunla üzbəüz yüksək bir tikinti qurdu. Onun üzərində divarın yuxarısına çatan taxtadan nərdivan düzəltdi və bir adama çox pul verib oraya göndərdi. Həmin adam şəhərin içinə baxıb güldü və özünü divardan oraya atdı. Qoşunlar dəhşətli qışqırıqlar eşitdilər. Sonra [Musa ibn Nüseyr] ikinci adamı göndərdi və ona çoxlu pul verib söz aldı ki, o, şəhərə girməsin və yalnız divarın üstündən gördükləri haqda xəbər versin. Bu adam qalxıb şəhəri görəndə güldü və özünü aşağıya atdı. Bundan sonra o, igid bir

* “Çayın o tərəfində olan [torpaqlar]”.
** “Mİs şəhər”.

döyüşçünü çağırıb, belinə bərk ip bağladı. Bu da şəhəri görən kimi özünü yerə atdı. Bunlar onu iplə geriyə çəkdilər, lakin ip ortasından qırıldı. Və [Musa] başa düşdü ki, şəhərdə cinlər var və bunlar divarlara qalxanları yerə çəkirlər. Onlar şəhəri almaqdan imtina edib çıxıb getdilər.

**(63) MASİSA** - Uzunluq dairəsi - 69º45', en dairəsi - 36°45'-dir. Rum torpaqlarında, [Ceyhun çayının] kənarında, müsəlmanların sərhədyanı şəhər və qalasıdır. Ona Masisa ibn Rum ibn Yakan ibn Sam ibn Nuhun, - ona salamlar olsun! - adı verilib. Bu şəhərin xüsusiyyətlərindən biri də odur ki, Masisanın xəzində güvə olmayır və xəz yuyulsa belə öz görkəmini itirmir. Bəzən bir xəzin qiyməti otuz dinara çatır. Bu xəzlər başqa ölkələrə aparılır.

**(64) MALATİYA** - Rum torpaqlarında məşhur şəhərdir. Orada bir dağda şirin suyu olan bulaq var. İnsanlar bu suyu içirlər. Lakin suyun özü bir qədər axdıqdan sonra daşa dönür.

**(65) MUĞAN** - Uzunluq dairəsi -83°05', en dairəsi - 39º05'-dir. Azərbaycanın ucqarında yerləşən çoxlu kəndləri və çəmənlikləri olan vilayətdir. Ərdəbildən Təbrizə gedən yolun sağ tərəfindədir.* Geniş olduğuna və otlaqların çoxluğuna görə tərəkəmələrlə məskun olunmuşdu. İndi isə buralar tatarların qışlaqlarıdır, tərəkəmələr isə oradan gediblər.

**(66) NAQCUVAN** - Uzunluq dairəsi - 81°45', en dairəsi - 33°40'-dir. Divarları və içqalası olan Azərbaycanda gözəl şəhərdir. Şəhər düzənliyin ortasında yüksək yerdə bina olunub. Bu yerdən Araz çayı görünür. Bağlı - bostanlı, meşəli, meyvəli və çörəkli yerdir. Havası təmiz, suyu şirindir. Orada məşhur binalar, mədrəsələr və xanəgahlar var. Əhalisi nəqqaşlıqda və xələnc ağacından qab-qacaq və müxtəlif əşya düzəltməkdə mahirdir. Bütün bunlar müxtəlif ölkələr aparılır.

**(67) HƏRQALA** - Rumda böyük şəhərdir. [Bizans] çarlarının iqamətgahıdır. Şəhəri Rum çarlarından biri hərqal (İraqli) bina etdirib. 191 (807)-ci ildə şəhərə xəlifə Harun ər-Rəşid hücum etmişdir. O, öz qoşunları ilə şəhəri alana qədər mühasirə etmişdi, Əhalisini əsir aparıb, şəhərin özünü dağıtmışdır.

---

* Əlyazmada boşluq var. Qəzvində isə: "Bütün Azərbaycanda hava soyuduqca, bu yer çox istidir.

**(68) HƏZARƏSP -** Uzunluq dairəsi - 94°05', en dairəsi - 41°05'-dir. Xarəzmdə böyük şəhər və müstəhkəm qaladır. Ada kimi hər tərəfini su əhatə edir və buraya yalnız bircə yol var.

İbrahim əl-Həzarəspinin qızı Rəhmə buradandır. O, otuz il ac qalandan sonra vəfat edib və bununla məşhurlaşıb.

**(69) VAŞALA -** Azərbaycanda, Xoy dairəsində bir kənddir. Orada elə bir bulaq var ki, onun suyunu içənin qarnı işləyir və mədəsində olan şeydən azad olur. Adam azacıq çörək yeyib bu sudan içsə onun qarnı elə o an işləyər.

**(70) YASSI ÇƏMƏN -** Xilatla Ərzən ər-Rumun arasında bir yerdir. Orada elə bir bulaq var ki, onun suyunun şırıltısını uzaqdan eşitmək olur. Əgər bulağın yanına bir heyvan gəlirsə, elə o anda həlak olur. Bulağın ətrafında çoxlu heyvan və quş leşləri var. Bulaq başına bir adam qoydular ki, o, özgə adamları ona yaxın buraxmasın.

**(71) YUNAN -** Rum diyarında çoxlu şəhərləri və kəndləri olan bir yerdir. Bura Yunan mütəfəkkirlərinin vətənidir. İndiki zamanda bu torpaqları su basıb. Əgər kimsə burada nə isə yadında saxlayıbsa, bunu heç vaxt unutmaz.

Kəmilərlə gedən tacirlər bu yerə çatanda unutduqları hər şey yadlarına düşür.

Əflətunun ustadı sokrat buradandır. O, mütəfəkkir, bu dünyada zahid və o dünyada müqəddəslərdəndir. Aristatalisin ustadı Əvlatun buradandır. O, bu dünyada həkim və zahid idi və ruhların bədəndən bədənə keçməyini təkid edirdi. Aristatilis də buradandır. Onu «Birinci Müəllim» adlandırırlar çünki o, hikmət elmini təftiş edib, onun zəif cəhətlərini aradan götürdü. O, iddiaçının dəlillərini müəyyən və ittihamın verməsinin qaydalarını təyin edib. O, məntiq elmin təsis edib. O, öz ustadı ilə razılaşmayıb ruhların bədəndən bədənə köçmə təlimini yalan hesab edib.

Diucanis (Diogen) də buradandır. O, həkim və tərki-dünya idi. Bu dünyanın düşkünlülərindən və zövqlərindən vaz keçib, özünə zahidlik seçmiş idi. O, yanına gələnlərdən narazı idi.

Bətlimus da buradandır. O, əl-Məcisti elminin banisidir. Fələklərin hərəkətlərini və ulduzların seyrini, yerlə göyün arasında olan məsafəni, usturlabı və təqvimi riyaziyyat sübutlarıyla bilirdi.

Tilsimlər haqqında elmin yaxşı bilicisi Balinas da buradandır. Bunlar göy və yer cisimlərindən xüsusi vaxtlarda hasil olunur.

Ulduzlar vasitəsilə hökm çıxaran Bətləmius da buradandır. Təkid edirlər ki, o, təcrübəsinə əsaslanıb fələklərin hərəkətlərinə nəzər salaraq hadisələrin olmasını dərk etmişdir. Musiqi elminin bilicisi Fisağuras, «Fərasət» kitabının müəllifi Əqlimun həndəsi fiqurların və etibarlı sübutların banisi İvqlidus, rəqəmlər haqqında elmin müəllifi Arşimidus, tibb elminin qanunları haqqında mükəmməl sözlərin müəllifi İbuqrat və müalicə və əcaib ilağlar elminin bilicisi Calinus da buradandırlar.

## ALTINCI İQLİM

Gecə-gündüzün bərabərliyində günorta vaxtı kölgənin uzunluğu yeddi qədəm onda altı qədəm və on altıda bir qədəm olan yerdə başlanır. Axırı isə bir -qədəm artıqdır. İtlim Kani, Kun,* Xirxiz, Kimak, Toğuzğuz, türkmənlər ölkəsi, Xəzər kimi Məşriq türklərinin yaşadığı yerlərdən və allanlarla Sərirdən başlanıb, Kunistantiniyyə, Böyük Rumiyyə, almanlar və firənglər ölkəsinə tərəf uzanır, Əndəlusun şimal tərəfindən keçib Məqrib dənizində axıra çatır.

İqlimin əvvəlində günün uzunluğu on beş saat yarım və on beş dəqiqədir. Məşriqdən Məqribə qədər uzunluğu, iqlimin ortasında yeddi min yüz yetmiş beş mil və altmış üç dəqiqə və enliyi isə iki yüz on beş mil və otuz doqquz dəqiqədir.

İndi isə bu iqlimdə yerləşən şəhərlərin adlarını sırayla yada salaq.

**(1) ABULDA**** - Binaları daşdan olan firənglər torpağında böyük şəhərdir. Rahiblərdən başqa burada heç kim yaşamır, qadınlar və uşaqlar isə buraya gəlmir. Bunu onların Baq Alb (Bauqluf)*** adlı şəhid yepiskopları vəsiyyət edib. O, buraya birinci gəlib həmin şəhərin binasını qoymuşdur. Bu - xaçpərəstlərin hörmət etdiyi böyük kilsədir. Bura qızılı və gümüşü ən çox olan ölkədir və onların qab-qacaqlarının əksəriyyəti qızıl və gümüşdəndir.

Orada bu şəhərin şahidini təsvir edən gümüşdən düzəldilmiş və üzü tərbə baxan heykəli və bundan başqa qızıldan düzəldilmiş və ağırlığı üç yüz rətl olan sənəm var. Bu sənəmin

---

* Qəzvində - Tundur.

** Əlyazmada – Abukandadır.

*** Əlyazmada Tac əl – Labadır.

arxası geniş bir taxtaya bağlıdır və ətrafı da yaqut və zümrüdlərlə bəzənib. Bu - Məsihinin surətidir.

**(2) BANİ VƏ ƏRİŞ** - Firənglər ölkəsində iki şəhərdir. Hər iki şəhər banilərinin adlarını daşıyır, birisi padşahdır, ikincisi isə arvadıdır. Bani şəhəri çox şərəflidir. Mərkəzində mərmər sütun ucalır. Baninin heykəli də onun üstündədir. O, sanki dənizə baxıb İfriqiyədən gələn gəmiləri izləyir.

Əriş şəhəri Bani şəhərindən bir mil aralıdır. Onun da mərkəzində mərmər sütun ucalır və yuxarısında Ərişin heykəli yerləşir. Heykəllər də mərmərdəndir.

**(3) İFRƏNCƏ** - Altıncı iqlimin uzaq qərbində yerləşən geniş məmləkətdir. Orada yüz əlliyə qədər şəhər var. Paytaxtı Bariza şəhəridir. Ölkənin uzunluğu bir aylıq yoldur, eni isə bundan çoxdur. Qeyri-münbit torpağı var, çox çətin şumlanır, üzümlükləri azdır, ağaclıqları yoxdur. Əhalisi firənglərdir, quruda və dənizdə müharibə edən xaçpərəstlərdir. Onlar döyüşlərdə mətin və qızğındırlar. Onlardan döyüş meydanından qaçan görməzsən və ölüm onlar üçün daha asandır, nəinki geriyə çəkilmək. Ruzilərini ticarət və sənətkarlıqla əldə edirlər.

**(4) UTRAXT** - Firənglərin geniş sahəli böyük şəhərlərdəndir. Torpaqları şorandır və nə taxıl, nə də meyvə ağacları bar verir. Ruzilərini mal-qaradan, südündən və yunundan əldə edirlər. Öz ehtiyaclarına lazım olan odunları yoxdur. Odunu əvəz edən gilləri* var.

**(5) İRLANDA** - Altıncı iqlimin şimalında adadır. Məcusların** bütün dünyada yeganə sığınacağı buradır. Adanın çevrəsi min mildir. Buranın əhalisi məcusların adətlərini və paltarlarını saxlayır. Onlar qiyməti yüz dinar olan əba geyirlər. Əyanları isə daha bahalısını geyir.

**(6) BURZİLA** - Firənglər nahiyəsində şəhərdir. Suyu, ağaclıqları, meyvələri və dənli bitkiləri boldur. Əhalisi xaçpərəstlərdir. Orada hündür sütunların üstündə böyük bir tikinti var. Şəhərin dəniz sahili hissəsində əla ənbər var. Deyirlər ki, qışın çovğunları başlananda dənizə çıxmaq mümkün olmayır və buranın adamları qonşuluqda olan adaya gedirlər. Adada Madika adlı ağac bitir. Aclıq baş verəndə onlar bu ağacın qabığını soyurlar və gövdə

---

* Söhbət torfdan gedir.
** Normanlardır.

ilə qabığın arasında ağ rəngli maddə tapıb onu havalar yaxşılaşana qədər yeyirlər. Şəhərin və dənizin yanında bir dağ ucalır. Dağın üstündə insanlara dənizə çıxmaq təhlükəsindən xəbərdarlıq edən büt var.

**(7) BURTAS** - Xəzərlər ölkəsində geniş və İtil çayı sahillərində yerləşən vilayətdir. Əhalisi müsəlmanlardır. Dilləri heç bir dilə oxşamır. Evləri ağacdandır və əhali bunlarda qışda yaşayır. Yayda çadırlarda qalırlar. Oralarda çox gözəl, qalın və qırmızı tükü olan tülkü var. Bundan burtas xəzləri hazırlanır. Yayda oralarda gecənin uzunluğu bir saata qədərdir.

**(8) BACANAKLAR ÖLKƏSİ -** Altıncı iqlimin şimalında səqləblərlə qonşuluqda yaşayan türk xalqıdır. Onlar uzunsaqqallı olur, aralarında uzunbığlılar da var, güclüdürlər, yenilməzdirlər. Onlar heç vaxt heç kimə xərac vermirlər. Bir-birinin üstünə vəhşi heyvan kimi hücum edirlər. Heyvan kimi adamların gözü qabağında qadınları ilə cinsi əlaqəyə girir və bunu heç iyrənc də hesab etmirlər. Yedikləri darıdır. Ölkələrinin uzunluğu on iki günlük yoldur.

**(9) BACALAR ÖLKƏSİ** - Uzunluq dairəsi - 65°5', en dairəsi - 14°05'-dir. Türk xalqıdır. Ölkələrinin uzunluğu bir aylıq yoldur. Onlar padşahlarına sitayiş edir, pələnglərə bac verir, inəklərə hörmət bəsləyib, ətlərini yemirlər. Orada çoxlu üzüm, əncir və qara zoğal var. Orada yanmayan ağac növü var. Onların bütləri bu ağacdandır. Xaçpərəstlər israr edirlər ki, bu ağaclar İsa, - ona salamlar olsun! - çarmıxa çəkildiyi ağacın gövdəsindən əmələ gəlib.

**(10) BUĞRACLAR ÖLKƏSİ** - Əhalisi türk xalqıdır. Onların bığı var, saqqalı yoxdur. Ölkələrinin uzunluğu bir aylıq yoldur. Onların hörmətli padşahları var. Deyirlər ki, Əlinin nəslindən və Yəhya ibn Zeydin kökündəndir. Padşahın zərli lövhəsi var və onun üzərində Zeydin eşqinə mərsiyə beytləri yazılıb. Belə hesab edirlər ki, Zeyd ərəblərin padşahı, Əli də ərəblərin ilahisidir. Onlar silah düzəldirlər, yeməkləri darı və qoyun ətidir. Geyimləri keçədəndir və başqa paltar geymirlər.

**(11) TATARLAR ÖLKƏSİ** - Çoxsaylı türk xalqıdır. Onlar altıncı iqlimin şərqində yaşayırlar. Qəlblərinin amansızlığı, xasiyyətlərinin kobudluğu, bədənlərinin möhkəmliyi və təbiətlərinin sərtliyi ilə vəhşi heyvanlara bənzəyirlər. Düşmənçiliyi xoşlayırlar, qan tökəndirlər və heyvanları incidirlər. Onlarda nə icazə verilmiş, nə də qadağan olunmuş şey var. Əllərinə nə düşürsə, yeyirlər.

Günəşə sitayiş edirlər. Onların dili nə başqa dillərə, nə də türk dilinə oxşayır, yazıları da başqa yazılardan fərqlənir.

**(12) TOĞUZĞUZLAR ÖLKƏSİ** - Türk xalqıdır. [Ölkələrinin] uzunluğu iyirmi günlük yoldur. Onlarda ibadətgah yoxdur. Atlara pərəstiş edirlər, atlara yaxşı yem verib [bir-iki] yaşlı atları və dayçaları yeyirlər. Göy qurşağını görəndə bayram keçirirlər. Onlarda qan daşı var. Əgər bu daşı qanaxan yarası olan insanın boynundan assan, qan axması dayanar.

**(13) XUKAKLAR ÖLKƏSİ** - Bunlar türkdür. Ölkələrinin uzunluğu qırx günlük [yoldur]. Aralarında xaçpərəstlər də var. Xoş simadılar.

Kişiləri öz qızları, bacıları və başqa qohumları ilə evlənirlər. Bu - onların adətləridir, baxmayaraq ki, məcus deyillər. Böyük Ayı bürcünə sitayiş edirlər. Aralarında kinli olanı yoxdur və başqa türk qəbilələri bunların ürəyiyumşaq olduqlarına görə torpaqlarını zəbt etmək istəyirlər. Burada parıldayan daş tapılır. Padşahları yoxdur. Evləri ağacdan və sümükdəndir.

**(14) XATİYANLAR ÖLKƏSİ** - Türkdür. Ölkələrinin uzunluğu iyirmi günlük [yoldur]. Ağıllı və düşüncəlidirlər. Başqa türklərin əksinə bunlar [müsəlmanlar kimi] evlənirlər. Onların ağıllı şeyxləri var və hökmləri çıxaran odur. Orada çox ətirli müşk var və qoxusu yalnız öz torpaqlarında gəlir. Orada bir ilanlı dağ var və əgər kimsə bu ilanlara baxsa, elə o an elər. Lakin [ilanlar] bu dağı heç vaxt tərk etmirlər.

**(15) KARLUKLAR ÖLKƏSİ** -Türkdür. Ölkələrinin uzunluğu iyirmi beş günlük [yoldur]. Bunlar zorakılıq və haqsızlıq görən və bir-birinə basqın edənlərdir. Zina onlarda açıqdır. Onların bir qumar oyunu var və oyun öz arvadını, qızını və anasını da uduza bilər. Çox gözəl və pozğun arvadları var, ərləri isə o qədər də qısqanc deyil. Əti duza vurandan sonra yeyirlər. Orada ağacdan tikilmiş ibadətgah və ev var. Həmin ağac odda da yanır. Orada gümüşlər civənin mədəni var. Ölkələrində bir çay axır və bu çayın suyunda ilan olur. Əgər bu ilanı bir heyvan görsə, elə on an yıxılıb özündən gedər.

**(16) XİRXİZLƏR ÖLKƏSİ** -Türkdür. [Ölkələrinin] uzunluğu bir aylıq [yoldur]. Onların padşahı var, ona tabedirlər və o, öz xalqının ehtiyaclarını bilir. Qırx yaşı tamam olmayana qədər padşahın yanına heç kəs girə bilməz. Namaz vaxtı onlar ahəngli

danışırlar. Namazı üzü cənubda qılırlar. Orada bir daş var, onu gecələr yandırırlar və bu daş onlarda çırağı əvəz edir.

**(17) XƏZƏR ÖLKƏSİ -** Bab əl-Əbvabdan o yana yaşayan çoxsaylı türk xalqıdır. Onlar iki tayfadır, biri ağ xəzərlər, digəri də əsmər xəzərlərdir. Çadırlarda yaşayırlar, lakin bir qədər palçıqdan düzəldilmiş evləri də var. Bazar və hamamları var. İtil çayının sahilində yaşayırlar. Onların çox böyük padşahları var, onu məlik* adlandırırlar. Aralarında çoxlu müsəlman, xaçpərəst, yəhudi və atəşpərəstlər var. Padşahlarının qırx yaşı tamam olanda, xalq onu yıxıb öldürür.

**(18) XUTTALAXLAR ÖLKƏSİ -** Türklərdir. Ölkələrinin uzunluğu on günlük yoldur. Türk qəbilələri arasında bunlar ən güclüdür. Onlar qonşuluqda yaşayanların torpaqlarına basqın edirlər. Öz işlərini ağıl və qaydayla görürlər. Onlar [öz] bacıları ilə evlənirlər. Qadınları ərə yalnız bir dəfə gedir. Zinaya görə onlar həm kişini, həm də qadını diri-diri yandırırlar. Onlarda boşanma yoxdur. Arvadın cehizi ərinin bütün varı-dövlətidir. Onlar [bir yaşı tam olmamış] dayçaların ətini yeyirlər. Qisas alma onlarda qanunidir, yaralara görə də onlar pul alırlar.

**(19) ĞUZZLAR ÖLKƏSİ -** Çoxsaylı türk xalqıdır. Xaçpərəstdir. Sultan Səncər ibn Məlikşahın hakimiyyətinə qədər Səlcuqların tabeliyində idilər. Sonra onlar üstün olub, Səncəri əsir aldılar və Xorasana hücum edib, oranı talan etdilər və çoxlu əsir apardılar. Bu əhvalat 948 (1153)-ci ildə olub. Səncər bir il onların əsiri oldu, sonra isə qaça bildi. Ölkələrinin uzunluğu bir aylıq [yoldur]. Onların daşdan, ağacdan və qamışdan tikilmiş şəhərləri var. İbadətgahları var. Onlar Hind və Sindlə alver edirlər. Onlarda sancıdan xilas edən ağ daş var.

**(20) RUS ÖLKƏSİ -** Böyük türk ümmətidir. Onların ölkəsi hər tərəfdən göl suları ilə əhatə olunan bir adada yerləşir və ada onların qalası və düşmənlərdən xilasıdır. Səqləblər ölkəsi ilə həmsərhəddir. Ticarətlərini İtil çayı boyu aparırlar. Onlar özlərini nəcislə murdar olmadan qorumurlar. Çarlarının qiymətli daşlarla naxışlanmış çox böyük yatağı var. Onun üstündə o, qırx kənizi ilə birlikdə oturur.* Onların qanunları və xüsusi dilləri var. Bədənləri palma kimi ağdır. Bunlar Allahın ən çirkin bəndələridir.

---

* Qəzvinidə - "Bələk"dir.
* Bax: İbn Fədlan, səh. 146.

**(21) DAXİLİ RUM ÖLKƏSİ** - Beşinci və altıncı iqlimlərin qərbində yaşayan böyük xəlqdır. İsav ibn İshaq ibn İbrahimin, - ona salamlar olsun! - nəslindəndirlər. Ölkələri geniş, dövlətləri böyükdür və buraya Rumiyyə ilə Qustantiniyyə də daxildir. Orada çoxlu meyvə və mal-qara var. Aralarında xaçpərəstlik yayılana qədər onlar filosofların təliminə riayət edirdilər. Məbədlərində xidmət üçün onlar oğlanlarını axtalayırlar. Əgər kimsə evlənmək və toy etmək istəyirsə, o, gəlini keşişin yanına aparır ki, onun bəkarətini alsın. Rum çarları qeysər adlanır. Bu çarlar daha işgüzar, ağıllı və biliklidirlər. Adətlərindən düşmənlərinə qəflətən hücum etməzlər, [əvvəlcə ona xəbərdarlıq göndərirlər].

**(22) KİMAK ÖLKƏSİ** - Türkdür. Ölkələrinin uzunluğu otuz beş günlük yoldur. Evləri heyvan dərisindəndir. Yeməkləri tərəvəz, noxud, qoyun və keçi ətidir. Dişi heyvanın ətini yeməzlər. Orada salxımın yarısı ağ, yarısı qara üzüm bitir. Həmçinin yağış əmələ gətirən daş var, bunu da istədikləri vaxt edirlər.[**] Onlarda qızılı asanlıqla əldə edilən qızıl mədəni var.

**(23) BAHRALAR ÖLKƏSİ** - Çoxsaylı türk ölkələrindən biridir. Əhalisi müsəlman, xaçpərəst, yəhudi, məcus və bütpərəstdir. Buna görə də çoxlu bayramları var. Bahralar ölkəsinin uzunluğu qırx günlük yoldur. Onların Bahr adlı, təcrübəli və əzəmətli çarları var. Orada dalağ xəstəliyindən xilas edən daş var. Əla oxları olur.

**(24) RUMİYYƏ** – Uzunluq dairəsi - 50°27', en dairəsi - 41°50'-dir. Rumların və onların elmlərinin baş şəhəridir. Şəhər Qustantiyyədən şimal - qərbədir, Aralarında əlli günlük [yol var]. Şəhər firənglərin əlindədir. Onlar çarlarını alman adlandırırlar. Binalarının əzəmətinə və əhalisinin çoxluğuna görə bura dünyanın ən əcaib yerlərindəndir. Şəhərin çevrəsi qırx mildir. Hər mil arasında darvaza var. Şəhərin üç tərəfi dənizə baxır, bir tərəfi quruyadır. Mərmərdən tikilmiş iki divarı var. Divarların arası boşluqdur. Onların enliyi on səkkiz dirsək, hündürlüyü altmış iki dirsəkdir. Divarların arasından çay axır, suyu bütün şəhəri dolanır, evlərin yanından və hətta içindən keçir. Suyu yaxşıdır. Çayın üstündən ölçüsü qırx altı dirsəklik mis tayları olan körpü salınıb. Çayın əsas axını [uzunluğu] doxsan üç dirsək və eni qırx üç dirsəkdir. Şəhərin bazarı şərqdən qərbə uzanır, onun örtüyü mis sütunların üzərindədir. Tavanı da misdəndir. Bazarın üstündə ikinci

[**] Bax: Biruni, səh. 205.

bazar var və bura tacirlərin ən görkəmliləri yığışır. Deyirlər ki, bu bazarın qabağında yenə bir bazar var, özü də mis dirəkləri üstündədir. Hər dirəyin uzunluğu otuz dirsəkdir. Bu dirəklərin arasından, bazarın əvvəlindən axırına kimi misdən düzəldilmiş kanal keçir, dəniz suları bu kanala axır və bu yolla gəmilər şəhərə daxil olur. Orada Mar Butrusun və Mar Baulusun eşqinə böyük kilsə tikilib. Hər ikisi burada dəfn olunublar. Bu kilsənin uzunluğu min dirsək, [eni] beş yüz dirsək hündürlüyü isə iki yüz dirsəkdir. Orada şəhidlər başçısı İstifanusun eşqinə tikilmiş ikinci kilsə var. Bunun uzunluğu altı yüz dirsək, eni üç yüz və hündürlüyü yüz əlli dirsəkdir. Bu kilsələrin tavanları, divarları, döşəmələri və bütün pəncərələri bütöv daşlardan düzəlib.

Orada kişi və qadınlar üçün on min monastır var. Şəhər divarlarının ətrafında rahiblər üçün otuz min sütun düzəlib. Orada on iki min küçə var və hər küçədə iki su arxı var - birisi içmək üçün, ikincisi - bağları sulamaq üçün. On iki min bazar və hər bazarda iki tərəzi var. Bütün bazarların döşəmələri mərmərdəndir, bazarlar mis sütunlar üzərində qurulub.

Orada altı yüz altmış min hamam, tibb, nücum və həndəsə elmlərini öyrənmək üçün mədrəsələr var. Orada Beyt əl-Müqəddəsdə olan Sihyun kilsəsinə oxşar Sihyun kilsəsi var. Onun uzunluğu bir fərsah, eni bir fərsah və hündürlüyü iki yüz dirsəkdir. Onun daxilində min iki yüz rəngli mərmərdən və min iki yüz zərli misdən sütun var. Hər sütunun hündürlüyü əlli dirsəkdir. Hər sütunun yanında bir tanınmış yepiskop durur. Üstündə qurban təqdis edilən səcdəgah yaşıl zümrüddən düzəldilib. Onun uzunluğu on iki dirsək, eni isə on dirsəkdir. Onlar səcdəgahın üstünə hərəsi üç dirsək hündürlüyü olan iyirmi qızıl heykəl qoyublar. [Heykəllərin] gözləri yaqutdandır.

[Kilsədə] sarı misdən min iki yüz böyük qapı və qırx qızıl qapı var. Bundan başqa çoxlu ebenus ağacından və fil sümüyündən düzəldilmiş qapılar da var. Kilsədə tavandan asılmış yüz otuz min* qızıl zəncir var, hərəsinin üstündə çıraqlar asılıb və bunlardan başqa bazar günü yavan çıraqlar da var.

Kilsədə buradan dolanacaqlarını alan yepiskoplar, keşişlər və s. var. Onların sayı əlli min [nəfərdir]. Kilsədə qızıldan düzəldilmiş on min bardaq və on min kiçik masa, on min qədəh və

* Qəzvinidə - 230 mindir.

on min çıraq var. Səsdəkahın ətrafında ysddi yüz çıraq var, hamısı da qızıldandır, pasxa bayramında kilsədən çıxarılan otuz min xaç və qızılla gümüşdən düzəldilmiş lövhələr var.

Bu kilsədə Adəmdən başlanmış İsaya və Məryəmə qədər bütün peyğəmbərlərin təsviri var. Kilsənin içində çarlar üçün xüsusi yer və onun da ətrafında üstlərində büt olan yüz sütun var. Hər bütün əlində zınqırov və bu zınqırovların üzərində bir xalqın adı yazılıb. Onlar təkid edirdilər ki, bunlar tilsimdir. Əgər bu xalqlardan biri hərəkətə gəlsə, o saat büt də hərəkətə gəlir və bunlar bilirlər ki, həmin xalqın çarı bunların əleyhinə nə isə hazırlayır və buna görə lazım tədbirlər görürlər.

Orada zeytun tilsimi var. Kilsənin qabağında sahəsi beş mil olan həyət var. Həyətin ortasında hündürlüyü əlli dirsək olan misdən sütun var. Onun üstündə əs-Sudani adlanan uçan timsal var. Bu - qızıldandır. Onun döşündə naxış və dimdiyində zeytuna oxşar bir şey var. Hər caynağında bir zeytun tutub. Zeytunun yetişən vaxtı gələndə, bu ölkənin quşları dimdiyində və caynaqlarında üç zeytun gətirib bu tilsimin üstünə atır. Tilsimə  gözətçi və nəzər  salanlar var və bunları çar təyin edir. Həyət zeytunla dolanda və vaxt gələndə gözətçilər yığışıb çara xəbər verirlər o da onların ağsaqqallarının və rütbələrinə görə başqalarının payını ayırıb, qalanını isə kilsəinn çıraqlarına baxanlara verir.

**(25) ZİRİH GERAN -** Mənası «Zireh düzəldən»-dir. Bunlar Bab əl-Əbvabın üstündə və ətrafları kəndlər, zəmilər, bağlar və sıx meşələr oln Elburus dağının yanında yerləşən iki kənddir. Əhalisi hündürboy, sarışın və iti göz adamlardır. Onların zireh və qalxan düzəltməkdən başqa ayrı sənətləri yoxdur. Varlı və əliaçıqdırlar, qəribləri, xüsusən elm sahiblərini və xəttatları xoşlayırlar. Yaşadıqları yer istehkamlı olduğu üçün onlar heç kəsə xərac vermirlər. Onların nə dini var, nə də imanı. Əgər bunlardan kimsə ölsə, onlar ölünün əzalarını və ətini ayırır, sümüklərini torbaya yığır, torbanın üstündə sümük sahibinin və atasının adını, təvəllüd və ölüm tarixini yazır və evin içindən asırlar. Sonra ətini götürüb, əgər ölən kişidirsə, qarğalara, yox qadındırsa çalağanlara atırlar.

**(26) YƏCUC VƏ MƏCUC SƏDDİ -** Deyirlər ki, bunlar Yafəs ibn Nuhun, - ona salamlar olsun! - övladlarıdır. Onlardan çoxlu nəsil törəyib və özləri də iki qəbiləyə bölünür və sayını Allah Təaladan başqa heç kəs bilmir. Zülqərneyn Yəcuc və Məcucun

yerlərinə gedəndə onun yanına çoxlu adam gəlib, dedilər: «Ey qalib padşah! Bu dağın arxasında sayını yalnız Uca Allah bilən bir xalq yaşayır. Onlar bizim ölkəni talan edir, meyvə və taxılımızı yeyirlər». O, soruşdu: «Onların görkəmi necədir?» Onlar dedilər: «Onlar alçaqboylu, dazbaş və yastı sifətdirlər». O, soruşdu: «Onlar nə qədərdirlər?» Cavab verdilər: «Çoxsaylı xalqdır və Allah Təaladan başqa onların sayını heç kəs bilmir».

Sonra adamlar dedilər: «Gəlsənə biz sənə bac verək ki, bizimlə onların arasında bir sədd qurasan?»* Bunun mənası da bu idi: «Bizdən pul yığıb, bu pulu bizimlə onların arasında tikdiyin səddə xərcləyəsən, bu şərtlə ki, səddin uzunluğu yüz fərsaha qədər olsun, eni əlli fərsah və hündürlüyü də iki yüz dirsək olsun».

(27) SAQSİN - Uzunluq dairəsi -86º30', en dairəsi - 43º05'-dir. Xəzər ölkəsində böyük və əhalisi çox olan şəhərdir. Çayları var. Əhalisi qırx qəbilədən ibarətdir. Şəhərdəki qərib və tacirlərin sayını yalnız Allah Təala bilir. Orada bərk soyuqlar olur. Əhalisinin çoxu müsəlmanlardır. Evlərinin damları şam ağacındandır.

Orada Dəclə çayından böyük müxtəlif balıqları olan çay axır. balıqlarından biri dəvə yükü vəznindədir. Onun qarnından çıxarılan piy o qədərdir ki, onunla bir ay bütün çıraqları təmin etmək olar. Ət burada çox ucuzdur. Qışda çay buz bağlayır və üstündən gedib-gəlmək olur. Çayın enliyi min beş yüz qırx addımdır. İndi çayın suyu şəhəri basıb və ondan heç bir əlamət də qalmayıb. Oradakı saray Berke adlı şəhərə gəldikdə isə, indi o, buradakı nahiyənin baş şəhəridir.*

**(28) ŞLAŞVİQ -** Əl - Muhit dənizinin sahilində çox böyük şəhərdir. İçində içməli su bulaqları var. Əhalisi Sirius ulduzuna ibadət edir. Az miqdarı xaçpərəstdir. Onların kilsəsi var. Əsas yeməkləri balıqdır. Onlarda boşanma qadınlar tərəfindən olur və qadınlar istədikləri vaxt özləri özlərini ərlilikdən azad edirlər.

**(29) ŞATAS -** Lakzan ölkəsində, uca dağın yanında şəhərcikdir. Oraya yol yalnız dağın zirvəsindən keçir. Dağdan enənin əlində əsası olmalıdır, bu da ondan ötrüdür ki, orada olan bərk küləklər adamı aparmasın. Çox şiddətli şaxtaları olur. Əhalisi mömin və dindardır. Sənətləri silah qayırmaqdır.

---

* Bax: Quran, Mağara surəsi, 93 və sonrakı.
* Son iki cümlə Qəzvinidə yoxdur.

**(30) ZAHUR -** Gəncədən altı mərhələ uzaqda yerləşən Lakzan ölkəsinin paytaxtı, əhalisi çox olan böyük şəhərdir. Ora çox soyuqdur. Suları Samur çayındandır. Bu çay qışda da, yayda da buz bağlayır. Əhalinin gücü orada əkilən əs-sult adlı dəndəndir. Görkəmindən arpaya, təbiətinə görə buğdaya oxşayır.

Əhalisi imam Şafeinin məzhəbindəndir. Orada Nizaməlmülkün tikdirdiyi mədrəsə var. Deyirlər ki özləri lakz dilinə əl-Mazininin «Müxtəsəri»ni və Şafeinin «Kitabı»nı tərcümə ediblər.

**(31) FARAB -** Balasağun yaxınlığında, türklərlə həmsərhəd vilayətdir. Torpağı şoran cəngəllikdir. Məsafəsi bir günlük yoldan azdır. Çox qüdrətli və alınmaz vilayətdir.

Möcüzələr yaradan Əbu Nəsr Məhəmməd ibn Əhməd Tarxan buradandır. O, islam dünyasında birinci həkimdir. O, müxtəlif elmlərə, müdrikliyə və fəlsəfə daşına (igsirə) malik idi. O, Məcdəddövlə ibn Buveyhin[1] vəziri Sahib İsmayıl ibn Əbbadın müasiri idi. Sahib onu özünə tərəf çəkməyə əlləşirdi. Əbu Nəsr musiqi elmini yaxşı bilirdi. Bəzi məclislərdə o, alətlərin birini götürüb elə çalırdı ki, oturanların hamısı gülürdü. Sonra avazı dəyişib elə çalırdı ki, hamı ağlayırdı, daha sonra başqa avazla elə çalırdı ki, hamı yuxulayırdı. Özü isə qalxıb məclisi tərk edirdi. Bir dəfə Əbu Nəsr Şama gedən karvanda idi. Yolda onlara quldurlar basqın etdi. O, yayla ox atmaqda mahir olduğu üçün quldurlarla ölənə qədər vuruşdu. [Bu əhvalat] 345 (957)-ci ildə olvduşdur.

«Kitab əs-Sixax» adlı əsərin müəllifi, layiqli ədib İsmayıl ibn Həmmad Cövhəri və onun əmisi, «Divan əl-ədəb» adlı kitabın müəllifi İshaq ibn İbrahim buradandır. Təəccüblüdür ki, türklər ölkəsinin ən ucqar yerindən ola-ola ikisi də ərəb dilini imamları idilər.

**(32) QUSTANTİNİYYƏ -** Uzunluq dairəsi - 59°50', en dairəsi -45°05'-idr. Rumun paytaxtıdır. Şəhəri Rumiyyənin hakimi Qustantin ibn Sivirius tikdirib. Bu Şabur Züləqtafın vaxtında olub. Bunların arasında müharibələr gedirdi.

Yerini həkimlər təyin etmiş belə bir şəhəri nə ona qədər, nə də ondan sonra tikməyiblər. Orada çarın arayı var və onu əhatə edən bayır divarlarının çevrəsi bir fərsahdır. Sarayda üç yüz dəmir qapı var. Sarayda çarın qızıl qübbəli kilsəsi onun da dördü gümüşdən olan on qapısı var. Kilsədə çarın durduğu xüsusi yer var, yerin ölçüsü çörd dirsək dördədir və həmin yer mirvari və yaqutla naxışlanıb. Keşiş duran yerin ölçüsü altı qarış altıyadır və Ximyari

əzvayındandır. Kilsənin divarları zərlə və gümüşlə naxışlanıb. Onun qabağında hərəsinin hündürlüyü dörd dirsək olan on iki sütun var. Hər sütunun üstündə insan, çar, at, şir, tavus və ya dəvə timsalı var, Yaxınlıqda su çəni var. Buraya su buraxanda, çən dolur və suyun səmti həmin timsallara qədər yüksəlir. Pasxa bazar günü gələndə onlar bu çənləri - birini balla, ikincisini - şərabla, üçüncüsünü - sirkəylə, dördüncüsünü - gülabla və beşincisini isə müşk və mixəklə qarışıq təmiz su ilə doldururlar. Çənləri elə örtürlər ki, onları heç kəs görmür. Su və ya başqa mayelər həmin timsalların ağzından tökülür və çarla əsabələri yaxınlaşıb özlərini pak edirlər.

Kilsə yaxınlığında hündürlüyü üç yüz dirsək və qalınlığı on dirsək olan sütun var. Onun üstündə bu kilsəni bina etdirən çar Qustantinin məqbərəsi yerləşir. [Məqbərənin] üstündə misdən qayrılmış at durur, atın də üstündə Qustantinin timsalı oturur. Onun başında mirvarilərlə bəzənmiş tac var. Atın üç ayağı qurğuşunla qayaya bənd edilib, dördüncü ayağı isə qalxmış vəziyyətdədir. Timsalın sağ əli uzanıb, sanki adamları Qustanitiniyyəyə dəvət edir. Sol əlində şar var. Bu sütun dənizdən üç günlük yol məsafəsindən görünür.

Möcüzələrindən Qustantiniyyənin mayakıdır. Bu, qurğuşun və dəmirlə bərkidilib. Külək əsəndə mayak aşağıdan yuxarıyadək küləyin səmtinə görə hər dörd tərəfə əyilir. Orada rəqəmli saat var. Günün və ya gecənin hər saatında qapısı açılır və oradan timsal çıxır və bir saat keçənə qədər yerində durur. Növbəti saat başlanan kimi timsal içəri girir və qapı da bağlanır. Sonra başqa qapı açılır və oradan başqa timsal çıxır və i. a. Deyirlər ki, saat müdrik Balinasın ixtirasıdır.

Çar sarayının tapısı üstündə at şəklində misdən qayrılmış üç timsal var. Bunu Balinas ondan ötrü düzəldib ki, atlar səs - küy salmasın və çar qapısının önündə kişnəməsinlər. Peyğəmbərin, - Allahın ona salamlar olsun! - ənsarlarından olan Əbu Əyyub Ənsarinin qəbiri oradadır. Yəzid ibn Müaviyə[1] Rum ölkəsinə yürüş edəndə, o, artıq qoca olan Əbu Əyyub Ənsarini bəxti gətirsin deyə özü ilə apardı. O, Qustantiniyyənin divarları yaxınlığında vəfat etdi. Yəzid əmr etdi ki, onu orada dəfn etsinlər və onun qəbiri üstündə türbə tikdirdi.

**(33) QƏLİB** - Sin ölkəsinə yaxın yerdir. Deyirlər ki, padşahlardan biri Sin ölkəsini almaq istədi, lakin yolda vəfat etdi. Yoldaşları bu yerlərdə qaldılar. Burada çoxlu su və ağaclıq var. Bu

yerin uzunluğu bir aylıq yoldur. Onlar qədim ərəb dilində danışır və başqa [dilləri] bilmirdilər. Onlar Ximyari yazısından istifadə edir və bütlərə sitayiş edirdilər. Onlar da padşah, qanunlar və zinya qadağa var.

**(34) MƏDİNƏT ƏN - NİSA*** - Məğrib dənizində yerləşən adada geniş sahəli böyük bir şəhərdir. Əhalisi qadınlardır. Kişilərin onlar üzərində heç bir haqqı yoxdur. Qadınlar atlara minib öz aralarında müharibələr keçirirlər. Döyüşlərdə onlar fövqəladə rəşadət göstərirlər. Onların qulları var. Hər bir qul gecələr öz xanımının yanına gəlir, onunla bütün gecəni keçirir və səhər tezdən gizlincə çıxıb gedir. Əgər qadın oğlan uşağı doğursa, öldürülər. Təkcə qızları saxlayırlar.

**(35) MAĞANACA** - Çox böyük şəhərdir. Bir hissəsi məskundur, bir hissəsi isə əkilib. Şəhər firənglər torpağında, Rin adlı çayın sahilində yerləşir. Orada uzaq şərqdə olan ədviyyat becərirlər - istiot, zəncəfil, mixək, qiasint və xavlancan. Çoxlu buğda, arpa və çovdar əkirlər, üzümləri və meyvələri də çoxdur. Orada Səmərqənddə Nəsr ibn Əhməd Samani[1] tərəfindən zərb olunan dirhəmlər dövriyyədədir.

**(36) NİQİYƏ** - Üç yüz on səkkiz xaçpərəst dininin başçıları toplaşan şəhərdir. Onlar israr edirdilər ki, Məsih onlarla bu iclasda idi. Bu həmin dinin birinci məclisi idi. Burada xaçpərəstliyin rəmzini bəyan ediblər, bu da onların dinin əsasıdır. Şəhər kilsəsində Məsihin, - ona salamlar olsun! - və həmin üç yüz on səkkizin məclisində oturduqları halda rəsmləri var.

Bu şəhərə gedən yolda bir təpə və onun başında Əbu Məhəmməd Bəttalın, - Allah ona rəhmət etsin! - qəbri var.

---

* "Qadınlar şəhəri".

## YEDDİNCİ İQLİM

Gecə-gündüz bərabərliyində günorta vaxtı kölgənin uzunluğu yeddi qədəm, yarım qədəm, onda bir qədəm və onda altı qədəm olan yerdən başlanır. Axırı isə gecə-gündüzün bərabərliyində günorta vaxtı səkkiz qədəm yarım qədəm və onda bir qədəmin yarısı olan yerdədir. Bu iqlimdə becərilmiş ərazi yoxdur. İqlim Məşriqdə, meşəlik və dağlıqlarında, bəzi vəhşilərə oxşar türk tayfaları yaşayan yerlərdə başlanır. İqlim Başqırt dağlarını keçib Bəcənək tərəfə, Suvar və Bulğar şəhərlərini keçib Muhit dənizinin sahilində qurtarır. Bu iqlimdən o yana əhali çox azdır. Orada visu, vərəng, yura və onlara oxşarlar yaşayır. Bu iqlimdə günün uzunluğu on beş saat on beş dəqiqədir. Məşriqdən Məqribə uzunluğu altı min yeddi yüz səksən mil əlli dörd dəqiqə, eni issə yüz səksən beş mil iyirmi dəqiqədir. Bura məskun dünyanın axırıdır, ondan o yana heç bir xalq yaşamır, bir xalqdan başqa. Buna da nəzər yetirmək vacib deyil, çünki onun adamları daha çox vəhşi heyvanlara oxşayırlar. İndi isə iqlimə daxil yerlərin adlarını sıra ilə verək.

**(1) BAŞQIRT** - Qustantiniyyə ilə bulqarların arasında yaşayan böyük türk xalqıdır. Əhalisi türklərin ən pisi və öldürməkdə ən qəddarıdır. Onlar deyirlər: «Yayın rəbbi var, qışın rəbbi var, yağışın rəbbi var, küləyin rəbbi var, torpağın rəbbi var, suyun rəbbi var, ölümün rəbbi var və həyatın rəbbi var.» Aralarında elələri var ki, durnalara ibadət edir. Bunlar çoxsaylıdır. Əksəriyyəti isə xaçpərstdir. Bir dəstəsi imam Əbu Hənifənin, - Allah ondan razı olsun! - (Məzhəbinə inanan müsəlmandır. Bizdə xaçpərəstlər cizyə vergisini müsəlmanlara verirlər, burada isə əksinə, müsəlmanlar xaçpərəstlərə vergi verir. Onların böyük qoşuna malik çarları var. Əhali çadırlarda yaşayır. Qalaları yoxdur.

**(2) BURCAN** - Şimal düzənliklərində ölkədir. Ən qısa gününün uzunluğu dörd saatdır, gecənin isə iyirmi saatdır və əksinə. Əhalisi məcus və bütpərəstdir. Çox vaxtda firənglərə oxşayan səqləblərlə müharibə edirlər. Sənət və dənizçilikdə mahirdirlər.

**(3) BULĞAR** - Uzunluq dairəsi - 90°05', en dairəsi - 49°30'-dir. Evləri şam ağacından tikilmiş, Mayutas dənizinin sahilində, yerləşən şəhərdir. Divarları palıd ağacındandır. Şəhərin ətrafında saysız - hasabsız türk xalqları yaşayır. Qustantiniyyə ilə aralarında müharibələr gedir. Bulğarlarda günün uzunluğu iyirmi saata qədər olur, gecənin uzunluğu isə dörd saatdır. Əgər gün

qısalırsa, onda əksinə [gecə uzanır]. Oralarda çoxsərt soyuqlar olur. Qışda olduğu kimi, onlarda qar yayda ərimir. Deyirlər bu həmin xalqdır ki, Huda, - ona salamlar olsun! - inanıb şimal tərəfə qaçdılar və burada firavan yaşadılar. Bunların sümükləri Bulğar torpağında tapılıb. Tapılan dişlərinin eni iki qarış, uzunluğu isə dörd qarış idi. Qafa tasları gümbəz kimidir. Yerin altında qar kimi ağ və fil dişinə bənzər dişlər tapılır. Orada iri dimdikli quşlar var.

**(4) ŞUŞİT** - Səqləb torpağında qaladır. Orada mənbəyi var, lakin bu yerlərdə duzun özü yoxdur. Onlara duz lazım olanda, suyu daş qablara doldurub ocaq üstünə qoyurlar. Su qatılaşır və bulanır. Sonra suyu soyudurlar və bundan bərk ağ duz əmələ gəlir. Bu üsul bütün Səqləb ölkəsində tətbiq olunur. Deyirlər ki, onların bir dağında «Bal bulağı» adlanan subulağı var. Bu suyu bir qabda adi su ilə qarışdırırlar və içəndə sərinlik hiss edirlər.

**(5) SƏQLƏB** - Altıncı və yeddinci iqlimlərin qərbində yerləşən ölkədir. Xəzər ölkəsi ilə həmsərhəddir və Rum dağlarının yüksək yerlərindəndir. Bunlar kürən, qırmızısifət və çox güclüdürlər. Lit ibn Kəsluxtim ibn Yunan ibn Yafəsin nəslindəndirlər. Bunlar müxtəlif qəbilələrdir və aralarında müharibələr gedir. Hər xalqın başqasına tabe olmayan öz çarı var. Onların bir qismi yaqubi xaçpərəst, bir qismi nəsturi, bir qisminin isə dəni yoxdur və bir qismi də atəşpərəstdir. Bir böyük dağın başında ibadətgahları var. Çox əcaib tikintidir, daşlarının quruluşu, müxtəlif rəngləri, içərisində olan qiymətli daşları, ibadətgahın pəncərələrində olan günəşin doğma təsvirləri bütün bunlar çox qəribədir.

Onların suyu şirin və lakin Zülmət dənizi kimi suyu qapqara çayları var. Çayda balıq yoxdur, amma böyük zərərsiz qara ilanlar var. Orada əl-idas adlı heyvan* yaşayır. Onu ovlayır, sonra da saqsinlərlə bulğarlara aparırlar.

**(6) MİŞKA** - Səqləblər ölkəsində, dəniz sahilində, ordukeçməz qalın bir meşənin ortasında yerləşən böyük şəhərdir. Çoxlu ərzağı, balığı, balı və əti var. Orduları piyadadır, çünki atlılar oradan keçə bilməz. Onlar çarlarının məsləhəti ilə evlənir, öz istəkləriylə yox. Çar hamının ruzusunun qayğısına qalır: o, sanki öz rəiyyətlərinin qayğıkeş atasıdır. Başqa türklərə nisbətən onlar arvadlarını qısqanırlar.

* Susamuru.

**(7) VƏRƏNG -** Şimal dənizinin sahilində yerdir. Muhit dənizinin şimalında onu Cənub dəniziylə birləşdirən körfəz var. Bu körfəzin yanındakı yerlərə Vərəng deyirlər. Bu, şimalda olan ən uzaq yerdir. Orada çox şiddətli soyuqlar olur, sərt iqlimi və ərimәyən qarı var. Orada heç bir bitki və heyvan yaşaya bilmir. Bərk şaxtalara, zülmətə və tara görə oraya çox az adam gedib çata bilər.

**(8) VİSU -** Bulğarlardan o yana ölkədir. Aralarında üç aylıq [yol] var. Oranın günü uzundur və zülməti onlar görmürlər. Sonra uzun gecə başlanır və onlar gün işığını görmürlər.

Bulğarın əhalisi buraya satmaq üçün öz mallarını gətirilər. Hər adam öz malını müəyyən yerdə qoyur, üstünə işarəsini qeyd edir və çıxıb gedir. Sonra qayıdır və öz malının yanında ona lazım olan malları görür. Əgər buna razı olursa, o, malının əvəzinə qoyulan malları götürür və özününkünü qoyub gedir. Əgər razı deyilsə, təkcə öz malını götürüb gedir. Satan alanı görmür və əksinə. Bu əhvalat Sudanın cənubunda keçirilən mal mübadiləsinə bənzəyir.

Visunun əhalisi Bulğar ölkəsinə gəlmir, indi gəlsə orada hava dəyişir və soyuqlar başlanır, hətta bu gəliş yayda olsa belə. Həmçinin bulğarların heyvanları qırılır, bitkiləri quruyur. Buna görə Bulğarlar visulara ölkələrinə gəlməyə icazə vermirlər.

**(9) YƏCUC VƏ MƏCUC -** Yafəs ibn Nuhun, - ona salamlar olsun! -nəslindən olan iki böyük türk qəbiləsidir. Onların yaşadığı yerlər yeddinci iqlimin şərqindədir.*

**(10) YURA -** Zülmət dənizinin yaxınlığında ölkədir. Yayda onlarda gün o qədər uzundur ki, Günəş qırx gün ərzində heç batmır. Zülmət [ölkəsi] bunların yaxınlığındadır. Yuranın camaatı buraya çıraqla daxil olur. Onlar çadıra oxşar böyük bir ağac tapır və bu ağacda deyilənə görə uçan bir heyvan yaşayır. Onlar heç bir şey əkmir və mal-qaraları da yoxdur. Oralarda qalın meşələr var və onlar burada özlərinə yemək tapır və balıq tuturlar. Ölkələrinə yol heç vaxt ərimәyən qarlı yerlərdən keçir. Deyirlər ki, Bulğar əhli Yuraya qılınc gətirir. Bulğarlar bu qılınclara sap düzəltmir və bəzək də vurmurlar. Oddan çıxarıb bərkitmak üçün suya salırlar və bu halda da oraya aparırlar. Yuralılara məhz belə qılınclar lazımdır. Onlar [bu qılıncları] alıb Zülmət dənizinin sularına atırlar. Bunu etdikdə, Allah Təala onlara dəvə boyda balıq göndərir. Bu balığın arxasınca başqa daha nəhəng balıq cumur və sahilə çatanda elə yerə

* Bax: "Yəcuc və Məcuc sədii" məqaləsində. Altıncı iqlim, № 26.

düşür ki, heç tərpənə də bilmir. Yura əhalisi bundan xəbərdar olub qayıqlarla bu balığa yaxınlaşırlar. Balığı dövrəyə alıb ətini doğrayırlar. Bu qılınclar dənizdə olmayanda balıq üzə çıxır və onlar da ölür, çünki bunların gücü bu balığdandır. Allah isə öz xilqətini daha yaxşı tanıyır, çünki O, Əziz və həkimdir!

Bunlar «Təlxis əl-asar və əcaib əl-malik əl-qəhhar» adlı kitabdan götürdüyümüz axırıncı sözlərdir.

Bu nüsxə 816-cı ilin nüsxəsindən köçürülüb. Nüsxəni özü üçün və özündən sonra Allah Təalanı istəyənlər üçün, Allah Təalaya ehtiyacı olan Allahın bəndəsi Əli əl-Misri əl-Mənufi əş-Şafei, - Allah Təala onun özünü, valideyinlərini, rəhmətə gedən qohum-əqrabasını və başqa müsəlmanların rəhmətə getmiş qohum - əqrabasını, hamısını rəhmət etsin! - köçürmüşdür. Dünyalar sahibi Allah Təalaya eşq olsun!

**SON**

Bu əhvalat hicri 1023-cü ilin müqəddəs aylarından biri olan Zülqədə ayının əvvəlində cümə namazı ərəfəsində, Laziqiyyə şəhərində, - Allah onu hifz etsin! - baş vermişdir.

Sən ey yazdığımı səhv nəzər edən,
Varan mənasına ağıllı başla;
Yaradan eşqinə yalvarıram mən,
Bir səhvimi tapsan mənə bağışla.
Bağışla, müdrikdir bağışlayan kəs.*

---

* Tərcümə Q. İsabəylinindir.

## QEYDL ƏR

## MÜQƏDDİMƏ

***1.*** Kitab Təlxis əl-Asar və əcaib əl-məlik əl-Qəhhar təlif əl-bəhr əl—humam əl—alim Əbdürrəşid ibn Saleh ibn Nuri əl-Bakuvi. Bax: M. de Sleyn. Paris Milli Kitabxanasının ərəb əlyazmalar kataloqu, Paris, 1883-1885, səh. 393-394, № 2246 (ərəb fondu 585); К. Броккелман. Гешихте дер Арабишен Литтератур (ГАЛ), I, səh. 481; НА, I, səh. 633; СБ, I, səh. 883; И. ЈУ Крачковски Избранныје сочиненија, ч. IV, М-Л, 1957, səh. 364, 512—513; С. Б. Ашурбејли. Абдур-Рашид Бакуви-азербајджанскиј ученыј-географ XV в., - Азəрб. SSR EA Xəbərləri, İctimai elmlər seriyası, №5, 1958, səh. 33-40.
***2.*** Təlxis əl-asar, vər. 556.
***3.*** Bax: İ. Yu. Kraçkovski, səh. 512.
***4.*** Təlxis əl-asar, vər. 74a.
***5.*** Münhen Dövlət kitabxanasının ərəb əlyazmaları kataloqu. Münhen, 1866, səh. 400-402.
***6.*** Bax: M. Ştrek. Əl-Qəzvini Zəkəriyyə,-İslam Ensiklopediyası (ingilis dilində), c. II, səh. 900—904; İ. Yu. Kraçkovski, səh. 363-365, 512.
***7.*** Qəzvininin Əcaib əl-məxluqat adlı əsərindən qabaq yazılmış eyni adlı əsər son vaxtlara qədər Məhəmməd ibn Mahmud ibn Əhməd ət-Tusiyə isnad edilirdi. Bax: Н. Д. Миклухо—Мак-лаj. Описаниje таджикских и персидских рукописеj Института востокозеденија. М—Л, 1955, səh. 24.
***8.*** S. M. Fren. İbn Fozlans und anderer Araber Berixte uber di Russen əlterer seyt. SPb, 1823; Q. Yakob. Ain arabişer Berixterştaffer aus dem 10 Yahrhundeft, I, Berlin; 1891.
***9.*** Kitab Talxis al-asar və əcaib al-malik al-Qaxxar. Eksposition. Par Abdurraşid fil de Saleh fil de Nuri; Пар Абдуррашид фил де Салеh фил де Нури; увраж де географи, композе дан ла XV сигл. Пар. М. де Гин. Париж, 1789.
***10.*** Yenə orada, səh. 391; İ. Yu. Kraçkovski, ç. IV, səh. 512.
***11.*** S. Mş Fren, səh. 269; Q. Yakob. Ştudien in arabişen Qeoqrafen, II, Berlin, 1892, səh. 43-44; İ. Yu. Kraçkovski, ç IV, səh, 364.
***12.*** T. Q. Yuynbol. Leksion qeoqrafikum. ç. IV Luqduni Batavorum, 1859, səh. 80-81.

***13.*** F. Vüstenfeld. Di Literatur der Erdbeşraybunq ben den aqaberv, ç. II, Maqdeburq, 1842, səh. 8.
***14.*** İ. Yu. Kraçkovski, ç. IV, səh. 512.
***15.*** D .M. Denlop. Baku. İslam ensiklopediyası (ingilis dilində), ç. I, səh. 967; T. Q. Yuynbol, səh. 87
***16.*** Abd ar-Raşid al-Bakuvi. Kitab talxis al-asar va adjaib Al-malik al-kaxxar, M., 1971.

## BİRİNCİ İQLİM

**(1)** İrəm haqqında bax: Quran, 89 surə, 6-7 ayələr. A. Vensink. İrəm. İslam Ensiklopediyası (sonralar İE), c. II, səh. 554; İrəm Zat əl-İmad, İE, s. səh. 554-555.
***1.*** Ad oğlu Şəddad - Cənubi Ərəbistanda əfsanəvi hökmdar.
***2.*** Müaviyə ibn Əbu Sufyan - Əməvi sülaləsindən birinci xəlifə (661-680).
**(2)** Busa (Beca) ölkəsi və qəbilələri haqqında bax: Л. Je. Куббел вə В. В. Матвejев. Арабскиje источники VII-X веков по етнографии и истории Африки. М-Л., 1960, səh. 353; V. Minorski. Hüdud əl-Aləm. A. Perşian Qeoqrafü çirka 372 A. N.-982 A. D., London, 1937, səh. 79, 81, 83. 164, 473; Ç. Bekker. Besa, İ E, I, səh. 705; A. Paul. A. Histori of ze Besa traybes of ze sudan, Kəmbris, 1954.
***1.*** Zümrüdün müxtəlif növləri haqqında bax: Biruni, Mineraloqiya. A. M. Belenitskinin russaya tərcüməsi, L., 1963, səh. 151 və sonrakı.
**(3)** Qızılın istehsalı və malların qızıla dəyişməsinin oxşarlığı haqda, bax; Biruni, səh. 218-226.
**(4)** «Həbəş» adı altında orta əsr müəllifləri Şimal - şərqi Afrikanın bütün qara dərili əhalisini cəmləşdirirdi. Bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 384; V. Minorski. Mərvazi, London, 1942, səh. 156-158. Qəzvininin Həbəş haqqında verdiyi məlumatı Bakuvi dörd dəfə qısaldıb.
**(5)** Zəncilər (Zinclər) ölkəsi haqqında bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 361-362; V. B. M. Мисүкин. Происхождениje городов восточно африканского побержjа. Вестник ЛГУ, №20, 1958, выпуск 4, cəh. 142-152; V. Minorski. Hüdud, səh. 163-164, 179, 228, 471-472; L. Devik Le pey de Zensz, Paris, 1883, səh. 15-35, 121-200; L. Massinyon. ZANS. İE, c. IV, səh. 1281-1282.

Zəncilərin on əlamətlərini Bakuvi Qalena isnadsız verir.
**(6)** Qaradərililər deyəndə ərəblər Saxara səhrasından cənubda yerləşən Afrika vilayətlərinin əhalisini nəzərdə tuturdular. Bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 380; V. Minorski, Hüdud, səh. 153-154, 164-165, 476-477; M. Delafos. Sudan İE, c. IV, səh. 518-521.
**(7)** Nuba deyəndə, ərəblər Asuandan cənubda və birinci Nil kandarından yuxarıda yerləşən xalqı və ölkəni adlandırdılar. Bax: L. Ye. Kubbel, və V. V. Matveyev, səh. 375-376; V. Minorski. Hüdud, səh. 151-152, 164-165, 475-476; A. Rozov. Xristianskaya Nubiya, Kiyev, 1890, səh. 45-219; S. Hilleson. Nuba, İE, c. IV, səh. 1008-1012.
**(9)** Təkrur - müasir Podor dairəsində, Seneqal çayının aşağı axınında yerləşən şəhər və dövlətdir. Bax: L. Ye Kubbel və V. V. Matveyev, səh. 381-382; M. Delafos, Takrur, İE, c. IV, səh. 664-667.
**(10)** Qəzvinidə olan Cəbərsə haqqında məlumatı Bakuvi üç dəfədən çox ixtisar edir.
***1.*** Baxtanassar və ya II Nabuqadnassar Yeni Babil sülaləsindən olan Kildanilər çarıdır (e. ə. 605-e. ə. 562-ci illər). Bu çar Misiri talan edib, Qüdsü yandırdı. Orada yaşayan yəhudiləri Babildə canlarını qurtarmağa məcbur etdi. Bax: E. Бикерман Хронолокија древнего мира, M., 1975.
**(11)** Kontinental Cava (Yava) haqqında bax: V.Minorski. Hüdud səh. 63, 188, 193, 293.
**(12)** Xalidat (səadət) adaları Kanar adalarıdır. Bax: V. Minorski. Hüdud, səh. 58, 190. Qəzvini Xalidat adaları haqqında məlumatı Birunidən götürüb.
**(13)** Ramni adası Sumatradadır. Çox vaxt mənbələrdə onu Yava ilə qarışdırılar. Bax: V. Minorski. Hüdud səh. 57, 187-188, 288, 241, 472-477; Həmədallah Qəzvini Nüzhət əl-qulub. London, 1919, səh. 223, 225; Q. Ferran, Adalar. Jurnal Aziatik, X seriya, 1907, səh. 440-445 (fransız dilində). Məlumatları Zəkəriyyə Qəzvini Məhəmməd Razidən götürür.
**(14)** Zəbəc - Yava adasıdır. Bax: V. Minorski. Hüdud, səh. 52, 57, 163-165, 471-472; Nüzhət əl-qülub. səh. 222.
**(15-16-17)** Bakuvi Qəzvininin Səksər, Kisar və Nisa adaları haqqında məlumatlarını ixtisar edir.
**(18)** Ərəb orta əsr səyyahları elə təsəvvür edirdilər ki, Vaq-Vaq adaları Mozambikin cənubunda, eyni zamanda Sindən şərqdə («o

yana») idi. Q. Ferran Vaqın birini Mozambikin şimal hissəsinə yaxın, ikincisini isə Madaqaskar adasında yerləşdirirdi. De Quye Vaq-Vaq'ı Yaponiya ilə eyniləşdirirdi. Bax: L. Ye Kubbel və V. V. Matveyev, səh. 353-354; 5. Minorski. Hüdud səh. 228, 472: Nüzhət əl-qülub, səh. 222; L. Devik, səh. 88-95; Q. Ferran. Madaqaskar, səh. 488-509; yenə onun. Adalar, səh. 450-506; yenə onun. Vaq-vaq. səh. 1164-1168; M. de Quye. Le Japon konnu dez Arabz, Leyden, 1883-1886, səh. 295-307 (fransız dilində).

**(19)** Xadramaut - Ərəbistan yarımadasının cənubunda vilayətdir. Bax: V. Minorski. Hüdud, səh. 147; Nüzhət əl-qulub, səh 256; Y. Şleyfer. Xadramut, YE, s. II; Bakuvi Qəzvininin məlumatını çox ixtisar edib.

**(20)** Dunkula. Nubiya Mukurra çarlığının paytaxtıdır. Bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 359; V. Minorski. Hüdud, səh. 475.

**(21)** ***1.*** Səba ibn Yaşcub ibn Yarub ibn Qəhtan - Cənubi Ərəbistanda əfsanəvi padşah.

**(22)** Sicilmasa Cənubi Mərakeşdə orta əsr şəhəri və Qərbi Sudandan gələn karvan yolunun axırıncı məntəqəsi. Bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 379; V. Minorski. Hüdud, səh 82, 154. 223.

**(23)** Sərəndib - Seylon adasıdır. Bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 379. V. Minorski. Hüdud, səh. 57, 60, 86-87, 234 235; Nüzhət əl-qulub, səh. 177, 186, 195, 224, 255; Mərvazi, səh. 46, 50.

**(24)** Sufala - Mozambikin cənubunda şəhər və vilayətdir. Orta əsrlərdə ərəblər Sufaladan qızıl və gölə aparırdılar. Bax: L. Ye. Kubbel və V .V. Matveyev, səh. 379; V. Minorski. Hüdud, səh. 163, 472; Q. Ferran. Sofala, İE, c. IV, səh. 507-510; R.
Koupland, İst. Afrika, Oksford, 1958, səh. 25-27, 36-39 (ingilis dilində).

**(25)** Saluk - qədim Yəməndə mühüm şəhərdən biri idi.

**(26)** Səndəbil (Kan-çou, Kam-su) haqqında bax: V. Minorski. Hüdud, səh. 232; Nüzhət əl-qulub, səh. 18, 68-69, 73, 78.

**(28)** Şihr - Cənubi Ərəbistanda vilayətdir.

***1.*** Nas-nas-ərəb-fare demonologiyasının (cinşünaslıq) şəxsiyyətlərindən biri idi. O, yolçulara hücum edib onları öz uzun ayaqları ilə sarıyıb ölənə qədər qovurdu. Bax: L. Ye. Kubbel və V. V. Matveyev, səh. 387; «Marko Polonun kitabı», M., 1955, səh. 208-209; V. Minorski. Hüdud, səh. 148; Nüzhət əl-qulub, səh. 256.

